**DİLÇİLİK LINGUISTICS ЯЗЫКОЗНАНИЕ**

DOI: 10.36719/AEM/2007-2019/49/4-6

**Ülkər Arif qızı Cəfərova**
Azərbaycan Dillər Universiteti
Ulker_j@hotmail.com

# İNGİLİS VƏ AZƏRBAYCAN DİLLƏRİNDƏ NEOLOGİZMLƏR

***Açar sözlər:*** *neologizmlər, neologizmlərin növləri, neologizmlərin yaranma səbəbləri*
***Key words:*** *neologisms, the types of neologisms, the causes of neologisms*
***Ключевые слава:*** *неологизмы, виды неологизмов, причины неологизмов*

Neologizmlər dilin leksik tərkibində əhəmiyyətli rol oynayır. Həm nəzəri, həm gündəlik nitqimizdə işlədilən sözlərin içində bizə yeni olan ifadə və sözlər vardır. Bu mənada mövzumuz aktuallıq kəsb edir.

Dilin leksik tərkibini təşkil edən bütün vahidlər hər cəhətdən bir-birinə oxşamır. Dildəki hər bir leksik vahidin özünəməxsus xüsusiyyətləri və üslubi vəzifələri vardır. Buna görə də bəzi sözlər dilin bütün üslublarında işlənə bildiyi halda, digər qrup sözlər müəyyən üslubi məqsəd üçün yalnız bir üslubda işlənir. Bütün bunları nəzərə alaraq B.Xəlilov işlənmə dairəsinə görə müasir Azərbaycan dilində aşağıdakı söz qruplarını fərqləndirir:

1) ümumişlək: hamı tərəfindən başa düşülən sözlər;

2) məhdud dairədə işlədilən sözlər: dialektizmlər, köhnəlmiş sözlər, neologizmlər, vulqarizmlər, loru sözlər, jarqon və arqo sözlər;

3) xüsusi sözlər: terminlər, peşə-sənət sözləri.[2, 230]

Cəmiyyətin inkişafı ilə bağlı bəzi məfhumların və onları bildirən sözlərin köhnəlib aradan çıxdığı kimi bir sıra yeni məfhumlar və onları bildirən yeni sözlər də yaranır ki, bunlar da *neologizmlər* (yunanca *neos* -yeni, *loqos* – söz deməkdir) adlanır**.**

Neologizm sözünün mənası: new words- yeni söz, new usage- yeni işlətmə, new expression- yeni ifadə kimi oxşar mənalara gəlib çıxır. Yeni söz, yeni ifadə təbii ki, dilçilikdə indiyə qədər bizə tanış olmayan, yəni ümumişlək olmayan sözün artıq leksikonumuza daxil olması kimi qiymətləndirilir.

Nyumark (1988) neologizm terminini həm dildə, həm də dilçilik aspektində leksikoloji vahid üçün qazanılmış yeni söz və yeni ifadə kimi tərif etmişdir.

Neologizm termini yalnız "tamamilə yeni bir leksik vahid" deyil, həm də mənası dəyişdirilmiş mövcud bir kəlmə ehtiva edən daha geniş bir məna daşıyır. Neologizmlər müxtəlif dillərdə söz, qrammatika və tələffüzün özünəməxsus nümunələri ilə fərqlənir.

Bir çox Amerikan lüğətlərinin (Merriam Webster Dictionary,The American Heritage Dictionary, Collins Theraurus) müəlliflərinin neologizmlərin təsvirinə dair yanaşma tərzinə baxanda, hamısının oxşar məxrəcə gəldiklərinə şahid oluruq. Nyumarkın yanaşmasına görə neologizm bəşəriyyətin inkişaf dövründə dildə yaranmış logikanın nəticəsidir. O, neologizmləri dilçilikdə müxtəlif formalarda xarakterizə etmişdir: The old word with new senses-köhnə sözə yeni toxunuş.[5;2]

Günümüzdə yeni söz və həmçinin yeni məna kəsb edən sözlərin yaranması zəruridir. Neologizmlər istehsalatın, elmin, mədəniyyətin, inkişafı üçün əlaqədar olaraq yeni yaranmış anlayış, hadisə və keyfiyyətləri bildirmək üçün əmələ gəlir. Neologizmlərin yaranmasında elmin rolu xüsusilə böyükdür. Yaranan bütün yeniliklər, bütün ixtiralar isə söz vasitəsilə öz əksini dildə tapır. Elə buna görə də, müasir dövrdə də ingilis və Azərbaycan dillərinin lüğət tərkibinə müxtəlif sahələrə dair yüzlərlə neologizm daxil olmuşdur. Bu neologizmlər iki mənbədən birinci, öz dili daxili imkanları əsasında; ikincisi, başqa dillərdən söz almaq əsasında yaranmışdır.

Yaranan yeni sözlər, yəni neologizmlər ən çox elm və leksikanın inkişafı ilə bağlıdır. İngilis dilində neologizmlərə misal olaraq, smog (smoke+fog), app (Software application for a smartphone or tablet computer), troll (An individual who posts inflammatory, rude, and obnoxious comments to an online community), ego surfer (A person who boosts his ego by searching for his own name on Google and other search engines). Azərbaycan dilində isə kompüter, printer, skaner, özəlləşdirmə, soyqırım, işbirliyi, yayım, cangüdən, çağdaş, bölgə, açıqca, soyad, durum və s. kimi sözləri nümunə göstərmək olar.[1;112]

Neologizmlərin dilimizə yeni söz kimi daxil olması səbəbi ilə arxaizmlər leksikonumuzda artıq daha az işlənən sözlərin, ifadələrin toplandığı baza kimi əhəmiyyət kəsb edir. Arxaizmlərin elmi tədqiqi və təsnifi

məsələsinə S.Cəfərov, A.Qurbanov, F.Zeynalov, S.Əlizadə və digər alimlər münasibət bildirmişlər. A.Qurbanov arxaizmlərə köhnəlmiş sözlərin bir növü kimi yanaşmışdır.

Yazıçılar yeni sözlər yaratmaqda şübhəsiz yaxşıdır. Fərqli cəhət bundan ibarətdir ki, bir söz icad etmək ayrı, amma gələcək nəsillər tərəfindən geniş istifadə ediləcək böyük bir söz yaratmaq ayrı bir anlayışdır.

Bəzi neologizmlər 50-60-70-ci illərdə və ya daha əvvəl hazırlanmışdı, ancaq bu yaxınlarda geniş istifadə edilməyə başlanmışdır.

**Oxbridge** - Əvvəlcə Oxbridge William Thackeray romanında uydurma bir qurum olaraq tanıdıldı. Və sonra Oksford və Kembricin birləşdirilmiş adı üçün istifadə olunmağa başladı.

**Pedestrian** (Piyada) - William Wordsworth onu icad edənə qədər piyada gəzən bir insanın adını çəkəcək bir söz leksikonda yox idi.

**Scientist** (Elm adamı) - William Whewell, "İndüktif Elmlər Fəlsəfəsi" əsərini yazdı, burada elmlə məşğul olan bir insanın adının olmaması ilə bağlı çaşqınlıq ifadə edildi. Bu şəkildə "alim" sözü yarandı.

**Workaholic** (işini çox sevən) - Doktor Wayne Oates, bir *Workaholic etirafları*: İş asılılığı haqqında faktlar kitabını yazarkən bu sözü təyin etdi. -Holic şəkilçisi “alkoqol” sözündə olduğu kimi bağımlılığı ifadə edir. Oates də işə bir növ asılılıq kimi baxırdı.

**Twitter** - Bu onomatopoeik (səsin fonetik təqlid edilməsi - bu vəziyyətdə bükülmə) sözü Geoffrey Chaucer-ə təyin edilmişdir. Göründüyü kimi İngilis dili lüğətlərinin bir sıra orijinal sözlərlə təmin edilməsində böyük töhfə verir.

**Yahoo** - İndi dünyada kim bu sözü bilmir? Ancaq hər bir insan bunun mənşəyindən xəbərdar deyil. "Yahoo" sözü ilk dəfə Jonathan Swift-in "Gulliver Travels" romanında təqdim edilmişdir. Yahoistlər materialist münasibətləri olan ibtidai qəddar varlıqlar idi.

Examples of Social Networking and Technology (İnternet və texnologiya ilə bağlı nümunələr):

**Google**: To use an online search engine as the basis for looking up information on the World Wide Web (İnternet axtarış sistemindən bütün dünya üzrə məlumat axtarmaq üçün istifadə olunan şəbəkə).

**404**: Someone who’s clueless. From the World Wide Web error message 404 Not Found, meaning that the requested document could not be located (Zərərsiz biri; yəni tələb olunan sənədin mövcud olmadığı deməkdir)

**Troll**: An individual who posts inflammatory, rude, and obnoxious comments to an online community (İnternet birliyinə iltihablı, kobud və ədəbsiz şərhlər yazan bir şəxs).

Neologizmlər tarixi kateqoriyadır. Söz ümumişlək səciyyə daşıyıb lüğətə düşürsə, o, neologizm olma xüsusiyyətini itirir. Yeni söz yaratmanın bir tipi yeni anlayış təyin edən terminoloji, digər tipi isə ifadəli üslubi söz yaratmadır. Sözün yeniliyi dövrə görə müəyyənləşir, zamanla bağlı hadisə kimi başa düşülür. Neologizmlər əmələ gəlmə yollarına və yaranma mənbələrinə görə dilin daxili imkanları hesabına, eləcə də başqa dillərdən söz almaq yolu ilə, yaxud fərdi şəkildə yarana bilər. Məhz bunları nəzərə alaraq ingilis və Azərbaycan dilində neologizmləri belə qruplaşdırmaq olar:

1) Dilin daxili imkanları hesabına yaranan neologizmlər: *yeddiillik, qardaşlaşmaq, bərabərlik, əyləc, nəfəslik* və s., ingilis dilində *killingest, Englished, geniused* və s.;

2) Başqa dillərdən söz almaqla yarananlar: *teletayp, radiolakatr, menecer, marşal, motel, akvatoriya, akvamarin, pedikür* və s., ingilis dilində isə fransız dilindən *déjà vu, jamai vu, déjà dit, franc fort, touché, parkour*, ispan dilindən isə *plaza, silo, bonanza, salsa, fiesta və s.* kimi sözlər neologizm kimi lüğət tərkibinə daxil olmuşdur.

3) Ümumi şəkildə yaranan neologizmlər: *respublika, orbit, ekstremist, balet, terorist, kürəsəl, bilgisayar, ismarıc* və s.;

4) Sözyaratma üsulları ilə əmələ gəlməsi ilə yarananlar: *pozucu, ağızlıq, tezlik, ölümsüzlük, pişiklik, dönümsüz, dərdqramma, taleyikür, boğazı bantlılar, qraxmallı oxumuşlar* və s.

Neologizmlər hər bir dilin sözyaratma formalarının modelinə uyğundur. Neologizmin əmələ gəlmə üsulları hər iki dildə, demək olar ki, eynidir və morfoloji yolla yarananlar kəmiyyətcə üstünlük təşkil edir. Neologizmlər, digər passiv leksik laylar kimi, özünəxas olan üslubi vəzifələri və konkret işlənmə sferasına malikdir. Yeni sözlər ingilis dilində daha çox publisistik üslubda özünü biruzə verir.[3;75]

Neologizmlər kütləvi informasiya vasitələri, internet və danışıq vasitəsi ilə populyarlaşa bilər. O cümlədən, fərqli jargondan istifadə ilə tanınan bir çox sahədəki akademik diskussiya və nitqimizin tez-tez istifadə olunan hissələrinə çevrilə bilər. Neologizmlərin bir qismi ümumişlək sözlərə çevrilir, bir qismi öz yeniliyini qoruyub saxlayır. Onların dilin bir hissəsi olaraq davam etməsi bir çox amillərdən asılıdır. Ehtimal ki, bunlardan ən başlıcası ictimaiyyət tərəfindən qəbul edilməsidir. Bir söz və ya ifadə artıq "yeni" olmadıqda, artıq neologizm deyildir. Neologizmlər "köhnə" olmaq üçün onilliklər çəkə bilər.Bir sözün neologizm hesab edilməməsi üçün bir sözün nə qədər köhnə olması faktı da buna təsir edə bilər.

Neologizmləri araşdırarkən, onlara olduğu kimi diqqət yetirmək lazımdır. İngilisdilli cəmiyyətin qəbul etdiyi yeni bir düşüncə tərzini yeni sözlərdə öz əksini tapır. Neologizmlər həmçinin həyat nə qədər sürətlə yaşanırsa, yeniliklər baş verirsə yeni sözlər də bir-birilərini eyni sürətlə əvəz edir. Bu da digər bir faktdır ki, neologizmlər bir başa tarixlə də uzlaşır. Lakin əsas budur ki, bu qarışıqların içində dilə elə yeni sözlər daxil olurki, uzun müddət öz yeniliyini günümüzdə də saxlayır və daha az dəyişikliklərə məruz qalır.[4;2]

Neologizm yeni bir məna verilmiş mövcud bir söz və ya ifadəyə istinad edə bilər. Onlar yeni bir mədəni kontekstdən götürülmüş ixtiraların, yeni hadisələrin və ya köhnə fikirlərin müəyyənləşdirilməsində olduqca faydalıdır.

Zaman keçdikcə neologizmlər işlənmə məqamından, nə vaxt meydana çıxmasından, anlaşılma dərəcəsindən asılı olaraq get-gedə dəyişilir. Buna görə də yeni söz, təzə söz anlayışları nisbi və şərti götürülərək dövrlərlə əlaqədar olan hadisə kimi başa düşülür.

Araşdırmalar nəticəsində bu qənaətə gəlirik ki, neologizmlər müasir həyatın tələbləri nəticəsində yaranmış elmi, texnoloji, başqa dillərdən leksikonumuza daxil olan yeni ifadə, sözlərin günümüzdə daha çox işlənməsinə gətirib çıxardır. Bir müddət dildə işlədildikdən sonra ümumişlək sözlərə çevrilə bilirlər. Ümumişlək sözlər isə bir müddətdən sonra sözün neologizmə xas xüsusiyyətlərini itirir. İnsanlar yaşadıqca yeniliklərin baş verməsi qaçınılmazdır. Dolayısı ilə neologizmlər həmişə yaranacaq və zaman aşımına uğrayıb yenilənəcək.

## Ədəbiyyat:

1. Aziza Hajiyeva, English lexicology, Baku, 2011.
2. Buludxan Xəlilov, Müasir Azərbaycan dilinin leksikologiyası, Bakı, 2008.
3. R.S.Ginzburg, S.S.Khidekel, G.Y.Knyazeva, A.A.Sankin, A course in modern English lexicology, Moscow, 1979.
4. https://kpfu.ru/docs/F1797492221/Lectures.on.Le_icology1.pdf
5. https://kayzen.az/blog/Az%C9%99rbaycan-dili/466/leksika-2.html

**Neologisms in English and Azerbaijani languages**
**Summary**

Neo-religiousism plays an important role in lexical composition. As a result of the research, neologism, the emergence of the emergence of technicians and technicians in the modern era, the emergence of a new fundraising system and the emergence of a great fund. In a postulated period of postage, all the neologisms are set up by the oblique oblique slopes. More than once the necks of the boy are weighed down on the character.

In modernity, not in the background of innovation and technical innovation. Consequently, neologisms will always be created and updated in the summer.

**Неологизмы в английском и азербайджанском языках**
**Резюме**

Неологиизмы играют очень важную роль в лексическом составе слова. Неологизмы, возникшие как результат развития науки и техники в современный период, пополняют язык новыми словами и обогощают его словарный фонд. После определенного периода почти все неологизмы становятся обычными общеупотребительными словами. Общие слова через некоторое время теряют некоторые характерные для неологизма особенности.

В современном мире на фоне развития науки и техники инновации неизбежны. Следовательно, неологизмы постоянно будут появляться и обновляться в языке.

**Rəyçi: f.f.d. D.Ə.Həşimova**

DOI: 10.36719/AEM/2007-2019/49/7-10

**Gülhanım İsmihanova**
Bakü Slavyan Üniversitesi
**Merve Yokuş**
Kafkas Üniversitesi, Türkiye

# TÜRKİYE TÜRKÇESİ VE AZERBAYCAN TÜRKÇESİNDE Kİ'li BİRLEŞİK CÜMLELER

***Anahtar sözcükler:*** *Azerbaycan Türkçesi, Türkiye Türkçesi, yan cümle, ki bağlacı*
***Açar sözlər:*** *Azərbaycan Türkcəsi, Türkiyə Türkcəsi, budaq cümlə, ki bağlayıcısı*
***Key words:*** *Azerbaijani Turkish, Turkey Turkish, subordinate clause, conjunction ki*

## Giriş

Son dönemlerde çağdaş Türk lehçelerinin gramer özelliklerinin karşılaştırmalı şekilde araştırılması çok geniş yayılmıştır (Bkz. 11; 12; 13; 14; 16; 23; 26; 29). Bu, bir taraftan, uzun yıllar farklı sebeplerden dolayı birbirinden uzaklaşmış Türk halklarının yaklaşma isteğine bağlıysa, diğer taraftan dilbilimcilerin Türk dilleri ailesinin aynı kökten gelmiş olduğunu ve bir bütün hâlinde varoluşunu dünya dilbilimine kanıtlama isteği ile ilgilidir (14, 4). Bu çalışmada farklı araştırmacıların gramer kitaplarındaki ki'li birleşik cümle ile ilgili görüşleri aktarılacak, dilbilimcilerin her iki dildeki ki'li birleşik cümle ile ilgili yorumları üzerinde durularak değerlendirme yapılacaktır.

## 1. Türkiye Türkçesi Dilbilgisinde Ki'li Birleşik Cümleler Hakkında Görüşler

Türkiye Türkçesi dilbilgisi kitaplarında tanımı ve tasnifi noktasında farklılıklar bulunan birleşik cümle genellikle *girişik birleşik cümle, şartlı birleşik cümle, iç içe birleşik cümle* ve *ki'li birleşik cümle* olarak sınıflandırılmaktadır. Türkçede "ki bağlacıyla kurulan cümleler" (4, 94), "ilgi tümcesi" (7, 216), "bağlaçlı yantümce" (19, 147), "ki'li birleşik tümce" (9, 483) ve "ki'li birleşik cümle" (10, 405; 21, 515) gibi farklı isimlerle nitelendirilen bu cümle türü; aralarında anlam yönünden sıkı bir ilişki bulunan iki cümlenin, "ki" bağlama edatıyla bağlanmasından meydana gelir. Yapı itibariyle temel cümlenin başta, yardımcı cümlenin sonda yer alması sebebiyle pek çok dilbilgisi kitabı, ki'li birleşik cümlelerin Türkçenin cümle yapısına aykırı olduğunu söylemektedir. Bunun yanı sıra Türkçe cümle düzenine aykırı olmakla birlikte ki'li birleşik cümlelerin Türkçe cümle düzenine sokulmasının mümkün olduğu da belirtilmektedir (Bkz. 31, 1064).

L. Karahan, ki'li bileşik cümleyi bağlı cümle olarak ele almıştır. Gerekçe olarak da *ki* bağlacının temel ve yan cümleyi bağladığını savunmuştur (22, 64).

M. Ergin'e göre Türkçede aslında bağlama edatı yoktu, bağlama edatları Türkçede sonradan ve yabancı dillerin tesiri ile ortaya çıkmıştır. Onun için de Türkçede kullanılan bağlama edatlarının büyük bir kısmı yabancı asıllıdır… *Ki* ya iki fiili, iki cümleyi ve ya bir isimle bir fiili, bir isim unsuru ile onun izahı olan bir cümleyi birbirine bağlar. Her iki halde de ki'den sonra gelen cümle yardımcı cümledir. "Ki" kendisinden sonra gelen yardımcı cümleyi kendisinden önce gelen unsura bağlar (10, 332-405).

S. Çağatay, iki şekil "ki" olduğunu söyler. İlki Türkiye Türkçesinde şimdiki zaman, bilinen geçmiş zaman, duyulan geçmiş zaman ve gelecek zaman eklerinden sonra getirilen *ki*'dir ve bu *ki* aslında Eski Türkçedeki *erki*'den gelen ki'dir, diğeri de Farsçadan geçen *ki*'dir. Nihayetinde fiilden sonra gelen ki'lerin Eski Türkçedeki *erki*'nin kalıntıları olduğunu belirtir. Bu iki şekil ki'den, Farsça olanlarla Eski Türkçedeki erki'den gelen ki'yi ayırt etmenin zor olduğunu, bunları anlayabilmek için cümleye kazandırdıkları anlamın incelenmesi gerektiğini söyler (6, 248-250).

K. Bilgegil, ki'li birleşik cümleyi "ki bağlacı ile kurulan cümleler" başlığı altında vermiş, Türkçedeki ana unsur ve yardımcı unsurun Farsçanın etkisiyle yer değiştirdiğini söylemiştir. Bilgegil ayrıca *ki* bağlacı ile kurulan cümlelerin çeşitli kullanışlarını yer ve şekil yönünden incelemiş, ki'nin iki cümleden birinin değerine açıklama, sebep bildirme göreviyle, birbirine tahmin veya faraziye bildirecek şekilde bağlandığını belirtmiştir (4, 94).

Özçelik ve Erten, ki'li birleşik cümleyi, bir cümlenin *ki* bağlama edatı ile bir temel cümleye bir öğe olacak şekilde bağlanmasıyla oluşan birleşik cümle olarak tanımlar ve bu özelliği taşımayan cümlelerin, ki'li birleşik cümle sayılmayacağından, ayrıca ki'li birleşik cümlede, yan cümlenin temel cümlenin nesnesi, zarf tümleci veya öznesi olarak kullanılabileceğinden bahsederler (30, 201-202).

H. Ediskun ise böyle cümleleri "ki'li bağlı cümle" olarak değerlendirmektedir. Bu cümlelerin aslında Türkçe olmadığını, birinci cümlenin ana cümle, ikincinin yardımcı cümle olduğunu söylemektedir (8, 388).

T. Gülensoy ki'li birleşik cümle için "*ki* bağlacıyla temel cümle ile yan cümlenin bağlandığı cümlelerdir" demektedir (18, 437).

N. Atabay ve arkadaşları yine bu cümle türü için, 'temel cümleye ki bağlacıyla bağlanan yan cümle' ifadesini kullanmıştır (3, 101). Ki'li bileşik cümle için ki bağlacı, sonuna geldiği cümlenin bir temel cümleye neden sonuç, açıklama belirterek bağlar. Bu bağlaç iki cümleyi bağladığında bileşik cümle oluşur.

Korkmaz, ki'li birleşik cümleyi bir temel cümle ile o temel cümleye ki / kim nispet zamiri ile bağlanan açıklayıcı bir yardımcı cümleden oluşan birleşik cümle olarak tanımlar. "Kim" şeklinin genelde tarihi devir metinlerinde yer aldığından söz eder (27, 148)

F. Bozkurt, ki'li bileşik cümleyi "ki bağlaçlı cümle" olarak tanımlar ve bu cümlelerin bağlaçlı cümleler içinde irdelenmesi gerektiğini söyler (5, 288).

H. Dizdaroğlu, ki'li birleşik cümleyi bileşik cümleler içerisinde, "ilgi tümcesi" başlığı altında incelemekte, ki'li birleşik cümleyi iki cümlenin birbirine *ki* bağlacıyla bağlanmasından oluşan birleşik cümle diye tanımlamaktadır (7).

Bu dilbilimçilerden farklı olarak, İ. Guliyev, Azerbaycan Türkçesi ve Türkiye Türkçesini sözdizimsel olarak karşılaştırırken konu ile ilgili: "Türkiye Türkçesi dilbilgisine göre, birleşik cümlenin "şartlı birleşik cümle", "ki'li birleşik cümle" ve "iç içe birleşik cümle"den oluşan üç türü vardır. Fakat bu sınıflandırma Türkiye Türkçesi'ndeki tüm cümle türlerini kapsamamaktadır." şeklinde açıklama yapar (12, 495).

## 2. Azerbaycan Türkçesi Dilbilgisinde Ki'li Birleşik Cümleler Hakkında Görüşler

Azerbaycan Türkçesinde birleşik cümleler, iki veya daha fazla basit cümlenin anlam ve gramatik bakımdan birleşmesiyle meydana gelir (25, 305) ve tabesiz mürekkeb cümle ve tabeli mürekkeb cümle olmak üzere ikiye ayrılır. Bunlardan tabesiz mürekkeb cümle, Türkiye Türkçesi dilbilgisinde bağlı cümleler (sıralı bağlı cümleler, açıklamalı bağlı cümleler), sıralı birleşik cümle, bağlı birleşik cümleler, sıralı cümle, sıra cümleler, bağımlı sıralı cümleler, bağımsız sıralı cümleler başlıkları altında incelenmekte (15, 2), tabeli mürekkeb cümleler ise Türkiye Türkçesi dilbilgisindeki ki'li birleşik cümle, şart cümlesi, iç içe birleşik cümle konularını kapsamakta olup cümle öğelerinin (mübteda/özne, xeber/yüklem, tamamlık/nesne, yer tamlayıcısı, teyin/sıfat, zerflik/zarf) adları ile daha detaylı şekilde öğrenilmektedir. Bu sebepten çalışmamızı Azerbaycan Türkçesindeki tabeli/bağımlı birleşik cümlelerden yola çıkarak devam etmemiz yerinde olacaktır.

G. Kazımov'a göre, iki ve daha fazla cümlenin anlam, sentaks yönünden bir bütünü oluşturmasına tabeli mürekkeb/bağımlı birleşik cümle denmektedir. Bağımlı birleşik cümlede gramatik yönden esas olan kısma baş/ana cümle, baş cümleye bağlı olarak onu tamamlayan kısma budak/yan cümle denmektedir (25, 305-307).

Bağımlı birleşik cümlenin içerisine dahil olan yardımcı cümleler çeşitli görevler yerine yetirir, daha doğrusu yardımcı cümle temel cümleye çeşitli yönlerden hizmet eder. Şöyle ki, bazen, yardımcı cümleler temel cümlenin genel sorusuna cevap olup onu izah eder. Bazen temel cümlenin bir üyesine ait olup onu tamamlar, bazen de temel cümlede ifade olunan hal-hareketin zamanını, yerini, tarzını, sebebini, maksadını, miktarını vb. niteliğini bildirir" (28, 222-223).

G. Kazımov bağımlı birleşik cümlenin taraflarını birbirine bağlayan unsurlar arasında *ki* bağlacının rolüne değinerek yazar: "*Ki* izahedici, açıklayıcı bağlaçtır. *Ki* bağlacı bazen sadece tonlama vasıtasıyla ana ve yan cümle arasında ilişki oluşturur, başka bir araç olmadan yan cümleyi ana cümleye bağlar ve bu zaman yan cümlenin türü cümlenin gramatik anlamı ve ana cümleden doğan soruya dayanarak belirlenir" (25, 378).

Belirtmemiz gerekir ki, "ki" Azerbaycan Türkçesinde hem bağlaç, hem de edat görevinde kullanılmaktadır (20, 228-249). *Ki* bağlaç gibi kullanıldıkta bağımlı birleşik cümlenin taraflarını birbirine bağlar, genellikle yüklemden sonra gelir (17, 132), edat gibi ise iki şekilde rastımıza çıkar: 1) cümlenin sonunda geler ve duygusallık bildirer, örn: *Dünya kurumayıb ki*?!; 2) *kim ki, kimi ki, kimə ki, hər ne ki, harada ki, ne qeder ki vs.* şekillerde yan cümleyi ana cümleye bağlayan sözcükle birlikte kullanılır; örn.: *Kime ki üz tuturdu, eyni cavabı alırdı*. Bunlardan sonra vergül konulmaz… *Ki* – yan cümleyi ana cümleye bağımsız şekilde bağlayan edat gibi de kullanılır; *örn.: Men ki delileri, hanımları bele incitdim, day bir de onlar menim sözüme bakmazlar* (25, 373).

Görüldüğü gibi, *ki* yardımçı kelime türü olarak, Azerbaycan Türkçesinde hem bağlaç hem de edat görevinde kullanılmakta ve her iki durumda da bağımlı birleşik cümlede rol üstlenmektedir. Fakat *ki*'nin görevleri göz önünde bulundurulduğunda *ki* edatı ve *ki* bağlacı ile kurulan cümlelerin yapı açısından birbirinden farklı olduğu görülmektedir, şöyle ki, *ki* edatı ile kurulan cümlelerde yan cümle ana cümleden önce gelir, *ki* bağlacı ile kurulan cümlelerde ise Türkçenin yapısına aykırı olarak ana cümle yan cümleden önce gelir.

Azerbaycan Türkçesinde bağımlı birleşik cümleler yan cümlenin adı ile adlandırılmakta olup aşağıdaki türleri vardır:

1. Mübteda/özne yan cümlesi;
2. Haber/yüklem yan cümlesi;
3. Tamamlık/nesne, yer tamlayıcısı yan cümlesi;
4. Tayin/Sıfat yan cümlesi;
5. Zerflik/zarf yan cümlesi (buraya zaman yan cümlesi, yer yan cümlesi, terzi-hareket/durum yan cümlesi, sebep ya cümlesi, netice yan cümlesi, maksat yan cümlesi, kemiyet yan cümlesi, derece yan cümlesi, şart yan cümlesi, karşılaştırma yan cümlesi dahildir.);
6. Koşulma/ilave yan cümlesi. (1, 304; 2, 266).

Azerbaycan Türkçesinde bağımlı birleşik cümleler ana ve yan cümlenin yerine, bağlayıcı unsurlara ve güncelleştirme usullerine göre de ikiye ayrılır (24, 343). Bunlardan birincisi *yan cümle+ana cümle* yapılı, ikincisi ise *ana cümle+yan cümle* yapılı bağımlı birleşik cümlelerdir. İkinci tür (*ana cümle+yan cümle* yapılı) cümlelerin taraflarının ilişkilendirilmesinde *ki* bağlacı önemli yere sahiptir; örneğin:

Mübteda/özne yan cümlesi: O da melum idi ki, Nerimanın hatrına deymek istemirdi.

Haber/yüklem yan cümlesi: Soltan ağa, doğrusu budur ki, bu saat ele bu degige, padşahlık yolu ile Qalaya Araz terefinden bir karvan kişmiş aparırlar. Mesele bundadır ki, men bu evden getmeyeceyem.

Tamamlık/nesne yan cümlesi: El bilir ki, sen menimsen, Yurdum yuvam meskenimsen.

Tayin/sıfat yan cümlesi: O, ele bir güvve idi ki, Cevriye onun tesiri altında tamam deyişip başka cür ola bilerdi.

5. Zerflik/zarf yan cümlesi (buraya zaman yan cümlesi, yer yan cümlesi, terzi-hareket/durum yan cümlesi, sebep yan cümlesi, netice yan cümlesi, maksat yan cümlesi, kemiyet yan cümlesi, derece yan cümlesi, şart yan cümlesi, karşılaştırma yan cümlesi dahildir.). Örn.:

a. Tarz-Hareket/Durum yan Cümlesi: Seni görüm boğazın ele tutulsun ki, su da ötmesin, ay göyermiş.

b. Zaman yan Cümlesi: Barıştıktan sonra İbrahim Han dönüp, Karabağ'a gitmek isteyirdi ki, İraklı Han yeni topladığı orduyla gelip, Gence'ye çıktı.

c. Yer yan cümlesi: Harada ki, eserlerin tesiri çok idi, orada halkın azabı artırdı.

ç. Kemiyet yan cümlesi: Ne kadar ki kinoya bakırdım, her şey yadımdan çıkmıştı.

d. Sebep Budak Cümlesi: Siz çok hoşbehtsiniz ki, emi gibi büyüğünüz var.

e. Maksat yan cümlesi: Biz zahmeti ona göre çekirik ki, asıl insan kimi yaşayak.

f. Şart yan cümlesi: Bütün bunlar bir şartla düzeler ki, sonradan kanıkaralık olmasın.

g. Koşulma Budak Cümlesi: Kız şalının saçaklarını ditmekle meşgul idi ki, bu da onun bir kadar kıskandığını gösterirdi.

6. Derece yan Cümlesi: O, hakikaten indi o kadar güzel, o kadar letafetli görünürdü ki, ele bil tamamiyle başka bir adam, başka bir güzel idi (Bkz. 24, 350-369).

## Sonuç

Oğuz Grubu Türk Dilleri arasında yer alan Türkiye Türkçesi ve Azerbaycan Türkçesi aynı köke, aynı anlama sahip olsalar da bunlar arasındaki gramatik farklılılar gözardı edilemez. Türkiye Türkçesi Dilbilgisine göre birleşik cümle dörde (ki'li birleşik cümleler, iç içe birleşik cümleler, şartlı birleşik cümleler, girişik cümleler) ayrılmakta olup, bunlardan *ki* bağlacı ile kurulan cümleler "ki'li birleşik cümleler" şeklinde adlandırılmaktadır ve bunları tekrar alt türlere ayırma eğilimi görülmemektedir. Azerbaycan Türkçesi Dilbilgisine göre ise birleşik cümleler öncelikle ikiye (tabesiz/bağımsız ve tabeli/bağımlı) ayrılmakta, bunlardan tabeli/bağımlı birleşik cümleler beş cümle öğesinin adı ile adlandırılmakta ve daha detaylı şekilde öğrenilmektedir. Türkiye Türkçesi dilbilgisinde sınıflandırma şeklinin cümlenin yapı özelliklerine göre yapılmasına karşın, Azerbaycan Türkçesi dilbilgisinde sınıflandırmanın hem yapı, hem de yan cümlenin anlam özelliklerine göre yapıldığı, aynı kuruluştaki cümlelerin anlamlarına göre farklı başlıklarda incelenmesi dikkat çeker.

## Kaynakça:

1. Abdullayev A. vb. Müasir Azerbaycan Dili, Sintaksis, 4. hisse, Şark-Garb Yayınları, Bakü, 2007.
2. Abdullayeva G. Müasir Azerbaycan Dili, II hisse, Elm ve Tahsil, Bakü, 2013.
3. Atabay N. vb. Türkiye Türkçesinin Sözdizimi, Papatya Yayınları, İstanbul, 2003.
4. Bilgegil K., Türkçe Dilbilgisi, Dergah Yayınları, İstanbul 1982.
5. Bozkurt F., Türkiye Türkçesi, Hatipoğlu Yayınları, Ankara 1999.
6. Çağatay S., Türkçede *ki-erki*, TDAYB, 1963, TDK Yayınları, Ankara, 1964.

7. Dizdaroğlu H., Tümce Bilgisi, TDK Yayınları, Ankara, 1976.
8. Ediskun H., Türk Dilbilgisi, Remzi Kitabevi, İstanbul, 1999.
9. Eker S., Çağdaş Türk Dili, Grafiker Yayınları, Ankara, 2005.
10. Ergin M., Türk Dil Bilgisi, Bayrak Yayınları, İstanbul, 2000.
11. Guliyev İ. Türkiye ve Azerbaycan Dilbilgisinde Ad Tamlamalarının Araştırılması Üzerine, International Journal of Languages' Education and Teaching, s.1453-1465, UDES, Münhen, Almanya, 2015.
12. Guliyev İ., Azerbaycan ve Türkiye Türkçesinde Dilin Sözdizimsel Yapısının Öğrenilmesi Üzerine, XII. Uluslararası Büyük Türk Dili Kurultayı, 2017.
13.Guliyev İ., Türkiyeli Öğrencilerin Azerbaycan Türkçesi Gramerinin Öğretiminde Karşılaştığı Sorunlar ve Onların Çözüm Yolları, 13. Uluslararası Dil, Yazın ve Deyişbilim Sempozyumu, 2013.
14. Gulusoy İ. Türkiye Türkçesi ve Azerbaycan Türkçesinde Şart Cümlesine Dair, Türkiyat Mecmuası, c. 29/1, s. 81-92, Türkiye, 2019.
15. Gulusoy İ. Mirza Feteli Ahundzade'nin Dram Eserlerinde Sıralı Birleşik Cümleler, International Journal of Innovative Technologies in Social Science, Polonya, 2018.
16. Gulusoy İ., GULİYEVA, K. Türkiye Türkçesi ve Azerbaycan Türkçesi Dilbilgisinde Cümlenin Dahili Öğelerini Göre Tahlili. 2. Uluslararası Dergi Karadeniz Sosyal Bilimler Sempozyumu, Sempozyum Bildiriler Kitabı, s.11-19, 21-23 Haziran, Giresun, Türkiye, 2019.
17. Gulusoy İ. Gazi Bürhaneddin "Divan"ının Dilinin Sintaksisi, Sonçağ, Ankara, 2019.
18. Gülensoy T., Türkçe El Kitabı, Akçağ Yayınları, Ankara, 2000.
19. Hatipoğlu V., Türkçenin Söz Dizimi, DTCF Basımevi, Ankara, 1982.
20. Hüseynzade M. Müasir Azerbaycan Dili, Sintaksis, 3. hisse, Şark-Garb Yayınları, Bakü, 2007.
21. Karaağaç G., Türkçenin Dil Bilgisi, Akçağ Yayınları, Ankara, 2012.
22. Karahan L., Türkçede Söz Dizimi, Akçağ Yayınları, Ankara, 1999.
23. Karaörs M. Karşılaştırmalı Şekil ve Cümle Bilgisi, Akçağ Yayınları, Ankara, 2005.
24. Kazimov G. Müasir Azerbaycan Dili, Sintaksis, Elm ve Tahsil Yayınları, Bakü, 2007.
25. Kazimov G. Müasir Azerbaycan Dili, Morfologiya, Elm ve Tahsil, Bakü, 2010.
26. Kerimoğlu C. Türkiye Türkçesi ve Tatar Türkçesinin Karşılaştırmalı Söz Dizimi, TDK Yayınları, Ankara, 2014.
27. Korkmaz Z., Gramer Terimleri Sözlüğü, TDK Yayınları, Ankara 2007.
28. Mehmedoğlu A., Bağımlı Birleşik Cümleler Üzerine, Türk Dili (Dil ve Edebiyat Dergisi), Mart, Sayı 567, 1999.
29. Musayev M., Türk Edebi Dillerinde Mürekkep Cümle Sintaksisi. Kitab alemi, Bakü, 2010.
30. Özçelik S., ERTEN, M., Türkiye Türkçesi Dilbilgisi, Set Matbaacılık, Diyarbakır, 1999.
31. Telli B., *Ki* Bağlama Edatı, *Ki*'li Birleşik Cümleler ve Küçük Ağa'daki *Ki* Bağlayıcısının Fonksiyonları, JASSS, 6/4, s.1061-1080, 2013.

**Complicated sentences in Turkish and Azerbaijani, formed by the «ki» union**

**Summary**

The article talks about complex sentences in Turkish and Azerbaijani languages formed with the help of the "ki" union. The theoretical questions associated with complex sentences in both languages are carefully analyzed. Compound sentences formed with the help of the "ki" union are called in Turkish the compound sentence with "ki". But these types of sentences in the Azerbaijani language are more accurately grouped by the names of the sentence members and are studied as part of subordinate clauses.

**Сложные предложения в турецком и азербайджанском языках, образованных с помощью союза «ki»**

**Резюме**

В статье говориться о сложных предложениях в турецком и азербайджанском языках, образованных с помощью союза «ki». Тщательно анализируются теоретические вопросы, связанные со сложными предложениями в обоих языках. Сложные предложения, образованные с помощью союза «ki», называются в турецком языке «сложное предложение с «ki»». Но эти типы предложений в азербайджанском языке более точно сгруппированы по названиям членов предложения и изучаются в составе придаточных предложений.

**Rəyçi: dos. İ.Qulusoy**

DOI: 10.36719/AEM/2007-2019/49/11-15
**Zərifə İsmayıl qızı Avilova**
Azərbaycan Tibb Universiteti

# ORTA ƏSR AZƏRBAYCAN ƏDƏBİYYATININ VƏ AZƏRBAYCAN ƏDƏBİ DİLİNİN İNKİŞAFINDA M.ƏMANİNİN ROLU

***Açar sözlər:*** *M.Əmani, orta əsr Azərbaycan ədəbiyyatı, Azərbaycan ədəbi dili, Həmid Araslı*
***Key words:*** *M. Amani, medieval Azerbaijani literature, Azerbaijani literary language, Hamid Arasli*
***Ключевые слова:*** *М.Амани, средневековая азербайджанская литература, азербайджанский литературный язык, Хамид Араслы*

XVI əsrin sonu XVII əsrin əvvəllərində yaşayıb-yaradan, əsərlərinin xeyli hissəsini ana dilində yazan Azərbaycan şairlərindən biri də Məhəmməd Əmanidir.

M.Əmani Səfəvi hökmdarlarının bütün İranda qüdrətli bir dövlətə başçılıq etdiyi, şiəliyin və qızılbaşlığın geniş kütlə içərisində böyük rəğbət qazandığı bir dövrdə yaşayıb-yaratmış sənətkarlardandır. Şairin yaşadığı dövr həm də Türkiyə sultanlığı tərəfindən Azərbaycana qarşı böyük işğalçılıq siyasətinin həyata keçirildiyi bir dövr idi. Bu dövrdə Səfəvi torpaqlarında yaşayan Türkiyə işğalçıları əleyhinə əsərlər yazan şairlər içərisində ən məşhuru Məhəmməd Əmani olmuşdur.

Məhəmməd Əmaninin bir şair kimi yetişməsində dövrün, ədəbi mühitin təsiri ilə yanaşı, özündən əvvəlki mədəniyyət və ədəbiyyatın da qüvvətli təsiri olmuşdur. Ümumiyyətlə, şair və onunla bir dövrdə yaşayan Azərbaycan klassikləri Şərq poeziyasında, xüsusilə, Azərbaycanın keçmiş söz ustalarının tükənməz irsindən və getdikcə büllurlaşmaqda olan şifahi xalq ədəbiyyatından bəhrələnmişlər.

Azərbaycan ədəbiyyatının inkişafında Füzuli məktəbinin davamçılarından biri kimi M.Əmaninin də böyük rolu olmuşdur. Əmaninin yaradıcılığı bizə iki dildə - Azərbaycan və fars dillərində gəlib çatmışdır.

Klassik Azərbaycan ədəbiyyatının yaxşı cəhətlərindən faydalanan şair, xalq şeirinin və canlı danışıq dilinin bir çox ifadələrini öz əsərlərində işlətməklə klassik poeziya dilini daha da zənginləşdirmişdir.

Məlum olduğu kimi, XV əsrdən başlayaraq Azərbaycan ədəbiyyatında məhəbbət lirikası daha geniş yayılır. Şairlərin çoxu qəzəl yazmaqla şöhrətlənir. XV əsrdə Kişvəri, Hamidi, Sürurі, Həbibi, XVI əsrdə Xətai, Füzuli kimi divan müəllifləri içərisində Məhəmməd Əmaninin də adı şərəflə çəkilir. Lakin məhəbbət lirikası ilə yanaşı, bu dövrdə təriqətə, dini mövzulara, xüsusən şiəliyi təbliğə, ədəbiyyata da geniş yer verilirdi. Hakim feodal-ruhani dairələr, şah sarayları, saray əyanları ədəbiyyatda dini mövzulara xüsusi əhəmiyyət verir, ayrı-ayrı təriqət görüşlərinin yayılmasına şərait yaradırdılar. Onların mənafeyinə xidmət edən şairlər hakim feodal-ruhani və dini təriqət görüşlərini təbliğ etməklə məşğul olur, əsas yaradıcılıqlarını bu sahədə inkişaf etdirirdilər.

Şairlərin başqa bir qismi isə şəhər sənətkarlarının görüşlərini əks etdirirdi. Bu şairlər ümumxalq mənafeyini müdafiə edir, feodal zülmünü, zahidlərin, abidlərin, ümumiyyətlə, ruhani təbəqələrin riyakarlığını tənqid edirdilər. Bu yazıçılar öz mütərəqqi fikirlərini məhəbbət mövzusunda yazılmış əsərlərində ifadə etməyə çalışırdılar.

Məhəmməd Əmani də təxminən belə bir dövrdə yaşamış, öz əsərlərində şahların və feodalların işğalçılıq siyasətinə qarşı münasibətini bildirmişdir.

Məhəmməd Əmani haqqında ilk sözü şairin müasiri, onunla şəxsən tanış olub, yaxınlıq edən görkəmli təzkirəçi Sadiq bəy Əfşar demişdir. O, özünün "Məcnə-ül-Xəvas" adlı təzkirəsində Əmani haqqında qısa, lakin qiymətli məlumat verir. Sadiq bəy Əfşar Məhəmməd bəy Əmaninin Bayburt türklərindən olub. Yazdə hökmdar olduğunu, "Əmani" təxəllüsü ilə şeirlər yazdığını qeyd etmişdir. Təzkirə müəllifinin verdiyi məlumatdan aydın olur ki, M.Əmani tez-tez şeir məclisləri düzəldərmiş və çox zaman onu da o məclislərə dəvət edib, orada öz şeirlərini oxuyarmış. Sadiqi sonra öz təzkirəsində Əmaninin şeirlərindən nümunələr verir. Onun Əmani haqqında verdiyi qısa, ancaq tarixi və elmi cəhətdən qiymətli olan bu məlumatı şairin həyat və yaradıcılığını öyrənmək üçün son dərəcə əhəmiyyətlidir. Sadiqinin Əmani haqqında verdiyi məlumatın başqa bir əhəmiyyəti də budur ki, bu məlumat Əmaninin öz dövründə elm və ədəbiyyatı sevən, mədəniyyətin inkişafında yaxından iştirak edən, tez-tez şairləri öz yanına toplayıb, şeir məclisləri təşkil edən bir şəxs olduğunu göstərir. Sadiqinin öz məlumatında Əmanidən gətirdiyi:

Sayən başimdin, ey şahi-xuban, kəm olmasun,
Bəslindin ayru ömr mana bir dəm olmasun –

beytindən aydın olur ki, o hələ öz sağlığında ikən lirik bir şair kimi tanınmışdır.

Məhəmməd Əmani haqqında Sadiqidən bir neçə əsr sonra nisbətən ətraflı məlumat verənlərdən biri də məşhur ingilis şərqşünası Şarl Riodur. Şarl Rio Əmani barədə söylədiyi bütün fikirləri onun öz şeirlərindən tolamış, Əmani haqqında ilk söz söyləyən Sadiq bəy Əfşardan xəbəri olmamışdır. Şarl Rio özü bu barədə yazır ki, Əmani haqqında məlumatlarımız onun şeirlərindən, poemalarından toplanılan faktlarla məhdudlaşır. Lakin hər iki tədqiqatçının şair haqqındakı fikirləri bir-birinə uyğun gəlir.

Şarl Rio şairin bəzi şeirlərindən və məsnəvilərində göstərilən yer və şəhər adları ilə əlaqədar şairin gəzdiyi ölkələri, iştirakçısı olduğu hərbi yürüşləri dəqiqliyi ilə şərh etməyə çalışmışdır.

Məhəmməd Əmani haqqında məlumat verən tədqiqatçılardan biri də İsmayıl Hikmətdir. O, Sadiqinin Əmani haqqında verdiyi məlumata kiçik əlavələr etməklə, əsasən onu təkrar etmişdir. İsmayıl Hikmət özü də bu fikri təsdiq edir. Onun Əmanidən verdiyi şeirlər “Məcmə-ül-Xəvas”dan, ya da Ş.Rionun kataloqundan götürülmüşdür. Özü isə şəxsən şairin divanını tədqiq etməmişdir. Bunlarla yanaşı, İ.Hikmət öz sələflərindən fərqli olaraq, Əmani haqqında, xüsusən onun yaradıcılığından daha geniş danışmağa təşəbbüs etmişdir. O, şairin dili, ictimai görüşləri və sənəti haqqında da bəzi fikirlər söyləmiş və Əmaniyə “... hicri X əsr/miladi XVI əsrin sonu XVII əsrin əvvəlləri – R.Z./ azəri şairləri arasında yaxşı bir mövqe tutan şair olduğuna şübhə yoxdur”, - deyə yüksək qiymət vermişdir.

Məhəmməd Əmaninin yaradıcılığını müasir dövrdə daha ardıcıl və düzgün təhlil edən H.Araslı olmuşdur. H.Araslının Əmani haqqında verdiyi məlumatların qiymətli cəhəti odur ki, o, şair haqqında indiyə qədər deyilənlərə kifayətlənməmiş, şairin divanını şəxsən mütaliə etmiş, və onun yaradıcılığı haqqında bir sıra orijinal fikirlər söyləmişdir. Tədqiqatçı Əmaninin qəsidə və məsnəvilərinin sənətkarlıq və mövzu xüsusiyyətlərindən danışarkən, onların tarixi hadisələr və həyati faktlarla bağlılığını yüksək qiymətləndirir: “Şairin bu şeirləri əsasında müəyyən müharibələrin təfsilatını bilmək mümkün olmasa da, ümumi əhval-ruhiyyə və qələbənin tarixi müəyyən edilmiş olur ki, bu da ədəbiyyatımızda tarixi vaqiələrin təsvirinə bir zəmindir”.

Məhəmməd Əmani haqqında hələlik son fikir söyləyən Balaş Azəroğludur. B.Azəroğlu Azərbaycan şairi Məhəmməd Əmani haqqında deyilənləri və sənətkarın öz yaradıcılığını dərindən öyrənərək, onun həyat və yaradıcılığı haqqında monoqrafik əsər yazmışdır. Şübhəsiz ki, bu iş şairin həyat və yaradıcılığını öyrənmək, onun əsərlərinin dilini tədqiq üçün son dərəcə qiymətlidir.

Belə bir cəhəti də qeyd etmək lazımdır ki, Azərbaycan tədqiqatçılarına qədər şairin anadan olduğu tarix təxmini də olsa müəyyənləşdirilməmişdi. H.Araslı və Balaş Azəroğlu şairin doğulduğu ili onun öz əsərlərinə əsaslanaraq müəyyənləşdirməyə təşəbbüs göstərmişlər. Hər iki tədqiqatçının bu barədə gəldiyi son nəticə bundan ibarətdir ki, M.Əmani Məkkəyə ziyarətə getdiyi zaman onun özünün göstərdiyi kimi, yaşı 60-dan şox olmuşdur. Şairin Məkkə ziyarəti isə hicri 1006-cı (1597-1598) illərə təsadüf edir. Deməli, Məhəmməd Əmani hicri 944-945-ci illərdə (1545-1546) anadan olmuşdur.

Azərbaycan ədəbiyyatı tarixində Məhəmməd Əmaninin ən böyük xidməti ondan ibarətdir ki, o, bu ədəbiyyata ilk dəfə olaraq mənzum hekayə janrını gətirmiş və şeirin müxtəlif növlərində əsərlər yaratmışdır.

Əmani yaradıcılığının Azərbaycan ədəbi dilinin inkişafında da böyük rolu olmuşdur. Azərbaycan klassik ədəbiyyatının görkəmli nümayəndəsi kimi M.Əmaninin bədii yaradıcılığına dair bir sıra məqalə və tədqiqat işləri yazılsa da, onun şeirlərinin dil xüsusiyyətləri hələ də öyrənilməmişdir.

Halbuki, M.Əmaninin Azərbaycan dilində olan divanının dilini tədqiq etmək vacib və zəruridir. Çünki 430 il bundan əvvəl Azərbaycan ədəbi dilinin leksik tərkibi və qrammatik xüsusiyyətləri haqqında fikir yürütmək üçün onun divanı çox dəyərli və zəngin material mənbəyi ola bilər.

Divan üzərində aparılan tədqiqat işi göstərir ki, əsərin istər leksik tərkibində, istərsə də qrammatik normalarında müxtəlif dialekt və şivə xüsusiyyətləri, o cümlədən qıpçaq və qarluq qrupu türk dillərinin /qədim özbək, cığatay və qədim uyğur/ ünsürləri müəyyən rol oynamışdır. Bu isə təsadüfi deyildir. “Məlumdur ki, bu və ya başqa dövrün ədəbi dilində bir, yaxud iki şivənin üstünlük qazanması xalqın etnik tərkibində baş verən dəyişikliklərlə, habelə şəhərin siyasi-iqtisadi inkişafı, həmin şəhərdə əhalinin toplanması, əhali içərisində təbəqələşmə getməsi böyük şair və yazıçıların fəaliyyət göstərməsi və s. amillərlə əlaqədardır”.

Həmin dövrdə Azərbaycan ədəbiyyatı nümayəndələrindən bir çoxunun orta Asiyada – Herat ədəbi məktəbində təhsil almaları cığatay və qədim özbək dillərinin Azərbaycan dilinə təsirini artırmışdır. Belə ki, Əlişir Nəvai və Hüseyn Bayqara kimi şairlərin şeirləri ilə qidalanmış və pərvazlanmış həmin sənətkarlar Azərbaycana qayıtdıqları zaman öz dillərində və şeirlərində cığatay və qədim özbək dilinin xüsusiyyətlərini də gətirmişlər.

Beləliklə, məlum olur ki, XVI əsrin sonu XVII əsrin əvvəllərində Azərbaycan ədəbi dili ümumxalq dili əsasında inkişaf etsə də, orta əsr türk dillərinin /qədim özbək və cığatay, qədim uyğur/ bir çox əlamətlərini

özündə saxlamışdır. Məhəmməd Əmani məhz belə bir dövrdə yazıb yaratdığından bu xüsusiyyətlər onun da dilində öz əksini tapmışdır.

Şübhəsiz ki, burada klassik Şərq, xüsusən fars poeziyasının təsirini də unutmaq olmaz. Bu da təbiidir. Çünki şairin yaşadığı dövrdə Azərbaycan şairlərinin bir çoxu fars dilində yazırdılar. Daha doğrusu, bu dövrdə fars dili Azərbaycan dili ilə yanaşı işlənirdi. Azərbaycan, İran feodallarının hakimiyyəti altına düşdüyü dövrdə isə fars dili rəsmi dövlət dili elan olunmuşdu.

Bütün bunlara baxmayaraq, Azərbaycan dili ölkədə daha üstün mövqe tutmuş, Qafqazda və Şərqdə geniş yayılmışdır. Hətta qonşu ölkələrdə bir sıra xalqlar bu dili bilir və ondan istifadə edirdilər. Bu dövrdə Azərbaycan ədəbi dilinin geniş şəkildə yayılmış İran alimlərinin də diqqətini cəlb etmiş, onlar bu dildə məşğul olub, onun qrammatika məsələlərinə xüsusi əsərlər belə həsr etmişlər.

M.Əmaninin şeirlərinin dili belə bir fikri də sübut edir ki, o, Azərbaycan dilinin incəliklərinə, onun ifadə vasitələrinə hərtərəfli bələd olmuş bir sənətkardır. O, ədəbi-bədii üslubun klassik ənənə ilə bağlı qədim ifadə vasitələrindən müvəffəqiyyətlə istifadə etmiş, adi danışıqda işlənən söz və ifadələri, müxtəlif söz birləşmələrini, "yetişə ağızacan", "vayımdan", "tufan başıma qopar", "səbr eylə", "haraya yetişməsə", "qətrə-qətrə cəm olub", "qiyamət qopacaqdur", "qurbanın olub", "heyranın olub", "həzər eylə", morfoloji və sintaktik xüsusiyyətləri yazılı ədəbi dilə cəsarətlə gətirmişdir.

Şairin dilində müasir Azərbaycan ədəbi dili baxımından çətin anlaşılan ərəb-fars sözləri, izafət birləşmələri, arxaikləşmiş sözlər və qıpçaq, qarluq qrupu türk dillərinə məxsus qrammatik formaların işlənməsi də müşahidə olunur. Əmani əsərlərində leksik, morfoloji və sintaktik kateqoriyaların həm türk dillərinin qədim dövrlərinə aid xüsusiyyətlərinə, həm də ümumxalq Azərbaycan danışıq dilinə məxsus cəhətlərinə rast gəlinir ki, bunların da tədqiqi bir tərəfdən Azərbaycan ədəbi dilinin müəyyən mərhələdə inkişafını izləmək, o biri tərəfdən isə türk dillərini müqayisəli şəkildə öyrənmək üçün əhəmiyyətlidir.

Əmani əsərlərinin dili, eləcə də leksikası Azərbaycan ədəbi dilinin, onun bədii qolunun tarixini izləmək üçün zəngin material vardır.

Əmani əsərlərinin lüğət tərkibi çoxcəhətli və rəngarəngdir. Sözdən böyük məharətlə istifadə etmək, onun incəliklərinə sahib olmaq, sadə, adi sözlərə dərin məzmun vermək, onu qiymətləndirmək, seçmək və yerində işlətmək Əmani yaradıcılığına xas xüsusiyyətlərdir.

Əmani əsərlərinin dilini morfoloji cəhətdən öyrənmək üçün şairin Azərbaycan dilində olan "divan"ı əsas götürülmüşdür. Bu "divan"ın əlyazması Londonda Britaniya muzeyinin Şərq xalqları ədəbiyyatı şöbəsində saxlanılır. Həmin əlyazmanın foto-surəti ilk dəfə Leninqrada göndərilmiş, ondan köçürülmüş foto-surət Azərbaycan SSR EA Əlyazmaları Fondunda saxlanılır. Əmani yaradıcılığı ilə məşğul olan tədqiqatçılar və bizim üçün həmin foto-surət əsas olmuşdur.

Divan nəstəliq xətti ilə yazılmışdır. Orta əsr yazılı abidələrindən məlum olur ki, XV-XVII əsrlərdə Azərbaycan şairləri ərəb qrafikasının müxtəlif növləri içərisində nəstəliqdən daha çox istifadə etmişlər. Əmani də belə etmiş və öz əsərlərini bu xətlə yaratmışdır.

Əsərin başlanğıcında rəssam tərəfindən çəkilmiş kiçik ornament vardır. Bundan sonra məsnəvi tərzində bir münacat gəlir. Lakin bu məsnəvinin sonu yoxdur. Divanın birinci səhifəsinin "b" tərəfi isə əvvəli olmayan bir qəzəlin ortasından başlanmışdır. Güman etmək olar ki, burada divanın bir, bəlkə də, bir neçə səhifəsi düşmüşdür. 48-ci səhifədəki qəzəlin ilk beyti yoxdur. Belə bir vəziyyətə divanın son səhifəsində də rast gəlirik. Bundan başqa, divanın 9, 12, 22, 54, 70, 82-ci səhifələrinin yarısı, 55, 78-ci səhifələri isə tamamilə yazılmamış, ağ qalmışdır.

Divanın ölçüsü 18 x 28 sm olan açıq rəngli, o qədər də səliqəli olmayan bir cildə tutulmuşdur. Divan 90 səhifədən ibarətdir. Burada olan qəzəl, qəsidə, qoşma və hekayələrin hər bir səhifədə yerləşdiyi hissə incə xətlərlə haşiyəyə alınmışdır.

Hər haşiyələnmiş çərçivə /14 x 8/ isə bir səhifədə iki əsas hissəyə ayrılmışdır. Bu hissələr bəzən 8, bəzən isə 10-12 incə xətlərlə çərçivəyə alınmışdır. İlk səhifədəki 8 x 5 iki kiçik həcmli əl işindən ibarət olan ornament nəzərə alınmazsa, əsərdə heç bir illüstrasiya və miniatür yoxdur.

Məlumdur ki, hər bir dilin keçmiş olduğu tarixi ətraflı və bütün cəhətləri ilə öyrənmək üçün müxtəlif dövrlərdə yaranmış abidələrin tədqiqi əhəmiyyətlidir. Bu baxımdan ayrı-ayrı əsərlərin dilinə dair aparılmış tədqiqatlar qiymətlidir və belə tədqiqatlara həmişə böyük ehtiyac vardır.

XVI-XVII əsr abidələrində də Azərbaycan ədəbi dili tarixini öyrənmək üçün zəngin materiallar vardır. Məhz ona görə də həmin dövrdə yaranmış abidələrin dilinin tədqiqinə bir sıra monoqrafiyalar həsr edilmişdir. Şübhəsiz ki, XVII əsr ədəbi dilinin bütün cəhətlərini əhatə etmək üçün tədqiq olunmamış əsərlərin dilini də öyrənmək vacibdir.

M.Əmani "Divan"ının morfoloji cəhətdən dil xüsusiyyətlərini öyrənməyi qarşımıza məqsəd qoyarkən məhz bu cəhəti nəzərdə tutmuşuq.

M.Əmani əsərlərinin morfoloji xüsusiyyətlərinə həsr olunmuş həmin dissertasiya işi iki fəsildən ibarətdir. Birinci fəsil adların, ikinci fəsil isə feilin tədqiqinə həsr edilmişdir.

Məlumdur ki, dilin müxtəlif inkişaf mərhələlərində qrammatik kateqoriyalar əsasən sabit olmuşdur. Lakin dilimizin inkişafı prosesində bəzi qrammatik formalarda sinonim vəziyyətlər, semantik rəngarənglik, əvəzlənmə, müasir dil baxımından arxaikləşmiş şəkilçilər və s. müşahidə edilir. Dissertasiyada həmin qrammatik formaların əsrlərdən bəri sabitliyini və dəyişməzliyini konkret bir dövrün abidəsi əsasında təhlil etmək üçün ayrı-ayrı bəhslərdə qrammatik kateqoriyaların şərhi verilmiş, müasir dil baxımından fərqli cəhətlər üzə çıxarılmış və onların səbəbləri aydınlaşdırılmışdır. Bunlarla yanaşı, dissertasiyada M.Əmaninin əsərlərində işlənmiş qıpçaq, qarluq və başqa qrupa daxil olan türk dillərinə aid ünsürləri qədim və müasir türk dilləri ilə müqayisədə izah olunmuşdur.

**Ədəbiyyat:**

1. Azərbaycan tarixi, I hissə, Bakı, 1961, səh. 304-305.
2. B.Abizadə - Azəroğlu. Məhəmməd Əmaninin həyat və yaradıcılığı (namizədlik dissertasiyası). Bakı, 1966.
3. H.Araslı. Məhəmməd Əmaninin yaradıcılığı, "Azərbaycan məcmuəsi", № 2.
4. H.Araslı. Göstərilən əsər, səh.66.
5. İsmayıl Hikmət. Azərbaycan ədəbiyyatı tarixi. Rəf, inventar № 1928, səh. 176-182.
6. Məhəmməd Əmani, Divan. Rəf, inventar № 3773.
7. Sadiq bəy Əfşar. Məcmə-ül-Xəvas. Rəf, inventar № 9277.
8. S.Q.Əlizadə. "Şühədanamə"də adlar /isim, sifət, say, əvəzlik/, namizədlik dissertasiyası. Bakı, 1965, səh. 26.
9. S.Q.Əlizadə. "Şühədanamə"də adlar /nam.diss/, Bakı, 1965; N.Namazov. M.Füzulinin "Leyli və Məcnun" poemasında feil. /nam.diss./, Bakı, 1965; Ə.Ş.Sadıqov. Azərbaycan dilinin XVI əsr yazılı abidəsi "Şeyx Səfi" təzkirəsinin dili /leksika/, /nam.diss./, Bakı, 1972; Z.Q.Qurbanov. XVII əsr Azərbaycan ədəbi dilinin leksikası /nam.diss./, Bakı, 1972.
10. Şarl Rio. Rəf inventar № 23928, səh. 301-302.

**The role of M. Amani in the development of Azerbaijani literature and the Azerbaijani literary language in the Middle Ages**

**Summary**

One of Azerbaijan poets who lived at the end of XVI and at the beginning of XVII century, who wrote the most of his works in Azerbaijan, was Mohammad Amani.

M.Amani played great role in development of Azerbaijan literature, as the follower of Fizuli`s school. His creative work reached us in two languages: Azerbaijan and Persian.

Mohammad Amani is author of the perfect "Divan"in Azerbaijan and Persian. Taking benefits from classic Azerbaijan literature, he used folk poetry and alive colloquial in his works, enriched classic poetry in this way.

The poet`s greatest contribution to the history of Azerbaijan poetry was his addition of story janre and different kinds of poems.

Amani played an important vole in development of Azerbaijan literature language as prominent representative of Azerbaijan classic literature, M.Amani was devoted a number of articles and scientific investigation. But language features of his poems were firsly in vestigated (M.Amani "Divan"`s language).

**Роль М. Амани в развитии азербайджанской литературы и азербайджанского литературного языка в средние века**

**Резюме**

Одним из поэтов Азербайджана, живший и творивший в конце XVI-го и начале XVII-го века и большую часть, своих произведений написавшим на Азербайджанском языке, был Мухаммед Амани.

В развитии азербайджанской литературы роль Амани, как продолжателя школы Физули, очень велика. Мухаммед Амани – автор «Дивана», написанного на этих языках. Он обогатил язык классической поэзии, используя в своих произведениях лучшие черты классическом Азербайджанской литературы, многие выражения из народных стихов и живого разговорного языка.

Самая большая заслуга поэта в истории азербайджанской литературы заключается в том, что он внес в литературы жанр стихотворного рассказа и создал стихи в его разных формах.

Творчество М.Амани сыграло большую роль, в развитии азербайджанского литературного языка. Как выдающийся представитель Азербайджанской литературы, Амани в своём художественном творчестве написал целый ряд статей и провёл большую исследовательскую работу.

Но впервые особенности его стихотворного языка (язык «Дивана» Амани) стали объектом исследования автора статьи и его же монографии.

**Rəyçi: dos. Z.Məmmədova**

DOI: 10.36719/AEM/2007-2019/49/16-19
**Zərifə İsmayıl qızı Avilova**
**Zərifə Bayram qızı Məmmədova**
Azərbaycan Tibb Universiteti

# AZƏRBAYCAN ƏDƏBİ DİLİNİN İNKİŞAFI TARİXİNDƏ İMADƏDDİN NƏSİMİNİN TUTDUĞU MÖVQE

***Açar sözlər:*** *İmadəddin Nəsimi, poeziya tarixi, ədəbi dil, sufilik*
***Key words****: Imadaddin Nasimi, Poetry History, Literary Language, Sufism*
***Ключевые слова:*** *Имададдин Насими, история поэзии, литературный язык, суфизм*

Orta dövr Azərbaycan ədəbiyyatının ən qüvvətli nümayəndələrindən biri də İmadəddin Nəsimidir. Onun əsl adı Seyid Əlidir, Nəsimi təxəllüsüdür. Yaradıcılığının əvvəllərində isə o, “Hüseyni” və “Seyyid” təxəllüsləri ilə də şeirlər yazmışdır. Azərbaycan ədəbiyyatı tarixində Nəsimi “Şirvani” nisbəsi ilə də tanınır. O, 1369-cu ildə Şamaxı şəhərində anadan olmuşdur. İlk təhsilini Şamaxıda almış, dövrün bütün elmlərini – dinlərin tarixini, məntiq, tarix, ədəbiyyat, astronomiyanı öyrənmiş, Yaxın və Orta Şərq poeziyasına yaxından bələd olmuşdur.

Hələ gənc yaşlarında Nəsimi X əsrdə Bağdadda dara çəkilmiş Həllac Mənsur Hüseyninin sufi görüşlərini təbliğ etmiş və ilk şeirlərini “Hüseyni” təxəllüsü ilə yazmışdır.

XIV cü əsrin sonlarında Azərbaycanda da geniş yayılmış hürufi təşkilatları ilə əlaqə saxlamışdır. 1386-cı ildə Nəsimi hürufiliyin banisi olan Fəzlullah Nəimi ilə görüşüb onun ideyalarını bəyənmiş və ömrünün sonuna qədər öz şeirləri ilə bu ideyaları müxtəlif xalqlar arasında təbliğ etmişdir. Bu vaxtdan etibarən Nəiminin təxəllüsünə oxşayan Nəsimi təxəllüsünü qəbul etmişdir.

1394-cü ildə Nəimi edam edildikdən sonra onun vəsiyyətnaməsinə əsasən Nəsimi əvvəlcə Təbrizə getmiş, sonra bir müddət Anadoluda yaşamışdır. O, bu ölkələrdə də daima hürufilik ideyalarını yaymaqla məşğul olduğu üçün dəfələrlə zindana salınmışdır.

Azərbaycan dilinin inkişafı tarixində İmadəddin Nəsiminin tutduğu mövqe xüsusilə böyükdür. Klassik Azərbaycan ədəbiyyatında xüsusi bir dövr açmış Nəsiminin dili yaranmaqda olan orta əsr türk ədəbi dilinin sonrakı inkişafına da güclü təsir göstərmişdir.

Nəsiminin hürufi şeirləri nəinki Azərbaycan şeir dilini, o cümlədən Anadolu təkkə şeirini və bektaşilik kimi məşhur təriqətin formalaşmasına güclü təsir göstərmişdir. Nəsiminin əsas xidmətlərindən biri “Türkçülük” və “Türk dilçiliyi” sahəsində olmuşdur. Bu sahədə də onun xidmətləri misilsizdir. Nəsimi zəmanəsinin ən böyük şairi və türk ədəbiyyatının əzəmətli şəxsiyyəti olmuş, ərəb, fars dillərini mükəmməl bilmiş, türkcə və farsca şeir “Divan”ı yaratmışdır. Yaşadığı zamanda ən qüvvətli siyasi şəxsiyyət olub. O, öz ana dilinə və mənsub olduğu millətinə də ürəkdən bağlı olmuşdur.

Nəsiminin dövründə farsca şeir yazmaq bir ənənə rəmzi olsa da, o, türk dilinə şeirlər yazmaqla öz ana dilinin üstünlüklərini əyani şəkildə sübut etmişdir. Çox qısa bir zamanda Türkiyədə və İranda o qədər məhşurlaşmışdır ki, türkiyəli və azərbaycanlı şairlər onun şeirlərinə nəzirələr yazmış, onun soyadını təxəllüs kimi qəbul edənlər də olmuşdur. Kul Nəsimi kimi.

Türk aləmində yaranmış qədim əbədi bədii təfəkkürlə bilavasitə əlaqədə inkişaf edən Nəsimi yaradıcılığının qüdrəti onun şeir dilində öz əksini tapmış, tarixin ən dərin köklərindən qidalanaraq, söz sənətinin yaranmasına nail olmuşdur. Nəsimi şeirlərində, bədii üslubda, fəlsəfi təfəkkürdə bir ənənə yaratdığı kimi dildə də ənənə yaradaraq özündən sonra gələn bütün sənətkarlara təsir göstərmişdir.

Nəsiminin bədii sənətkarlığı hər zaman üçün mübariz ruhlu üsyankar şeirləri, fəlsəfi və ictimai məzmunlu əsərləri yeni istiqamətdə yaranan klassik Azərbaycan şeirinə ruh vermiş, onu daha da canlandırmışdır. Bu istedadlı sənətkarın çoxcəhətli və rəngarəng yaradıcılığı bir tərəfdən Azərbaycanda ictimai fikrin inkişafı tarixinin istiqamətlənməsinə xidmət etmiş, digər tərəfədən isə Azərbaycan dilini yeni zirvələrə yüksəltmişdir. Bununla da Nəsimi Azərbaycan dilini - (türk dilini) fəlsəfi təfəkkürün ən incə nöqtələrini ifadə etməyə qadir olduğunu sübuta yetirmişdir.

Azərbaycan ədəbiyyatı tarixində yeni bir mərhələnin əsasını qoyan Nəsimi şeiriyyəti türk dillərində yaranan qədim və orta əsr ədəbi abidələrinin ənənəsini davam etdirmiş və klassik Azərbaycan bədii dilinin təməlini qoymuşdur.

Azərbaycan ictimai türk tarixində görkəmli yer tutan, onun inkişafında böyük rol oynayan Nəsimi öz əsərlərində işlətdiyi sözlərlə dilin zənginliyinin əsas meyarı olan fikir zənginliyinə xüsusi diqqət yetirmişdir.

O, öz şeirlərində sadə sözlə böyük bir ideyanı tərənnüm etmişdir, sözlər vasitəsilə fikir incəliyini, məzmun dərinliyini göstərə bilmişdir.

Unutmaq olmaz ki, Nəsiminin dili (leksikası) **Azərbaycan ədəbi dilinin**, xüsusilə onun bədii qolunun keçmiş olduğu altı əsrlik tarixi izləmək üçün zəngin material verir.

Azərbaycan dilinin formalaşıb ədəbi normalar əldə etdiyi bir dövrdə yaşayıb-yaradan Nəsimi, şübhəsiz ki, **ədəbi dilimizin xüsusiyyətlərini** öz əsərlərində əks etdirmiş, onun sabitləşməsinə və inkişafına ciddi təsir göstərmişdir.

Nəsimi əsərlərində işlətdiyi yüzlərlə xalq ifadələri, birləşmələr və məsəllər bir daha sübut edir ki, onun dili xalq ifadə vasitələrinə əsaslanaraq yaranan ədəbi dil normaları ilə əlaqədardır və onun bilavasitə təzahürüdür. Bu gün belə müasir dilimizdə işlənən atalar sözləri və məsəllər Nəsimi dilinə xas xüsusiyyətlərdəndir.

Nəsimi öz əsərlərində işlətdiyi xalq ifadələrini sənət süzgəcindən keçirərək onların təravətini saxlamış, milli koloritini mühafizə edərək daha da canlandırmışdır. Xalq yaradıcılığı incilərini ədəbi–bədii dil normaları çərçivəsində işlədən şair onların ifadə ertdiyi geniş, dərin və incə mənalara xüsusi diqqət yetirmişdir. Əsasən nəsihət xarakterli əsərlərində, qəzəl, rübai, məsnəvi və qəzəllərində işlətdiyi məsəllər, atalar sözləri Nəsiminin ibrətamiz fikirlərini daha obrazlı ifadə edir.

Nəsimi "Divan"ından verilmiş aşağıdakı misralara və beytlərə nəzər salaq:

Heç bir gün olmaz gecəsiz, heç bəhər qəmsiz olmaz,
Şöylə yanar cigərimdə, ey sənəm, eşqin odi
Kim, yandurur şöləsindən həm quru, həm yaşlar
Doğru söz doğrulara acı dəgül.

Hər qanda şam olursa, ardınca sübhdəmdür.
Bu səltənəti imarətə eşq ilə təkyələnmə kim,
Beş gen imiş bu dünyənün səltənətü imarəti.
Sənsüz cahanü can çün əşbah imiş məsəldə.
Cansuz bədən dirilməz, gör kim, bu nə məsəldür.
Çün hər nə kim, əkərsən, ani biçərsən, axir.
Ey Nəsimi, sən fələkün gərdişindən qəm yemə,
Şadiliq ənduh ilən var, həm qızılgül xar ilən.
Naqis vücudə hər dəm nöqsan gəlür həmişə
Cəhd eylə kamil ol kim, gəlməz kəmalə nöqsan.
Qoy keç bu dünyanın varın, bu murdardan yuyun, arın,
Nagah bir gün əcəl yeli urur ömrün çırağına.
Söz ilə cahilin dili alim önündə bal ola,
Mərifəti nə söyləyə, olmayan əhli-mərifət.

Bu növ məsəllərlə bərabər, Nəsiminin fədakarlığı, şəxsi mətinliyi və mübariz ruhu ilə əlaqədar ifadələr şairin öz əsərlərindən xalq dilinə keçmiş, hikmətli sözlər kimi dillər əzbəri olmuşdur. Şairin:

Məndə sığar iki cahan, mən bu cahanə sığmazam,

– misrası və sonralar:

Zahidin bir barmağın kəssən, dönüb həqdən qaçar,
Gör bu miskin aşiqi sərpa soyarlar, ağrımaz.

– beyti daha səciyyəvidir.

Xalq saf və büllur çeşməsindən həyat suyu içən Nəsimi onu yetişdirən, tərbiyələndirib boya-başa çatdıran, xalqına xidmət etməyi özü üçün ən yüksək vəzifə hesab etmişdir. O, ana dilində yazdığı əsərləri ilə xalqına olan məhəbbət və sədaqətini bir daha sübuta yetirmişdir. Nəsimi ərəb və fars dillərinin klassik şeir üslubunun hakim kəsildiyi bir dövrdə xalq yaradıcılığından qidalanaraq öz əsərlərini doğma Azərbaycan dilində yazmış, bu dilin imkanlarını aşkara çıxarmışdır. Məhz buna görə də heç təsadüf deyildir ki, Nəsimi əsərlərinin əsasını, onun təməlini məhz Azərbaycan sözləri və ifadəlri təşkil edir. Bunu Nəsiminin Azərbaycan dilində olan "Divan"ına daxil olan şeirləri də təsdiq edir.

Bədii dilin **sadəliyi**, **aydınlığı** və **xəlqiliyi** etibarilə də Nəsiminin lirikası sələflərindən və xələflərindən fərqlənir. O, öz şeirləri ilə Azərbaycan dilinin zənginliyini, sadəliyini, aydın, zərif, musiqili bir dil olduğunu, eyni zamanda geniş poetik imkanlara malik olduğunu nümayiş etditmişdir.

Nəsimi öz ideyalarını, hürufi fikirlərini xalqa çatdırmaq üçün sadə, aydın bir dildə yazmağa üstünlük vermişdir. Bununla da Nəsimi klassik poeziyanı xalqa daha da yaxınlaşdırmışdır. Onun (XIV-XV əsrdə) elə şeirləri vardır ki, həmin şeirlərin dilinin sadəliyi, aydınlığı baxımından XVIII əsrdə yazılmış şeir nümunələri

ilə müqayisə etmək mümkündür. Məlum olduğu kimi, XVIII əsr xalq dilinin poeziyada hakim mövqeyə çatdığı bir dövr idi.

Bununla da belə bir nəticəyə gəlmək olur ki, Nəsiminin şeirləri Azərbaycan ədəbiyyatında farsdilli poeziya ilə Molla Pənah Vaqif lirikası arasında möhkəm bir körpüdür. Nəsiminin qəzəlləri dilinin sadəliyinə görə hətta XX – XXI əsrlərin şeir nümunələrinə bənzəyir.:

Cananı mənim sevdiyimi can bilir ancaq,
Könlüm diləyin dünyada canan bilir ancaq.
... Könlüm gəmisin qərq edə gör eşq dənizinə
Kim, bu dənizin bəhrini ümman bilir ancaq.
Heç kimsə Nəsimi sözünü kəşf edə bilməz,
Bu, quş dilidir, bunu Süleyman bilir ancaq.

Şairin bu qəbildən olan qəzəllərinə məqtə beytindəki müəllifin adının yerinə XX əsrdə yaşayıb-yaşayan şairlərimizdən hər hansı birinin adı yazılsa, dilin sadəliyi, aydınlığı və saflığı baxımından heç kim buna şübhə ilə yanaşmaz.

Nəsimi özündən bir əsr əvvəl ilk dəfə ana dilində - Azərbaycan dilində şeir yazmış, cəmi üç-dörd qəzəli bizə gəlib çatmış İzəddin Həsənoğlunun başladığı o şərəfli işi – anadilli şeir yaratmaq üçün cəsarətlə davam etdirmiş, bununla da ən sərfəli bir missiyanın həyata keçirilməsinə nail olmuşdur.

**Ədəbiyyat:**

1.İmadəddin Nəsimi. Seçilmiş sərləri. 2 cilddə, II c. Bakı, Lider, 2004.
2. Azərbaycan klassik ədəbiyyatı kitabxanası. İmadəddin Nəsimi, V cild, Bakı, Elm, 1985.
3. Həmid Araslı. İmadəddin Nəsiminin həyat və yaradıcılığı. Bakı, Azərnəşr, 1972.
4. Həmid Araslı. Fədakar şair – İmadəddin Nəsimi. Bakı, 1942.
5. Böyük Azərbaycan şairi İmadəddin Nəsimi. Azərbaycan Milli Elmlər Akademiyası. Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutu. Bakı – "Elm" – 2019.

**The position of Imadaddin Nasimi in history of Azerbaijan's literal language**

**Summary**

Nasimi lived during the period when the Azerbaijan language had been developing. Imameddin Nasimi influenced the developing of the Azerbaijan language. He described all these development in his works.

Nasimi was born 1369 in Shamakhi, he got his primary and secondary education in his native town. He studied at all times, the was a acquained the poetry Near and Midde East.

At the end XIV century he had connectious with some societies.

He had unbonded assistand in the development of the language. He had some influences to the improvement of classical Azerbaijan literature. He enriched the language his own language.

He practiced there words in his poems. It is unforgettable that Nasimi language tode his best place in the literature. Today we use his sayings in own language.

Nasimi`s expressions are famous our nowadays speech. National creativity are improved according to his sources of literature. The great poet described his moral admonitions in his rubai. In this article are told about Nasimi`s role in the development of Azerbaijan literary language. At the same time some sample are given from his poem of "Divan".

**Позиция Имадеддина Насими в истории развития азербайджанского литературного языка**

**Резюме**

Насими жил и творил в период формирования азербайджанского языка и его языковых норм. Поэт в своих произведениях отразил особенности литературного языка, оказал серьёзное влияние на его развитие.

Насими родился в 1369-ом году в Шемахе, начальное образование получил на родине. Насими изучил все науки своего времени, был хорошо знаком с поэзией среднего и Дальнего Востока.

Он поддерживал связи с широко распространённой в конце XIV века хуруфистскими организациями. Позиция Насими в истории развития азербайджанского языка особенно велика. Язык Насими, открывший особую эпоху в классической азербайджанской литературе, оказан сильное влияние на последующее развитие зарождающегося тюркского литературного языка средних веков. Насими, сыгравший большую роль в развитии истории Азербайджана, особое внимание уделял в своих произ-

ведениях богатству используемых слов. Он в своих стихах выражал простыми словами высокие идеи, с помощью слов он смог показать тонкость мысли, глубину содержания.

Нельзя забывать, что язык Насими даёт ценный материал для изучения азербайджанского литературного языка, его истории на протяжении шести веков. Используемые в произведениях Насими сотни народных выражений, сочетаний ещё раз доказывают, что его язык является олицетворением литературных норм. Пословицы и поговорки, употребляемые в современном языке, характерны для языка Насими.

Насими, используя народные выражения, сохраняя их особенности и национальный колорит, придал им ещё большую живость. Поэт придавал большое внимание широкому, глубокому и тонкому значению слов, используемых в рамках литературного языка. Пословицы и поговорки, произведения назидательного характера, рубаи, газели придают мыслям Насими большую образность.

В этой статье рассматриваются заслуги Насими в развитии азербайджанского литературного языка в то же время здесь представлены стихотворные отрывки из «Диван»а.

**Rəyçi: dos.X.Məhərrmova**

DOI: 10.36719/AEM/2007-2019/49/20-22
**Тюркан Сурхай гызы Ибадова**
Баку, Азербайджан

# БИЛИНГВИЗМ И МУЛЬТИЛИНГВИЗМ: СХОДСТВА И РАЗЛИЧИЯ

***Ключевые слова:*** *коммуникация, мультилингвизм, билингвизм, монолингвизм, глобализация, социокультура*
***Açar sözlər:*** *əlaqə, multilinqvizm, bilinqvizm, monolinqvizm, qlobalizasiya, ictimai mədəniyyət*
***Key words:*** *communication, multilingualism, bilingualism, monolingualism, globalization, social culture*

***«Сколько языков ты знаешь – столько раз ты человек»***
**А.П.Чехов**

Язык – это главное средство коммуникации. Он необходим для передачи информации. Владеющий информацией, владеет всем! В настоящее время это особенно актуально. Кто владеет иностранными языками, конечно же, владеет и большей информацией. Изучая иностранный язык, мы начинаем лучше понимать как самих, так и окружающих. Ощущая прилив положительных эмоций, мы развиваемся. Только с изучением другого языка мы начинаем обращать внимание на родной.

Но жизнь, конечно же, не состоит только из образования и работы. Мы тратим свое время и на другие дела: отдых, путешествие и т.д. Иностранный язык не обходит и эти сферы человеческой деятельности. Даже минимальное знание иностранного языка помогает нам «хорошо чувствовать себя» в чужой стране: купить еду, добраться до нужного места, заказать билеты и т.д.

Изучая определенные языки мы становимся *билингвами или мультилингвами*.

*Мультилингвизм* (полилингвизм, многоязычие) – употребление нескольких (более двух) языков в пределах определенной социальной общности (прежде всего государства) (1,39). Актуальность мультилингвизма как социокультурного феномена состоит в том, что оперирование несколькими языками является необходимым условием успешной жизнедеятельности человека и общностей в эпоху глобализации, так как глобализация предполагает в качестве своего элемента взаимопроникновение материальных и духовных компонентов различных социальных культур. Поэтому важнейшим условием освоения чужой культуры является овладение различными ее формами, и, прежде всего, языками. Знание одного иностранного языка уже способно открыть двери во многие, ранее недоступные миры. Феномен мультилингвизма – феномен века. Он присущ всем регионам мира в разной форме и в разных отношениях. Овладение языками, которые являются средствами общения и информационного обмена с народами других стран, приобретает все большее значение. Языки межнационального общения выполняют интернациональную миссию, духовно и нравственно сближая людей разных национальностей. В современном мире, стремящемся найти пути достижения "глобального гуманизма", который создает возможность установления гуманистического общества с различными национальными моделями, по крайней мере, странным представляется нежелание замечать роль мультилингвизма в становлении социальной гетерогенности и оценивать его как позитивный фактор межкультурного взаимодействия. Мультилингвизм как социокультурный феномен выдвигает перед образованием сложные задачи подготовки молодежи к жизни в условиях многонациональной и поликультурной среды, формирования умений общения и сотрудничества с людьми разных национальностей, рас, конфессий. Интеграция мирового сообщества, развитие планетарного мировоззрения предполагают учет национальных традиций в образовании учащейся молодежи; создание условий для формирования культурной идентичности детей.

Частным случаем проявления мультилингвизма является *билингвизм,* т.е. (от лат. bis - дважды и lingua - язык), двуязычие, владение двумя языками. По возрасту, в котором происходит усвоение второго языка, *различают билингвизм ранний и поздний.* Различают также *билингвизм рецептивный (воспринимающий), репродуктивный (воспроизводящий) и продуктивный (производящий),* последний из которых является целью изучения иностранного языка.

Более полное определение представлено термину *билингвизм* Швейцером и Никольским: "*Билингвизм* – это сосуществование двух языков в рамках одного языкового (речевого) коллектива, использующего эти языки в различных коммуникативных сферах, в зависимости от социальной ситуации и других параметров коммуникативного акта" (2,19)

Билингвизм, как процесс овладения вторым языком и второй культурой является своеобразной доминантой процесса постепенной адаптации к лидирующей культуре, причем без обязательного отказа от собственной языковой идентичности. Два языка обычно формировываются у человека не в одинаковой степени, поскольку не бывает двух совершенно одинаковых социальных сфер действия языков и представленных ими культур. Поэтому в определении билингвизма невозможно столкнуться с требованием абсолютного свободного владения обоими языками. В случае если один язык не мешает второму, а второй развит в высшей степени, близкой к владению языком у носителя языка, то говорят о сбалансированном билингвизме.

Долгие годы *билингвизм* воспринимался обществом неположительно. Ученые и многие родители были уверены в том, что два потока информации, перепутают ребенка, тормозя его когнитивное развитие. И только в 1962 году, после исследований канадских психологов Элизабет Пил и Уоллеса Ламбера, появились убедительные доказательства того, что билингвизм не ограничивает развитие умственных способностей.

Именно последние эксперименты лингвистических центров показали, что дети, растущие в двуязычной среде, опережают своих сверстников при выполнении заданий, где тестируется внимание. Например, при регистрации движения глаз выяснилось, что билингвы намного быстрее меняют направление своего взгляда в зависимости от визуального или слухового воздействия.

В психологии есть термин «theory of mind», который на русский язык переводится как «теория намерений» или «понимание чужого сознания». Это означает, что человек может жить с другими людьми, только если он способен хотя бы в общих чертах понимать, что они чувствуют и о чем думают (6,3).

Агнес Ковач, нейропсихолог из института СИССА (Италия), исследовала около 30 румыно-венгерских билингвов и 32 монолингвов в возрасте около трех лет. Она разыгрывала перед детьми историю о том, как две куклы-марионетки, одна из которых «понимала» только один язык, а вторая – два, решили купить мороженое.

Пока персонажи шли к лотку, продавец выкрикивал на «неизвестном» для одной из кукол языке, что мороженое у него закончилось, а вот у торговца сэндвичами оно еще осталось. Ковач переводила эту фразу для детей- монолингвов, а затем задавала вопрос всем: «Куда эта кукла (“монолингв”) пойдет покупать мороженое?». Детям-билингвам было легче сообразить, что эта кукла не поняла того, что сказал продавец мороженого, и пойдет за мороженым к нему. Благодаря ежедневным упражнениям в переключении с языка на язык они получили достаточный опыт понимания чужого сознания и натренировали контроль торможения. Много еще неизвестного в вопросе о различиях во врожденной способности к изучению иностранного языка и о ее связи с владением родным языком. Каждый учитель иностранного языка знает, что одни ученики гораздо более успешно изучают иностранные языки, чем другие, но вот попытки предсказывать подобные успехи на основании тестов - исключая, разумеется, наблюдение за самим процессом обучения - пока что находятся в самой начальной стадии (4,130). Часто выдвигаемое утверждение, что раннее двуязычие повышает способность к изучению иностранных языков, также все еще ждет научной проверки. Неясно также, связана ли способность к переключению с языка на язык по мере надобности – или противоположная ей склонность к чрезмерному переключению – с некоторой врожденной предрасположенностью или это исключительно результат тренировки. Выдвинутое рядом невропатологов предположение, что есть особый участок мозга, ведающий переключением языков, по-разному развивающийся у здоровых людей и подверженный расстройствам при повреждениях мозга, пока что следует рассматривать с изрядной дозой скептицизма.

Возможности языка безграничны. Так, общий язык поддерживает сплоченность общества. Он помогает людям координировать свои действия благодаря убеждению или осуждению друг друга. Кроме того, между людьми, говорящими на одном языке, почти автоматически возникают взаимопонимание и сочувствие. В языке находят отражение общие знания людей о традициях, сложившихся в обществе, и текущих событиях.

**Литература:**

1. Культура русской речи : учебник для вузов (под ред. Л. К. Граудиной, Е. Н. Ширяевой). Москва: НОРМА, ИНФРА-М, 1999, 560 с.
2. Швейцер А. Д. Введение в социолингвистику. Москва: Высшая школа, 1978, 103 с.
3. Фергюсон Ч. А. Проблемы влияния языковой ситуации на обучение второму языку /Ч. А. Фергюсон // Новое в зарубежной лингвистике. Вып. XXV: Контрастивная лингвистика: переводы. Москва: Прогресс, 1989, с. 122–127.
4. Жинкин Н.И. Речь как проводник информации. Москва, 1982, 159 с.
5. Цейтлин С.Н. Язык и ребенок. Лингвистика детской речи. Москва: 2000, 240 с.
6. Верещагина Е.М. Феномен (лого)эпистемы в свете лингвофилософских воззрений И.А.Бодуэна де Куртенэ. с. 3-4.
7. Ушинский К.Д. Родное слово. Москва, 1998, 236 с.

**Multilinqvizm və bilinqvizm: oxşar və fərqli cəhətlər**

**Xülasə**

Məqalədə müasir dövrdə çoxdilliyin həyatımızda olan önəmindən nəzəri və praktiki hissələrdə araşdırma aparılaraq bəhs edilib, multilinqvizm və bilinqvizmin oxşar və fərqli cəhətləri açıqlanıb. Multilinqvizm fenomeni əsrin fenomenidir. Bildirilib ki, bilinqvizm multilinqvizmin tərkib hissəsidir. Baxmayaraq ki, uzun illər bilinqvizm müsbət qarşılanmırdı, son illərdə aparılan araşdırmalar sübut etmişdir ki, iki dildə eyni və ya az fərqlə eyni danışan insanların beyni, mənimsəmə qabiliyyəti daha yüksək inkişaf edir.

**Multilingualism and bilingualism: similarities and differences**

**Resume**

In this article differences and similarities between multilingualism and bilingualism were tried to be explained. The phenomena of multilingualism is the phenomena of the century. However, bilingualism wasn’t accepted positively, but the recent studies have proved that people who speak in two languages at the same level have higher acquisition skills compared to the people who speaks two languages with a slight difference in their levels.

**Рецензент: доц. М.Д.Гулиева**

DOI: 10.36719/AEM/2007-2019/49/23-26
**Zərifə Bayram qızı Məmmədova**
**Zərifə İsmayıl qızı Avilova**
Azərbaycan Tibb Universiteti

# SEMANTİK ÜSULLA YARANAN İNFORMATİKA TERMİNLƏRİ

***Açar sözlər:*** *dil, terminləşmə, semantikada dəyişmələr, tədqiqat, dəqiqləşdirmə*
***Key words:*** *language, terminology, changes in semantic, research, refinement*
***Ключевые слова:*** *язык, терминология, семантические изменения, исследование, уточнение*

Dilin lüğət tərkibində mövcud olan sözlər hazır şəkildə müəyyən zərurət nəticəsində terminləşməyə məruz qalır. Söz terminə çevrilir, bu zaman eyni qəlib semantikasında dəyişmələr baş verir. Beləliklə, leksik vahidlərin terminə çevrilməsi məna dəyişikliyi və dəqiqləşdirmə funksiyası ilə xarakterizə olunur.

Tədqiqat göstərir ki, Azərbaycan dilində informatika terminlərinin semantik üsulla yaradılmasının əsas istiqamətlərindən biri dildə olan sözlərin terminləşməsidir. Bu prosesi iki yerə ayırmaq olar:

1) dilin öz sözlərinin terminləşməsi;

2) alınma sözlərin terminləşməsi.

Azərbaycan dilində sözlərin terminləşməsi prosesinin baş verməsi üçün daxili imkanlar çox genişdir. Dilimizin lüğət tərkibində sözlərin ümumişlək olanları, məişətin bəzi sahələrində işlənənləri, dialektizmlər, o cümlədən peşə-sənət sözləri və s. terminləşməyə yol açan vasitələrdəndir.

Terminləşmə sözlərin semantik inkişafı ilə tənzimlənir. Özbək dilçisi R.Daniyarovun fikrincə, sözün semantik inkişafı yeni söz və terminlərin meydana çıxmasını qaydaya salır [16, s. 12]. «İnsanın ictimai və siyasi fəallığının yüksəldiyi, hər sahədə yeniləşmələr baş verdiyi bir dövrdə meydana çıxan yeni anlayışların bir qismi dildə əvvəldən mövcud olan sözlərlə ifadə edilmişdir. Beləliklə, dilin lüğət tərkibindəki bir çox sözlərin semantikasında dəyişmələr baş vermiş, onların əsas lüğət fondunda işlənmə intensivliyi xeyli artmışdır. Yeni mənaların yaranması cəmiyyətdə baş verən sosial, iqtisadi, mədəni inkişafla, habelə elmi-texniki tərəqqi ilə bilavasitə bağlıdır [15, s. 179].

S.A.Sadıqova yazır: “Bu məna dəyişmələri əslində sözün, terminin mənaca inkişafına səbəb olur. Bu və ya digər terminlərin mənasının dəyişdirilməsi isə onun məna çalarlarından birinə əsaslanır [13, s. 71].

Tədqiqat göstərir ki, Azərbaycan dilində informatika terminlərinin bir çoxu dilimizin öz sözləri əsasında semantik qanunauyğunluğa əsaslanmaqla yaradılmışdır. Azərbaycan dilinin ümumişlək sözləri və bir çox sahələrdə işlənən leksik-terminoloji vahidlər yenidən məna yükünü dəyişərək informatika anlayışlarını ifadə etməyə başlamışdır. Konkret nümunələrə keçək: “başlıq” termini. Bu, həm ümumişlək sözdür, həm də dialekt sözü. “Başdıx” şəklində Biləsuvar, Borçalı, Gədəbəy, Şamxor, Tovuz bölgələrində istifadə olunan bu söz - “*başlıq*”, toy ərəfəsində qız evinin oğlan evindən aldığı, pul, heyvan və s. mənaları ifadə edir.

“Başdığa nə gətirmişdilər göstərdilər” (Gədəbəy); “Başdığı oğlan verir qız sahibinə (Biləsuvar) və s. [2, s. 36]; “Başlıq” (Şamaxı) – heyvanın başına bağlanan ip [2, s. 37].

“Başlıq” sözü məişətdə qadın yaylığı mənasında. “Başlıq” sözü həm ümumişlək, həm məişət, həm də dialekt sözlərinin müxtəlif istiqamətlərdə terminə çevrilməsi prosesində həm texniki, həm də informatika terminləri kimi də formalaşmışdır.

Başlıq. 1.- Yağmurdan, soyuqdan, rüzgardan qorunmaq üçün başa geyilən papaq; 2.- Qədimdən qadınların başörtüsü altından taxılan altun və ya gümüşdən düzəldilmiş takı, süs əşyası. 3.- Özəl termin. Məqalənin adı, başlığı, qəzet və jurnallarda yazının hər bölümü başına qoyulan qısa yazı.

Başlıq etnoqrafiyada: Bəzi bölgələrdə ərə gedən qızın atasına oğlan tərəfindən verilən pul, mal və s. [14].

Başlıq termininin informatikada iki mənasından istifadə olunur: 1. Sənədin (başlanğıc) sərlövhə hissəsi. 2. Verilənlərin ötürülməsi sistemlərində - ötürülən məlumatda xüsusi idarəedici simvoldan sonra yerləşdirilən (qeyd edilən) və ünvan funksiyasını yerinə yetirən simvolların ardıcıl sırası [12, 21].

Deməli, “başlıq” termini informatikada tamam yeni bir məna ifadə etmişdir. Məna xüsusiləşmiş, həmin elmin anlayışını ifadə etmiş, sözün məişət mənası arxa plana keçmişdir. Hər iki mənanın aşağıdakı sxemdə göstəricisi:




Məişət mənasında "başlıq sözdür, hələ terminləşə bilməyib. Onun semantikasında dialekt elementi də mümkündür.

Terminoloji mənasında "başlıq" terminoloji vahiddir, semantik cəhətdən dəyişərək, əlavə məna qazanmış, daha doğrusu məna xüsusiləşmişdir.

"Bağlama" termini. "Azerbaycan türkçesi sözlügündə" bu sözün dörd mənası göstərilmişdir; 1 - Bağlamaq işi ilə bağlı; 2 - İçərisi dolu və ağzı bağlı kisə, çuval, torba və s. (Bağlanmış şey, boxça); bir yerə toplanaraq və ya üst-üstə bağlanmış şey; 3 - Bir yerə yollanmaq üçün toplanmış, paketlənmiş, bağlanmış şey; 4 - Xalq aşıqları bir-biri ilə deyişdikləri zaman istifadə etdikləri şer, müxəmməs [14, s. 84].

"Bağlama" sözünün dialektoloji mənası; 1) Tovuzda - qapı və pəncərəni arxadan bağlamaq üçün taxta parçası; 2) Kürdəmirdə – balqabaqdan hazırlanan xörək adı, 3) Culfada – yastıq. Milax kəndində yastığa bağlama deyirlər; 4) Qazax və Şəmkirdə qıfılbənd: Sana bir bağlama deyərəm, açammazsan; 5) Hamamlı, Kürdəmir, Qazax və Şəmkirdə içərisində yarıya qədər taxıl olan bağlı çuval. - Bir bağlama dünən üyütdüm (Şəmkir); - Bir bağlama buğdam var, onu at haravıya (Qazax) [4, s. 28].

"Bağlama" informatika termini kimi yuxarıdakılardan fərqli mənada işlədilir. Bu termin verilənlər bazasında məlumatın məzmununun icraetmə kodları ilə əlaqələndirilməsi proseslərini ifadə edir [12, s. 21].

"Cığır" termini. Sözün ümumişlək mənası "Azərbaycan dilinin izahlı lüğəti"ndə, «gediş-gəlişdən əmələ gələn ensiz, dar yol" [4, s. 485] şəklində qeyd olunmuşdur. Digər mənalardan biri terminoloji mənadır. Həmin məna incəsənətlə bağlıdır: yol, istiqamət, cərəyan. İncəsənətdə "yeni cığırlar". Tanıtdı körpələrə; şanlı sabaha gedən; cığırları, izləri (B.Vahabzadə). Cığır açmaq - 1) istiqamət vermək, yol açmaq; 2) yeni istiqamət (cərəyan) yaratmaq. Üçüncü məna poetik mənadır. Bədii əsərlərdə "iz", "xətt" mənasında istifadə olunur: Qız cavan idi. Qara saçlarına ağ cığır, girdə, tər sifətinə qırış düşməmişdi (B.Bayramov). İnformatikada "cigır" termini "hərəkət edən maşın informasiya daşıyıcısının səthinin bir başlıq tərəfindən yazıla və oxuna bilən hissəsidir" [12, s. 176].

"Güc" sözünün ümumişlək mənası; 1) iş görmə iqtidarı (güc almaq, güc etmək); qüvvə mənasında (güc gətirmək, gücdən düşmək); iş görmə qabiliyyəti, enerji; bacarmaq, qabiliyyət, qüdrət, qüvvə; inandırma, təsir gücü, bir şeyin dərəcəsi, maddi yön, varlıq (gücü çatmaq, maddi vəziyyəti yaxşı olmaq); üstünlük; hüquqda gücə, qüvvətə sahib olmaq (gücdən düşmək, gücünü itirmək) və s. [14, s. 585-586].

"Güc" termini fizikada enerji mənasında: enerjinin gücü. "Güc" termini siyasətdə: İki güc mərkəzinin isə Cənubi Qafqazda eyni vaxtda hegemonluq etməsi mümkün deyil [12].

"Güc" termini dilçilikdə: Transpozisiya gücündən müştərək funksiyanın yerinə yetirilməsi üçün istifadə etmək lazım gəlir [1, s. 155].

"Güc" termini informatikada: hesablama sistemində verilmiş əməliyyatlar toplusunun icraetmə qabiliyyətini göstərən xassəsi [12, s. 95].

"Sayğac" sözü bir şeyi hesablamaq üçün xüsusi cihazın, qurğunun adıdır.

"Sayğac" termini semantik daralma nəticəsində informatikanın bir anlayışnın ifadəsinə çevrilmişdir. Terminologiyada semantik daralma prosesində terminə çevrilən söz ilkin mənaların birindən və ya bir neçəsindən uzaqlaşmır, yəni söz özünün istifadə olunma sahələrində bütün mənalarında işlədilə bilər.

İnformatikada "sayğac" termininin mənası belə göstərilir: "Daxil olan giriş siqnallarının miqdarını hesablayan qurğu; sinxron və asinxron tipli sayğaclar vardır" [12, s. 134].

"İnformatika üzrə rusca-ingiliscə-azərbaycanca izahlı lüğət"də "sçetçik (counter) sayğac" termininin iki mənası göstərilir; 1) girişinə daxil olan impulsları saymaq üçün qurğu, 2) proqramlarda i=i+1 şəklində olan operator.

İkinci məna sözün daralması əsasında yaranmışdır. "Sayğac" termini dilimizdə bir sıra terminoloji birləşmələrin yaranmasında da fəaldır: ünvanlar sayğacı, vaxt sayğacı, əmrlər sayğacı, dövr sayğacı və s.

Azərbaycan dilində məna daralması nəticəsində terminləşən vahidlərə "tor" sözünü də misal göstərmək olar. Bu sözün izahlı lüğətdə altı məna növü qeyd olunmuşdur: 1) balıq, quş və sair tutmaq üçün ipdən çarpaz toxunaraq bərabər məsafələrdə düyünlə bərkidilmiş alət; 2) çarpaz toxunmuş ip, məftil və s. ibarət müxtəlif ləvazimat; 3) içinə ərzaq, xırda şey və s. qoyub aparmaq üçün ipdən və sairdən toxunmuş zənbil, çanta, kisə; 4) seyrək toxunmuş köynək, baş yaylığı, pərdə və s.; 5) hörümçəyin ifraz etdiyi yapışqanlı çirədən əmələ gələn çarpaşıq nazik tellər; 6) hiylə, kələk, tədbir, qurğu [4, s. 199].

İzahlardan aydın olur ki, məişət sözü kimi "tor" sözü bir neçə sahə terminologiyası üzrə terminləşmişdir. Həmin sahələr balıqçılıq və botanika ilə bağlıdır. Sonralar texniki elmlərin meydana gəlməsi ilə "tor" sözünün məna imkanları daralmış, həm elektronikada (elektron lampalarında katodla anod arasında yerləşdirilən əlavə elektrod), həm də informatikada (setka (grid) tor) – yaddaş xanasının və registrin ikilik formatı kimi (İİP, 1993, s.165.) istifadə olunmaqdadır.

Qeyd edək ki, transformasiya prosesində Azərbaycan dilinin öz sözləri əsasında "bayraq", "oyuq", "yükləmə", "oxunma", "açma", "boşalma", "yerləşdirmə", "dözümlülük", "yorğunluq", "kövrəklik", "zibil", "ağac", "sazlama", "düymə", "deşik" və s. leksik vahidlər informatika terminlərinə çevrilmişdir.

"Bayraq" sözünün informatika termininə çevrilməsi. Çevrilmə mənanın genişlənməsi əsasındadır. Məhdud dairədən kənara çıxan "bayraq" sözü öz mənasını daha da genişləndirmiş, informatika terminologiyasının zənginləşməsində iştirak etmişdir. Mənanın genişlənməsi desemantikləşmə faktını əks etdirir.

"Bayraq" sözü ümumişlək söz kimi – "üzərində dövlət, təşkilat, yaxud hərbi hissə, birləşmə və gəminin fərqlənmə nişanı olan yazı, rəmz, bəzək nəqş edilən və ağac dəstəyə bərkidilən qumaş parça" [5, s. 544].

"Bayraq" sözünün məna variantları S.Altaylının lüğətində aşağıdakı kimi göstərilmişdir: 1) Bir dövlətin rəmzini daşıyan qara rəngli parça, 2) qaye, ideal (ağ bayrağı qaldırma, təslim olmaq, təslim olduğunu bildirmək, ağ bayraq çəkmək, ….bayrağı altında, …., bayrağını yüksək tutmaq [14, s. 106].

"Bayraq" termini informatikada – birmərtəbəli indikator; müstəqil fəaliyyət göstərən qurğunun yerinə yetirdiyi standart əməliyyatların xüsusiyyətlərini göstərmək üçün proqram vasitəsilə yaradılan və emal edilən əlamət (İİL, 1993, s.193) mənasında istifadə olunur.

"Oyuq" sözünün informatika termininə çevrilməsi. "Oyux» sözü dialektlərdə işlənir. Bu söz Cəbrayıl şivələrində "bağ qaravulçularının özləri üçün düzəltdikləri kölgəlik (koma) (Oyuxdan baxanda bağın hər yeri görünür) mənasında istifadə olunur [3, s. 346].

S.Altaylının lüğətində "oyuq" sözünün bir neçə omonim mənaları göstərilmişdir.

Oyuq – 1-Oyulmuş yer, mağara; 2-Bir şeyin üzərindəki dəlik; çuxurluq (çuxur); 3-Boşluq; 4-Divarda, pəncərə, qapı və s. yeri.

Oyuq 2 sözün omonimik mənası "qorxuluq" - təhlükə, qorxulu vəziyyət; 2 - quşları, heyvanları qorxutmaq üçün bostan və tarlalarda düzəldilən insanabənzər kukla, qorxutmaq üçün şey [14, s. 540].

Beləliklə, "oyuq" sözü texniki və zahiri oxşarlığa görə mənanın köçürülməsi əsasında informatika termini kimi yaranmışdır.

"Ağac" sözü də mənanın funksional köçürülməsi əsasında terminləşmişdir. Həmin sözün bir sıra məişət terminoloji mənaları da mövcuddur. "Ağac" - budaqları olan sərt bir bitki; ağacdan düzəldilmiş dirək, taxta, şalban və s.; ələ alınan əsa, dəyənək, zopa; təxminən 6-7 kilometr uzunluğunda olan ölçü vahidi kimi leksik mənalara malikdir [14, s. 12]. Həmin sözün terminləşməsi zahiri oxşarlığa görə mənanın köçürülməsi əsasında baş vermişdir. Terminoloji mənalar meşəçilik, botanika, riyaziyyat və informatika elmlərinə aiddir. Məsələn, riyaziyyatda "ağac" - dövrü olmayan rabitəli qrafa deyilir. İnformatikada "ağac" termini 2 mənada: 1 – dövrü olmayan əlaqəli istiqamətlənməmiş qraf; 2 - kökdəkindən başqa, hər bir düyünün sayı birdən çox olmayan yuxarı səviyyəli elementlə əlaqədə olan qraf. Təpələr verilənləri, tillər isə verilənlər arasındakı əlaqələri (nisbətləri) göstərir (İİL, 1993, s.50). Bu terminlə əlaqədar informatikada «ikilik axtarış ağacı", "axtarış ağacı", "qərarlar ağacı" və s. kimi terminoloji birləşmələr yaradılmışdır.

"Zibil" sözünün informatika termininə çevrilməsi. Bu cür çevrilmə funksiyanın ümumiliyinə əsaslanır. Məna bu əsasa görə köçürülür.

"Zibil" sözünün ilkin və törəmə mənalarına diqqət yetirək; 1 - çöp, çürüntü (gərəksiz, lüzumsuz, faydasız, heç bir dəyəri olmayan); 2 - çox pis, yararsız, ləyaqətsiz, aciz [14, s. 1283].

"Zibil" informatika elmində «lazımsız, yararsız informasiya" mənasında işlədilir (İİL, 1993, s.109).

"Siçan" sözü zahiri oxşarlığa görə mənanın köçürülməsi əsasında informatika termininə çevrilmişdir. İnformatikada 1. - hamar səthdə hərəkət etməklə informasiyanın yerini müəyyənləşdirən kiçikölçülü qurğu; qrafiki informasiyanı maşına daxil etməyə imkan verən manipulyator; 2 - ekranda göstəricinin vəziyyətini idarə etmək üçün qurğu (İİL, 1993, s.110).

"Axtarış" sözünün informatika termininə çevrilməsi. Ümumişlək sözün bir neçə istiqamətdə terminləşməsi baş vermişdir. Bu istiqamətlərdən biri hüquq, digəri isə informatika elminə aiddir. Hüquqda cinayətkarın axtarışı, informatikada isə tələb olunan xassələrdən ibarət olan elementin tapılması məqsədilə müəyyən elementlərə ardıcıl basılması mənasındadır. Axtarış sözünün anlamında tapılmaq mənası ehtiva olunduğu üçün ümumişlək məna funksional cəhətdən köçürülərək terminləşmişdir.

Beləliklə, semantik üsulla terminin yaranması leksik vahidin sonrakı mənası, yeni kəsb etdiyi vəzifə ilə bağlıdır.

Əlbəttə, yeni anlayışları yalnız mövcud sözlərlə ifadə etmək üsulu bir sıra hallarda sözün məna yükünü çoxaldır, anlayış və məfhumları bir-birindən fərqləndirməyə imkan vermir və beləliklə də, polisemantiklik ortaya çıxır. Dildə iki və daha artıq anlayışın ifadəsinə xidmət edən terminoloji vahidlərin olması isə qarşılıqlı anlaşmanı pozur. Bununla belə, sözlərin mənasını dəyşdirərək onları elmi-texniki (informatika) terminlərə çevirmək yeni yaranan, inkişaf edən anlayışlar üçün ifadə vasitəsi müəyyən etməyin ən faydalı üsullarından biri sayılır.

**Ədəbiyyat:**

1. Abdullayev S. Müasir alman və Azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı: Maarif, 1998.
2. Azərbaycan dialektoloji lüğəti. I cild. A-L, 1999.
3. Azərbaycan dialektoloji lüğəti. Bakı, 1964.
4. Azərbaycan dialektoloji lüğəti. IV cild. Bakı, 1987.
5. Azərbaycan dialektoloji lüğəti. II cild. Bakı, 1980.
6. Budaqov R.A. Dilçiliyə dair oçerklər. Bakı, 1956.
7. Dəmirçizadə Ə.M. Azərbaycan dilinin üslubiyyatı. Bakı: Azərnəşr, 1962.
8. Hüquq terminləri lüğəti. Bakı: Elm, 1961.
9. İsmayılova M. Azərbaycan dili terminologiyasının linqvistik təhlili. Bakı: Ozon, 1997.
10. Kərimov S.Q. və b. İnformatika üzrə rusca-ingiliscə-azərbaycanca izahlı lüğət. Bakı, 1993.
11. Kərimov S.Q., Babanlı Ə.Y., Məmmədxanov R.Q., Vəliyev N.N., İbrahimova S.H. İnformatika üzrə rusca-ingiliscə-azərbaycanca-türkcə izahlı lüğət. II cild, R-Ə, Bakı, 1996.
12. Rüstəmov Ə.M., Hüseynov E.M. İnformatika, Azərbaycan, rus, ingilis dillərində. İzahlı terminlər lüğəti. Bakı: Bakı Universiteti nəşriyyatı, 1996.
13. Sadıqova S. Azərbaycan dili terminologiyasının nəzəri problemləri. Bakı: Elm, 2002.
14. Seyfettin Altaylı. Azerbaycan türkçesi sözlüyü. İstanbul, I, 1994.
15. Xudiyev N. Azərbaycan ədəbi dilinin sovet dövrü. Bakı, "Maarif", 1989.

**Rus dilində**

1. Даняров Р. Формирование и развитие технической терминологии узбекского языка. АКД, Баку, 1982.

**Terms in computer science, formed in a semantic way**

**Summary**

In this article the role of lexical units in the formation of terminoloqical system of the Azerbaijan language is analysed. Assording the science and technique so many neev discoveries and inventions appear. That`s why neev conceptions bring language nev expressions and words. There beginnings enter the language as nev conceptions. In the language they are analyzed orijinal meanings in the researecl work. In the article the systemization are based on the analysis and samples.

**Термины по информатике, образованные семантическим способом**

**Резюме**

В исследовательской работе была решена роль лексической единицы настроении терминологической системы на Азербайджанском языке. В связи с развитием науки и техники выявляются новые открытия и изобретения, которые образуют новые понятия. Сформированные новые названия приводят к некоторым изменениям в языках. Термины, образованные на основе в заимствованных слов, анализируются в исследовательской работе.

Систематизация в статье проделана на основе анализов и примерах.

**Rəyçi: dos.X.Məhərrmova**

DOI: 10.36719/AEM/2007-2019/49/27-30
**Validə Eldar qızı Ağayeva**
Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası
vali1997@mail.ru

# BƏDİİ ÜSLUBDA METAFORANIN ÜSLUBİ ROLU

***Açar sözlər:****bədii üslub, metafora, dilçilik, bədii əsər, məcazlar sistemi*
***Key words:*** *literary style, metaphor, linguistics, fiction, system of metaphors*
***Ключевые слова:*** *художественный стиль, метафора, языкознание, художественное произведение, система выразительных средств*

Sözün təbiəti, leksik mənası, semantik quruluşu, funksional variasiyaları, ifadəlilik imkanları və digər xüsusiyyətləri hər zaman dilçilik elminin diqqət mərkəzindədir. Dilin əsas vahidi olan söz dilçiliyin leksikologiya bölməsində, sözün leksik-semantik planda öyrənilir. Lakin söz dilin ən ümdə vahidi olduğuna görə, həm də ünsiyyət yaradan əsas vasitəsidir. Onun bu cəhəti nitqlə bağlıdır. "Nitqdə isə sözün təbiəti bir vəziyyətdə qalmır" (1, 4). Söz nitq prosesində müxtəlif dəyişikliklərə uğrayır. İnsan fəaliyyətinin müxtəlif sahələrinə xidmət edən söz nitqin xarakterindən asılı olaraq rəngarəng funksiyalarda çıxış edir. Mətnin səciyyəsi ilə əlaqədar sözün mənası və funksiyaları dəyişir. Söz bir tərəfdən əşyavi-məntiqi məna, digər tərəfdən isə bu məna ilə yanaşı əlavə ekspressiv-emosional çalarlar da istifadə edə bilir.

Bədii yaradıcılıqda dilin əsl estetik təsiri bədii obraz və bədii lövhələr yaradan leksik vahidlərin düzgün, yerli-yerində seçilib işlənməsindən asılıdır. Burada söz adi, neytral sözdən seçilir, məzmunca daha dolğun, daha mənalı və daha təsirli olur, estetik funksiya etibarilə isə olduqca qüvvətlidir.

Hər bir xalqın yaratdığı dil ünsiyyət vasitəsidir. Nitq isə öz növbəsində ünsiyyətin yaradıcısı kimi çıxış edir. Ümumxalq dili nitq prosesində ünsiyyətə çevrilib müxtəlif formalarda çıxış edir.

Bədii üslubda ümumxalq dili "bir növ incəsənət materialı kimi çıxış edir" və kommunikativ funksiya ilə yanaşı estetik funksiyasını da müvəfəqiyyətlə yerinə yetirə bilir. Bədii üslubda dil bütövlükdə, bütün üslubları və nitqin müxtəlif növləri ilə iştirak edir. "Bədii ədəbiyyatın sərəncamına keçdikdə dilin və nitqin materialı, xüsusən söz xəzinəsi tamamilə yeni, dəyişilmiş bir şəkildə istifadə edilir. Bədii üslub bu söz materialını estetik funksiyasına tabe edərək işlədir. Burada ümumxalq dilinin hər cür vasitəsilərininin istifadəsi ilə yanaşı, söz və birləşmələr öz adi lüğəvi mənasından əlavə yeni mənalar və üslubi çalarlar ifadə etmə bacarığına da yiyələnir".

Bədii dil obrazlı dildir. Bədii dildə söz fikir ifadə etməklə kifayətlənmir, obyektiv varlığın obrazlı təsvirinə də xidmət edir.

Söz bədii dildə obraz yaradan, hadisələrə subyektiv qiymət verən, dərin və incə hisslər ifadə edə bilən, oxucunun estetik zövqünü oxşayan, ona qüvvətli emosional təsir göstərən bir vasitə kimi çıxış edir. Başqa cür deyilsə, estetik funksiyaya malik bədii dildə söz bədii ifadə və bədii təsvir vasitəsinə çevrilir. Sözün bu dərəcəyə qədər yüksəlməsinin səbəbi onun semantikasının dərinliklərində gizlənən müxtəlif xarakterli məcazi mənaların olmasıdır.

Məcaz sözün semantikasından irəli gələn bir hadisədir və daimə obrazlılığa meyl göstərən insan təfəkkürünün məhsuludur, dilin kateqoriyalarından biridir.

Məcaz dilin ifadəlilik imkanlarını artıraraq, onun lüğət tərkibini zənginləşdirən amildir. Məcazi mənalar lüğət tərkibinin ən ifadəli hissəsi olan obrazlı leksikanın yaranmasında böyük əhəmiyyət kəsb edir. "Sözün əlavə vəzifədə, dolayı yolla ifadə etdiyi məna məcazi məna adlanır" (D.Əliyeva. praktik üslubiyyat. Bakı, 2011, s. 16).

Məcazın ən ifadəli və ən məhsuldar növü metaforadır (yunan sözü "metafhora", yəni məna köçürülməsi). Dilçilik elmində metafora bədii təsvir vasitəsi kimi qiymətləndirilir. Halbuki, metaforanı yalnız bədii dilə aid hesab etmək olmaz. Metafora, ümumiyyətlə, emosional-ekspressiv xarakterə malik canlı danışıq dilinə aiddir. "Metafora elə bir şeydir ki, o, zəruri şəkildə insanın təbiətindən irəli gəlir və nəinki poetik nitqdə, hətta və ən əvvəl, obrazlı ifadələrə və parlaq epitetlərə daima müraciət edən xalqın məişət-danışıq dilində əmələ gəlir" (2, Герман Пауль. Принципы истории языка, Изд-во иностр, лит. М., 1960, s. 114).

Həmin fikri metaforanın təbiəti ilə xüsusi olaraq maraqlanan B.Meylax da təsdiq edir: "Metafora yalnız bədii dilin yox, ümumiyyətlə, insan təfəkkürünün malıdır". (3, В.Мейлах. Процесс творчества и художественное восприятие. Комплексный подход: опыт, поиски, перспективы». М., Искусств (1985) Yalnız insan təfəkkürü varlıqda mövcud olan müxtəlif əşyalar arasındakı bənzər əlaqələri dərk edib, onları eyni söz tərkibi ilə adlandırmağı bacarır. Bu isə metaforanın geniş işlənmə diapazonuna malik olduğunu bir

daha təsdiq edir. Belə ki, birinci növbədə yalnız danışıq dilinə məxsus olan metafora geniş şəkildə bədii dildə, yeri gəldikcə publisistikada da istifadə edilir. Yalnız danışıq dilindən fərqli bədii üslubda metaforanın daha mənalı və daha orjinal formaları meydana çıxır. Bədii yaradıcılıqda metafora ən qüvvətli bədii ifadə və bədii təsvir vasitəsi kimi çıxış edir.

Metaforanın əmələ gəlməsi müxtəlif yollarla mümkün olur. Həmin müxtəliflik metaforanın rəngarəng formalarının meydana çıxmasına səbəb olur. Belə ki, bənzəyişin xarakterindən asılı olaraq metaforanın cürbəcür növləri əmələ gəlir. Metaforanın ən geniş yayılmış formaları əşya və hadisələr arasında mümkün olan aşağıdakı bənzəyiş əlaqələri nəticəsində yaranmışdır:

1) zahiri cəhətdən oxşarlıqla əlaqədar əmələ gələn metaforalar. Məsələn, insana aid cəhətlərin adi oxşarlıq nəticəsində başqa əşyaların üzərinə köçürülməsi: qabın boğazı, ayaqqabının burnu, çayın qolu, südün üzü və s.;

2) daxili əlamətlərinə görə oxşarlıq nəticəsində əmələ gələn metaforalar: məsələn, tülkü, maral, aslan, canavar, quzu, göyərçin, sona və sairə heyvan və quş adları insan üzərinə köçürüldükdə həmin sözlər metaforaya çevrilir;

3) insan və ümumiyyətlə canlılara məxsus hərəkətlər əşyaların üzərinə köçürüləndə metafora əmələ gəlir. Məsələn: ölüm gəzir, fikir doğulur, işlər axsayır, ay doğur və sairə;

4) əksinə, bütün feillər cansız əşyalar bildirən isimlərə birləşib onları canlandırır.

Məsələn, adam quruyub, insan kök salır və s. Bu cür məcazlara dilçilikdə frazeoloji metaforalar da deyilir.

Beləliklə, metafora müxtəlif əşyalar arasında müqayisə prinsipi əsasında əmələ gəlir. Bir sıra hallarda bunun üçün ən parlaq və canlı təsəvvürlərdən istifadə edilir. Nəticədə mənalı və ifadəli metaforalar yaranır. Məsələn, qızıl, ulduz (adam haqqında) və sairə bu tipli metaforalar obrazlı müqayisə nəticəsində əmələ gəlmişdir. Odur ki, hər metaforada gizli müqayisə vardır. Hətta metaforaya məxsus həmin cəhət bəzi alimlərə onu ixtisar edilmiş təşbeh hesab etməyə də əsas verir. Lakin bu fikrə haqlı olaraq etiraz edənlər də var. Bu barədə Musa Adilov yazır, "Metaforalar təşbehə nisbətən daha qüvvətli təsir yaradır. Burada maksimum yığcamlıq nəzəri cəlb edir". (4) Əlbəttə, bəzi metaforalar çox asanlıqla müqayisəyə çevrilə bilər. Bu cəhət əsasən təsviri qiymətverici metaforalara məxsusdur. Məsələn, bic, hiyləgər adamı *tülkü* adlandıranda metafora əmələ gəlir, lakin *tülkü kimi hiyləgərdir* ifadəsini bir şəxsə aid işlədəndə bu, müqayisədir. Yaxud, *mərmər sinə* metaforik epitetdir, *sinəsi sanki mərmərdir* dedikdə isə müqayisədir. Bununla belə, bu cür çevriliş həmişə mümkün olmur. Məsələn, *dağın ətəyi, südün üzü, çayın qolu, çarpayının ayağı* və s. bu kimi terminoloji xarakterə malik metaforalardan heç bir zaman müqayisə düzəltmək mümkün deyil. Üslubi metaforik birləşmələri də müqayisəyə çevirmək olmur; məsələn: *eşqin çırağı, azadlığın günəşi, insanlığın baharı* və s.

Göründüyü kimi, alim müqayisə ilə metaforanı tutuşdurub, məcazın hər iki növünü bir-birindən ayıran cəhətləri müəyyənləşdirməyə çalışmışdır ki, məhz həmin fərqləndirici əlamətlər nəzərə alınarsa, metaforanı müqayisədən çox asanlıqla ayırmaq olar.

Metaforanın təbiətini ilk dəfə qədim yunan alimləri və birinci növbədə Aristotel təyin etmişdir. Antik alimlər metaforanı sözün semantikasından irəli gələn bir hadisə kimi qiymətləndirmişlər. Belə ki, Aristotel metaforanın əmələ gəlməsində müxtəlif əşya və hadisələr arasındakı bənzəyiş kimi əlaqələrin mövcudluğu və adları olmayan əşyaları adlandırmağı əsas səbəb kimi qeyd etmişdir. Metaforanın bədii vasitə kimi rolunu isə qədim Roma alimi Kvintilian çox düzgün təyin etmişdir. O, metaforanı məcazın ən gözəli hesab etməklə yanaşı, onu "təbiətin vergisi" kimi qiymətləndirmişdir. Metafora, yaxud məna köçürməsi nitqi gözəlləşdirməklə bərabər, adları olmayan əşyalara ad da verir. O, əsasən təsir göstərmək, müəyyən bir cəhəti nəzərə çatdırmaq üçündür.

Bu tərif də öz əhəmiyyətini itirməmişdir. Əksinə, onların bu haqda irəli sürdükləri nəzəriyyələr bir sıra cəhətdən müasir elmimizin nailiyyətlərini qabaqlamışdır. Filologiya elmində metafora səciyyəsinə görə iki cür olur: 1) ümumişlək metafora; 2) üslubi, yaxud poetik metafora.

Sözün məcazi mənasından törənmiş, lakin artıq sabitləşmiş, bir sıra hallarda isə terminə çevrilmiş metaforalar ümumişlək hesab edilir; məsələn: dağın ətəyi, çayın qolu, ağacın başı, çəkmənin burnu, ay doğub, tufan qopub (dava, mərəkə mənasında), *tülkü, it, aslan, ilan* və sairə bu cür metaforalar ümumxalq xarakterinə malikdir.

Üslubi, yaxud poetik metafora isə sırf bədii dilin məhsuludur. O, üslubi məqsədə müvafiq bədii əsərdə əmələ gəlir və bədii üslubun malı olaraq qalır. Adətən, bu cür metaforalar danışıq dilində işlənmir. Çünki onların burada işlənməsi sadəcə olaraq komik təsir bağışlar və onlar danışıq nitqinin dəqiqliyini və aydınlığını poza bilər. Əksinə, yüksək, obrazlılığa malik poetik metaforanın bədii dildə aktivliyi dərhal hiss olunur. Çünki poetik metafora bədii üslubun ən qüvvətli bədii ifadə və bədii təsvir vasitəsidir. Məhz ən təsirli

bədii lövhələr və qəhrəmanların ən parlaq təsviri bədii əsərdə poetik metafora vasitəsilə yaradılır. Bundan başqa, metafora bədii əsərin dilini ifadəli, təsirli, mənalı etməklə yanaşı, obrazlı və yığcam şəkildə açılışında böyük rol oynayır, dinləyicinin (yaxud oxucunun) estetik zövqünü oxşaya bilir. Çünki poetik metafora birinci növbədə estetik elementdir, bədii sistemin elementidir.

əzizim ulu dağlar,
çeşməli, sulu dağlar,
burda bir qərib ölmüş,
göy kişnər, bulud ağlar.
və ya
qış günəşi uzaqdan yorğun-yorğun
baxırdı yamaclara.

Poetik metafora obrazlı təfəkkürün bəhrəsidir. Onun əmələ gəlməsi dialektik xarakter daşıyır. Poetik metafora varlığın obrazlı dərketməsi zamanı – hissi duyğular və məntiqi qavranışın dialektik vəhdəti nəticəsində meydana çıxır. Obrazlı təfəkkürün sahibi olan yazıçı bəzən elə obyektlər arasında əlaqələrin olduğunu duyur və dərk edir ki, bu adi təfəkkür üçün mümkün deyil. Həmin obyektlər əksərən mücərrəd və konkret anlayış bildirən əşya və hadisələrin adıdır. Yazıçı mürəkkəb fəlsəfi ümumiləşdirmələr əsasında həmin əşyaları bir-birilə bağlayır və əlaqələndirir.

Poetik-üslubi metaforaların əksəriyyəti fərdi xarakter daşıyır. Varlığın əşya və hadisələrinə subyektiv qiymət verməyə çalışan sənətkar sözün dərinliklərində gizlənən mənaları üzə çıxarıb qüvvətli obrazlılığa malik metaforlar yaradır. Sənətkarın yaradıcılıq fantaziyası və fitri qabiliyyəti əsasında meydana çıxan bu cür metaforalar əsərin ideyası və məzmununun obrazlı şəkildə açılışına xidmət edir, bədii məziyyəti isə yeniliyindən, "gözlənilməz" olduğundan, təbiiliyi və məntiqiliyindən, oxucunun təfəkkür və duyğularına buraxdığı təsirin dərəcəsi ilə qiymətlənir.

Metafora da digər bədii ifadələrə qoşularaq bədii əsərin ümumi fonunda anlaşıla bilər, məntiqə sığışa bilər. Obrazlı, təsirli və orijinal metaforalar yaratma qabiliyyəti fitri istedadın əlamətlərindən biridir. Aristotelin dediyi kimi, "yalnız bunu heç kimdən öyrənmək mümkün deyil, bu bacarıq istedadın əlamətidir".

Doğrudan da, böyük sənətkarların dilində metaforalar əsasən ifadəli, ekspressiv və orijinal olur. Bu cür metaforalar yazıçının fərdi üslubunu fərqləndirməkdə də əhəmiyyətli bir amil kimi özünü doğruldur.

Bədii əsərdə orijinal metafora yaratmaq yazıçıdan böyük bacarıq, fitri istedad tələb edir. Yalnız belə keyfiyyətlərə malik olan sənətkarın yaratdığı metaforalar böyük təsir gücünə malik olur. Sənətkar metaforadan bacarıqla istifadə etməli, üslubi məqsədəuyğun olanını yaratmalıdır. Əks təqdirdə metafora anlaşılmır, "süni, dumanlı çıxır, obrazlılıq, ifadəlilik əvəzinə, boş taqqıltıdan başqa bir şey olmur" (4, 213). Yazıçı metaforadan müxtəlif üslubi məqamlarda istifadə edir. Məsələn, Mir Cəlal başqa əsərlərində olduğu kimi, "Bir gəncin manifesti" povestində də metaforadan üslubi məqsədəuyğun olaraq məharətlə istifadə etmişdir.

Metafora ədəbi qəhrəmanların bir-birinə olan münasibətlərini müəyyənləşdirməkdə də mühüm rol oynayır. "Dostluq qalası" romanından seçilmiş nümunələrə diqqət edək: "O çıxandan sonra qoca arvad bir xeyli qapıya baxıb, dərin bir ah çəkərək: − Bu quduz olub ki, - dedi. "− Atəm, atəş! Qoçaqlar,yumun bu bayquşun ağzını". "− Ax, kərtənkələ rəngli əqrəblər! Gör necə irəli cumurlar". Bu cümlələrdəki quduz, bayquş, əqrəb sözləri ilə müəllif mənfi surətlərə olan nifrətini, kinini, qəzəbini ifadə etmiş və beləliklə, qüvvətli metafora yaratmışdır. Gül, çiçək, meşə, dəniz, su və s. sözlər bədii əsərlərin dilində üslubi məqsəddən asılı olaraq canlı insan kimi təsvir olunur. Bu sözlərin içərisində dəniz sözü xüsusilə diqqəti cəlb edir. Sənətkar dəniz sözü vasitəsilə obrazlılıq yaradır. Fikrin daha təsirli, mənalı verilməsinə nail olur: "İndi bu dəniz Tapdığın gözü qabağında sərilib qızmar yay günəşi altında sakit-sakit yatırdı"; "Dəniz pıçıldayır, onlar isə susurdular".

Bədii üslubda dilimizin söz xəzinəsinin rolunu, sözlərin semantikası ilə bağlı istifadə qaydaları və funksiyalarını, sözün ifadəlilik imkanlarını, sözdə obrazlılıq, emosionallıq və ekspressivlik kimi keyfiyyətlərin əmələ gəlmə səbəbləri və yollarını tədqiqi dilçilik elmi üçün, dilin ekspressiv imkanlarının genişlənməsinə xidmət edəcək.

**Ədəbiyyat:**

1. T.Əfəndiyeva. Azərbaycan dilinin leksik üslubiyyatı. Bakı, 1980.
2. Г.Пауль. Принципы истории языка, Изд-во иностр, лит. М., 1960
3. В.Мейлах. Процесс творчества и художественное восприятие. Комплексный подход: опыт, поиски, перспективы». М., Искусств, 1985
4. M.Adilov. R.Rzanın dili və üslubi haqqında bəzi qeydlər. "Azərbaycan" jurnalı, №2, 1963, səh.213
5. M.Səfərov. Azərbaycan dili məsələləri. Bakı, "Elm və təhsil", 2016

**The methodical role of metaphor in manner**
**Summary**

The true aesthetic effect of language in artistic creativity depends on the proper, locally chosen lexical units that create artistic images and artistic boards. Here the word is chosen from a neutral, neutral word, it is more content, more meaningful and more effective, and the aesthetic function is quite powerful. The reason for the word's rise to such an extent is the existence of various figurative meanings hidden in the depths of its semantics. The most expressive and most productive type of metaphor is metaphor. In linguistics, metaphor is regarded as a means of artistic description.

**Стилистическая роль метафоры в художественном стиле**
**Резюме**

Истинный эстетический эффект языка в художественном творчестве зависит от правильных, локально выбранных лексических единиц, которые создают художественные образы и художественные изображения. Здесь слово отличается от нейтрального, нейтрального слова, оно более содержательное, более значимое и более эффективное, а эстетическая функция довольно сильная. Причиной этому является является наличие у слова различных переносных значений, скрытых в глубинах его семантики. Наиболее выразительным и наиболее продуктивным выразительным средством в языке является метафора. В лингвистике метафора рассматривается как средство художественного описания.

**Rəyçi: dos. Ş.Ağakişiyeva**

DOI: 10.36719/AEM/2007-2019/49/31-34
**Esmira Əbülfət qızı Məmmədova**
Azərbaycan Dillər Universiteti
memmedova.esmira@gmail.com

# BİRİNCİ TÜRKOLOJİ QURULTAY VƏ DİL MƏSƏLƏLƏRİ

***Açar sözlər:*** *Qurultay, Türkoloji, Bakı, əlifba, müqayisəlidilçilik*
***Keywords:*** *Congress, Turkology, Baku, alphabet, comparative linguistics*
***Ключевые слова:*** *Съезд, тюркология, Баку, алфавит, сравнительная лингвистика*

## GİRİŞ

Azərbaycanın paytaxtı Bakı şəhərində 1926-cı il26 fevral-5 mart tarixlərində keçirilmiş Birinci Türkoloji Qurultay türk xalqlarının, o cümlədən Azərbaycan xalqının mədəni inteqrasiyasında yeni bir mərhələnin təməlini qoyan ən əlamətdar hadisələrdən biridir.

I Türkoloji Qurultayın Bakıda keçirilməsi tamamilə qanunauyğun bir hal idi, çünki həmin dövrdə bir çox elmi-mədəni sahələrdə olduğu kimi türkologiya elmində də Azərbaycan öndə gedirdi. Ölkəmiz həmin dövr üçün geniş mənada türkologiyanın əsas mərkəzlərindən biri idi. Ölkədə bu istiqamətdə tanınmış və nüfuzlu söz sahibləri, elm adamları çoxdan bəri səmərəlifəaliyyət göstərirdi. Heç təsadüfi deyil ki, keçən əsrin 70-ci illərində də nüfuzlu "SovetskayaTürkologiya" jurnalı məhz Bakıda nəşr edilməyə başladı. Bu fakt Azərbaycanın və onun paytaxtıBakı şəhərinin postsovet məkanında türkologiyanın mərkəzi kimi məşhur olmasının və təsdiqinin ifadəsidir. Onu da qeyd edə bilərik ki, sözügedən jurnal hal-hazırda bu gün də "Türkologiya" adı iləbeynəlxalq dərgi olaraq Bakıda nəşr olunur.

Qeyd edək ki, 1920-ci ildə Şərq xalqlarınınBirinci Qurultayı da məhz Bakıda keçirilmişdir.Həmin tədbir nəticəsində Azərbaycanın türk-müsəlmandünyasında əhəmiyyətli mövqeyi və böyük intellektual potensialı diqqəti cəlb etmişdir.

Azərbaycanlı ziyalıların Şərq xalqlarının Qurultayında və Birinci Türkoloji Qurultayda fəal iştirakı ölkəmizdə yalnız dilçilik sahəsində deyil, həm də ədəbiyyat, tarix, mədəniyyət, folklor, etnoqrafiyavə maarifçilik sahəsində də böyük elmi və yaradıcı qüvvələrin yetişib formalaşdığını nümayişetdirir.

Birinci Türkoloji Qurultayda keçmiş Sovet İttifaqının müxtəlif bölgələrində, geniş bir coğrafi məkanda yaşayan çoxsaylı türk xalqlarınınmədəni həyatı üçün bir sıra qlobal məsələlər müzakirə olunmuşdur. Bu toplantıda yaxın gələcəyə yönələn mühümqərarlar qəbul edilmiş və ən başlıcası keçmiş Sovet İttifaqı məkanında yaşayan bütün türk xalqlarıüçün latın qrafikalı əlifbaya keçidin elmi-metodoloji prinsipləri işlənib hazırlanmışdır.

I Bakı Türkoloji Qurultayında türk dillərinin aşağıdakı problemləri müzakirə obyekti oldu və müvafiq qərarlar qəbul edildi:

1. Əlifba məsələsi; 2. İmla-orfoqrafiya problemi; 3. Termin məsələsi; 4. Tədris-metodika məsələsi; 5. Qohum və qonşu dillərin qarşılıqlı əlaqəsi və interferensiya problemləri; 6. Türk dillərinin ədəbi dil problemləri, o cümlədən ortaq ədəbi dil məsələsi; 7. Ulu dil nəzəriyyəsi və türk dillərinin tarixi problemləri.

Qurultayda adı çəkilən məsələlərdən bəzilərinə nəzər salmağı lazım bilirik. Bunlardan birincisi əlifba məsələsidir.Hələ XIX əsrdən M.F.Axundovun başladığı və mütərəqqi ziyalılarımızın uğrunda fəal mübarizə apardığı yeni əlifba ideyası sovet hakimiyyətinin ilk günlərindən dövlət tərəfindən himayə olunmağa başladı.Əslində 1921-1922-ci illərdən başlayaraq Azərbaycan ziyalıları yığıncaqlarda bu məsələ ilə bağlı müxtəlif fikirlər səsləndirirdilər. Bu da ona gətirib çıxartdı ki, iki dəstə yarandı. Latınçılar və islahatçılar. Latınçılar deyəndə latın əlifbasına keçidin tərəfdarları, islahatçılar deyəndə isə ərəb əlifbasında təkmilləşdirmə aparmaq tərəfdarları nəzərdə tutulur. Latınçılar əlifba layihəsi təqdim etdilər, islahatçılar isə heç nə vermədilər. 1922-ci ilin mayında Azərbaycan Xalq Komissarlar Soveti yanında "Yeni türk əlifba komitəsi" yaradıldı. Artıq latın qrafikasına keçidin əsası qoyulurdu. Artıq "Yeni yol" qəzeti (baş redaktoru C.Məmmədquluzadə) latın əlifbası ilə nəşr olunurdu. 1924-1925-ci tədris ilindən başlayaraq 1-ci siniflərə yeni əlifba ilə dərs keçirdilər (2, s. 337).

Birinci Türkoloji Qurultayda əlifba məsələsinin qoyulması bu işi daha da sürətləndirdi. Türkoloji Qurultayda türklər üçün ədəbi dil məsələsindən dədaha səs-küylü, ətrafında ən qızğın mübahisə gedən məsələ əlifba məsələsioldu. Əlifbanın müzakirəsi beş iclası əhatə etmişdi.

Əslində, Moskvanın bu qurultayı təşkil etməsi türk xalqlarını əzizləməsindən irəli gəlmirdi. O, bir tərəfdən türklərin bir-biri ilə ünsiyyətinikəsmək, o biri tərəfdən, onları öz qədim, dolğun tarixlərindən

məlumatsızlaşdırmaq istəyirdi. Bununüçün min ildən çox işlətdiyi əlifbasını onun əlindən almaq lazım idi. Türkün böyük, şərəfli tarixi buəlifba ilə yazılmışdı. "Elmi terminologiyanın sistemi haqqında" məruzəsində Bəkir Çobanzadə qeydedir ki, Asiya tarixinin ən mühüm, ən uca dövrləri, monqollar, hunlar, teymurilər dövrü, ya islamınyayılma dövrü bu əlifba ilə yazılmışdı. Gələcək türk nəsilləri öz babalarının bu şanlı tarixini oxuyabilməyəcək, kimin övladları olduqlarından xəbərsiz qalacaq və tarixini 1920-ci illərdən başlandığınısanacaqlar və türklər özlərini "böyük rus tarixinin" qarşısında yazıq sanacaqdılar. Hələ də dərinniyyətini pərdələmək üçün "slavyan çirkabını" gizlədib, riyakar siyasi biclik işlədərək, "Oktyabrinqilabında" imperiya xalqlarına verdiyi hörmət vədini saxlayaraq", kiril-filan təklif etmədən tarixiəlifbasının yerinə türkə müasir Avropanın və dünyanın ən böyük işlənmə coğrafiyasına malik olanlatın əlifbasını təklif etdi (1, səh. 69).

Və sonda səs çoxluğu ilə əksəriyyət latın əlifbasına səs verdilər.Bunun nəticəsi olaraq 1929-cu il yanvar ayının 1-dən etibarən azərbaycanlılar kütləvi surətdə latın əlifbasına keçirlər.

Qurultayda qaldırılan latın əlifbasına keçid məsələsi XX əsrin əvvəllərində Azərbaycanda olduğu kimi Türkiyə Cümhuriyyətində də tətbiq olunmuşdur. Sonradan Sovetlər İttifaqı daxilində bu proses dayandırılır və kiril əlifbası ilə əvəz olunur. Lakin müstəqillik dövründə latın əlifbası ideyası yenidəndirçəldilmişdir. Hazırda Azərbaycanda, Türkiyədə, Özbəkistanda və Türkmənistanda rəsmi olaraqlatın əlifbasından istifadə olunur.Qazaxıstan isə latın əlifbasına keçmək haqqında qərar qəbul etmişdir (4, s. 7).

Ümummilli liderimiz Heydər Əliyevin 1 avqust 2001-ci il tarixli xüsusi fərmanı iləAzərbaycanda latın əlifbasına tam keçidin təmin edilməsi Birinci Türkoloji Qurultayın ideyalarınınmüstəqillik qazanmış respublikamız üçün nə qədər aktuallıq qazandığını və müasirlik baxımındanəhəmiyyət kəsb etdiyini nümayiş etdirir.

I Türkoloji qurultayda iştirakçılar tərəfindən müqayisəli türkoloji dilçilik məsələlərinə də diqqət ayrılmışdır. İstər müqayisəli dilçilik, istərsə də müqayisəli türkoloji dilçilik tarixi-genetik qohumluq kimi anlaşılandil qohumluğu dərəcəsini müəyyənləşdirməyə səy göstərir. Uludillərin bərpası, dillərin, dilailələrinin və onların qruplarının tarixində diaxron proseslərin tədqiqi ilə məşğul olur. Bütün XIXəsr boyu dilçilikdə hakim mövqe tutmuş müqayisəli-tarixi dilçilik məsələləri I Türkoloji Qurultaykimi elmi məclisdə də diqqətdən kənarda qala bilməzdi. Qurultayda bu barədə söylənmiş fikirləri İ.Tahirov iki qrupda birləşdirir: 1. Türk dillərinin özləri arasında qohumluğun ortaya çıxarılması məqsədilə müqayisəsi;2. Türk dillərinin monqol, tunqus, fin-uqor, yafəs dilləri ilə qohumluğunun müəyyənləşdirilməsi məqsədilə müqayisəsi (5, s. 72).

Türk dillərinin özləri arasında qohumluğun ortaya çıxarılması məqsəd və müqayisəsi ilə bağlıqurultayda prof. Bəkir Çobanzadə "Türk ləhcələrinin yaxın qohumluğu" (6, s. 129-137) adlı məruzəetmişdir. Məruzədə alim türk ləhcələrinin Orxon abidələrinəqədərki dövrdə mövcud olduğu vəbunun heç bir şübhə doğurmadığı fikrini irəli sürür: "Bir tərəfdən, belə bir danılmaz fakt ki, tukyuyaaid orxon yazılı abidələrinin şərqi və qərbi, yaxud şimali və ya cənubi olmaqla iki hissəyəbölünməsi, digər tərəfdən, həmin abidələrdə karluk, uyqur, doqquz oquzlar, qırğız və digərlərininadlarının xatırlanması və, nəhayət, Orxon yazılı abidələrinin dilinin özü bu barədə danışır vəyuxarıda dediyimizi sübut edir. Həmin türklərin özlərini "türk" adlandırması da heç bir şübhədoğurmur. ... Əgər "Qutadqu-Bilik", "Divan Hikmət", "Divan lüğət-it-turk" kimi müxtəlif dövrlərəaid olan əsərlərə baxsaq, onda onların müxtəlif ləhcələrdə yazıldığını, müəlliflərin özlərini "türk"adlandırdığını görəcəyik" (6, s. 129).

B.Çobanzadə türk dilləri və ləhcələrinin qohumluğu ilə bağlı aparılmış tədqiqat işlərinin əhəmiyyətini heç də azaltmadan belə bir mülahizəni də vurğulayır ki, bu tədqiqatlar türk dillərinin qarşılıqı əlaqələinə kifayət qədər işıq salmaq imkanında və bu dillərin müqayisəli qrammatikası kimi çıxış etmək iqtidarında deyildir: "Madam ki, məsələ qarşımızda bu şəkildə görünür, onda fantastik düşüncələri bir tərəfə qoyub, hər bir türk dilinin ayrılıqda öyrənilməsi və ya hər hansı bir dil qrupuna aid müqayisəli əsərlərin hazırlanması ilə məşğul olmaq, şübhəsiz, məqsədəuyğun olardı" (6, s. 137).

Müqayisəli türkoloji dilçilik ilə bağlı qəbul olunan qətnamədə ayrı-ayrı türk dillərinin, dialekt və şivələrinin dərindən, hərtərəfli öyrənmək, toplanmış dil materiallarını çap etmək, ayrı-ayrı elmi qrammatikaların və lüğətlərin tərtib olunmasını təşkil etmək, müqayisəli-tarixi qrammatika kitablarının yazılması, müqayisəli etimoloji lüğətlərin hazırlanması, türk dillərinin və dialektlərinin təsnifi ilə əlaqəli işlərin görülməsinə diqqətin artırılması nəzərdə tutulurdu.

Qurultayın gündəliyində yer alan əsas məsələlərdən biri də ortaq ədəbi dil problemi idi. Ortaq ədəbi dil ideyasının müəllifi görkəmli Krım tatar ziyalısı İ.Qaspıralı idi. Əslində onun ümumtürk ədəbi dili məsələsi ictimai-siyasi məzmun daşıyırdı. Ancaqo, qəzetçilik fəaliyyətində M.Kazımbəyin 50 il əvvəl başladığı dil təcrübəsinə əsaslanmışdı.İ.Qaspıralının təsisçisi olduğu "Tərcüman" qəzeti Krımdan başlayaraq Qafqaza, Volqaboyunayayılmış, oxunmuş və anlaşılmışdı. Bunun bir əsas səbəbi də o idi ki, Krım tatar türkcəsi oğuz

vəqıpçaq ləhcələrinin elementləri əsasında formalaşmışdı. Türkiyə ilə daim sıx tarixi əlaqə Krım tatartürkcəsində oğuz elementlərini gücləndirdiyi kimi, Qazan tatarları ilə bilavasitə yaxınlıq, folklor-dastanmüştərəkliyi qıpçaq faktını genişləndirmiş və yeniləşdirmişdi. Bu halda "Tərcüman"ın dilini oğuz və qıpçaq coğrafiyalarının ziyalıları rahat anlamalı idilər (3, s. 22).

Azərbaycan mətbuatının banisi Həsən bəy Zərdabi də İ.Qaspıralının bu işini rəğbətlə qarşılayır və belə yazırdı: "Tərcüman 30 ildir ki çıxır. Bu otuz ilin müddətində hər tərəfin müsəlmanları qeyri qəzeti olmadığına görə onu aparıb oxuyublar. Odur ki, bəradərimiz İsmayıl bəy istəyir ki, "Tərcüman"ın dili ümumi dil olsun" (3, s. 23).

Maarifçi, ictimai xadim Həsən bəy Zərdabi də ümumi türk dili ideyasını bəyənirdi. Və deməli, ortaq türk ədəbi dili uğrunda böyük mübariz Əli Bəy Hüseynzadə bu fikri öz qəzetində çap etməklə böyük ideoloq İsmayıl bəy Qaspıralıya öz rəğbətini bildirmiş olurdu.

Bütün bunlar onu göstərir ki, ortaq dil layihəsi, demək olar ki, qurultaydan əvvəl nəzəri cəhətdən hazırlanmışdı.Ümumiyyətlə, qurultayda əksər çıxışların məzmunu bu formada idi: türkcələr yaxındır, başa düşüləndir, rahatlıqla ortaq türk dili yaratmaq olar. Beləliklə, qurultayın gəldiyi nəticə bu idi:əvvəldən türk ləhcələri arasında danışıq dilləri səviyyəsində anlaşma olub, indiki iqtisadi, siyasi,mədəni əlaqələrin, nəqliyyat və başqa kommunikativ vasitələrin çoxaldığı, təhsilin inkişaf etdiyi bir zamanda türklər üçün ümumi ədəbi dil yaratmaq ideyasını gerçəkləşdirmək olar.

## NƏTİCƏ

Beləliklə, Türkoloji Qurultay ortaq türk dilinin yaradılmasını qəbul edirdi, ancaq bugünkü baxışlar onu göstərir ki, ortaq türk dili yaratmaq yox, ortaq ünsiyyət dili yaratmaq daha düzgün variant olaraq qəbul edilməlidir.Ümumi ortaq türk ədəbi dili yaratmaq əsla mümkün deyil. Müxtəlif coğrafiyalarda formalaşmış yerli milli dillər şəklinə düşmüş türkcələri bir yana qoyub, yeni dilhazırlamaq olmaz.

Qeyd edək ki, I Türkoloji Qurultayın qəbul etdiyi qərarlar sırasında ortaq əlifba, ortaq ədəbi dil, müqayisəli dilçilik kimi məsələlər xüsusilə mühüm yer tuturdu. Məlum olduğu kimi həmin məsələlər və onlarla bağlı problemlər bu gün də öz aktuallığı ilə seçilir və böyük əhəmiyyət daşıyır.

## Ədəbiyyat:

1. Eyvazova R. Birinci Türkoloji Qurultayda qoyulanməsələlərə akademik Tofiq Hacıyevin münasibəti. "Türkoloji Qurultayın 90 illiyinə həsr olunmuş beynəlxalq konfrans:Türkoloji elmi-mədəni hərəkatda ortaq dəyərlər və yeni çağırışlar" beynəlxalq konfransın materialları, I hissə, Bakı, 2016. s. 67-70.
2. HacıyevT. Azərbaycan ədəbi dili tarixi II hissə, Bakı, Elm, 2012. 389 s.
3. Hacıyev T. Birinci Türkoloji Qurultayda dil məsələləri / BDU-nun "Bakı Universiteti Xəbərləri" elmi jurnalı. Bakı, 2006, № 2, s. 18-26.
4. Həbibbəyli İ. Birinci Türkoloji Qurultayın dərsləri və müasir çağırışlar. "Türkoloji Qurultayın 90 illiyinə həsr olunmuş beynəlxalq konfrans:Türkoloji elmi-mədəni hərəkatda ortaq dəyərlər və yeni çağırışlar" beynəlxalq konfransın materialları, I hissə, Bakı, 2016. S. 7-12.
5. Tahirov İ. I Türkoloji Qurultay və müqayisəli dilçilik məsələləri. "Türkoloji Qurultayın 90 illiyinə həsr olunmuş beynəlxalq konfrans:Türkoloji elmi-mədəni hərəkatda ortaq dəyərlər və yeni çağırışlar" beynəlxalq konfransın materialları, I hissə, Bakı, 2016. S. 72-75.
6. Первый Всесоюзный Тюркологический Съезд. Баку: "Нагыл Еви", 2011

## First Turkological Congress and language problems

### Summary

The article considers the first Turkological Congress held in Baku in 1926.

The first Turkological Congress is one of the most significant events that laid the foundation for a new stage in the cultural integration of Turkic peoples, including the Azerbaijani people.

In addition to the many issues discussed at the congress, there were also language problems.Questions of the general alphabet, the common literary language, and comparative linguistics were among the decisions taken by the First Turkic Congress.These problems are relevant today and are of great importance.

**Первый Тюркологический Съезд и языковые проблемы**
**Резюме**

В статье рассматривается первый Тюркологический съезд, состоявшийся в Баку в 1926 году. Первый тюркологический съезд является одним из наиболее значимых событий, положивших начало новому этапу культурной интеграции тюркских народов, в том числе азербайджанского народа.

Помимо многих вопросов, обсуждавшихся на конгрессе, были и языковые проблемы. Вопросы общего алфавита, общего литературного языка и сравнительного языкознания были среди решений, принятых I Тюркологическим конгрессом. Эти проблемы актуальны и сегодня и имеют большое значение.

**Rəyçi: dos. D.Əliyeva**

DOI: 10.36719/AEM/2007-2019/49/35-36
**Zərifə Fərhad qızı Feyzullayeva**
Bakı Dövlət Universiteti
zerifefeyzullayeva@gmail.com

# ELMİ JURNALİSTİKANIN YARANMA TARİXİ

***Açar sözlər:*** *elm, jurnalistika, informasiya, elmi jurnalistika, KİV, tarix*
***Key words:*** *science, journalism, information, scientist, article, scientific journalism, mass media, history*
***Ключевые слова:*** *наука, журналистика, информация, научная журналистика, средства массовой информации, история*

Bir çox elm tarixçisi elmin bəşər tarixi qədər qədim olduğunu irəli sürür. Ən qədim dövrlərdən bəri insanlar ətraf mühiti müşahidə etmiş, yaşadıqları mühiti dərk etməyə çalışmış və təbiətlə qarşılıqlı münasibətdə olmuşlar. Qədim dövrlərdə insanlar yazı, kəsmə vasitələri, təkərlər, ilk əkinçilik vasitələri icad etdilər. Elm ilk dəfə nə İntibah dövründə, nə də Qərb dünyasında ortaya çıxdı. Onun kökləri ibtidai cəmiyyətlərin həyatına qayıdır. İnsanlar yaşamaq və təbiətə qarşı mübarizədə uğur qazanmaq üçün təbiət haqqında bilmək istəyirdilər. İnsanların bilmək istəyi, elmin yaranması adına atılan ilk addımlar hesab olunur. İnsanın mövcud olduğu gündən bəri kainatda baş verənləri anlamaq, onun sirlərini həll etmək, təbiəti idarə etmək və daha rahat və daha təhlükəsiz bir həyat sürmək istəyi elmin yaranmasına zəmin hazırlamışdır. Başqa sözlə, elmin tarixinin qədim dövrlərə, ibtidai əsrlərə təsadüf etdiyini söyləmək olar.

İnsanın təbiəti başa düşmək səyləri yer üzünün mövcudluğundan bəri davam edir. Bu səy bu günə qədər vacib biliklərin formalaşmasına kömək etdi. Ən erkən çağlarından bəhs edilə bilən elm keçmişdən bu günə qədər müxtəlif proseslərdən keçmişdir. Ancaq elmin kökləri sivilizasiyanın yaranmasından əvvəlki dövrlərə gedib çıxır.

Bu gün elm, düşüncə tərzimizi formalaşdırmaqla yanaşı, həyat şərtlərimizi də dəyişdirərək dünya görüşümüzə təsir göstərir. Elmin cəmiyyətə müsbət bir şəkildə təsir etməsi üçün ilk növbədə elmi düşüncə tərzinin geniş kütlələr arasında yayılmasına ehtiyac var. Belə bir mühitdə ünsiyyətin, xüsusən də elm ünsiyyətinin əhəmiyyəti getdikcə artır.

Dünyada qəzetlər ilk çıxdıqlarından bu yana, bilərək və ya bilməyərək, səhifələrində elmi yazılara yer vermişdilər. Kütləvi informasiya vasitələrinin elm sahəsindəki maraqları əsrlər boyu sabit qalmışdır. Müharibə texnologiyası, planetlərin kəşfi, tibb sahəsində gedən proseslər haqqında xəbərləri jurnalistlər redaktorlarına asanlıqla satmağa başladılar. Belə ki, redaktorlar bu mövzunun elmi olduğunu düşünmür, yalnız oxucunun diqqətini çəkmək üçün yenilik olduğu qənaətində idilər. XVIII, XIX və X əsrin hər hansı bir qəzetində ən geniş mənada bu gün “elm” kimi təsnif edilə bilən xəbərlərə rast gəlinirdi.

XVII əsrdə ilk dəfə elmi ictimaiyyətin geniş ictimaiyyətdən ayrılmasına başlandı. Elmi inqilabların təsiri ilə elm öz həqiqətlərini ortaya qoyan fəaliyyət növü kimi inkişaf etdi.

XVIII əsrdə elm tədricən populyarlaşmağa başladı və ictimai mühazirələr və konfranslar sayəsində mədəni həyatın və xüsusən də yüksək səviyyənin bir hissəsi oldu. XVIII əsrdə elmə olan bu maraq bir çox elmi yazıçıları üzə çıxarmışdı. Populyar elm birbaşa insan kütlələrinə yönəldildiyi üçün kütləvi informasiya vasitələri ilə sıx əlaqəli bir anlayışdır. İngiltərədə bu prosesin inkişafına nəzər yetirsək görərik ki, xarakteristikada XVIII əsrin sonlarında elm adamları elm dünyası ilə populyar dünyanın inteqrasiyası zamanı əhəmiyyətli fayda əldə edəcəklərini nəzərə alaraq elm anlayışını yaymaq istədilər. Məşhur elmi nəşrlərlə məşğul olan insanlara “elm jurnalistləri” və ya “elm yazarları” deyilir.

XIX əsrdə isə elm adamları ilə cəmiyyət arasında uçurum yaranmağa başladı. Və bu zaman elm adamlarının populyar dünyadan uzaqlaşması nəticəsində yeni yazılar yazmaq jurnalistlərin ixtiyarına keçdi. XIX əsr elmin özündə də dəyişikliklər əsri idi. Bu əsrdən bəri ilk dəfə olaraq elm adamları öz maraqlarını izləməkdən daha çox işə üstünlük verdilər və Cambridge, Paris və Harvard kimi mərkəzlərdə bu xüsusi təcrübənin təbii mühiti olaraq laboratoriyalar quruldu. Elm adamları fərdi iş mühitlərindən öyrənmək üçün daha çox ictimai laboratoriyalara köçdükcə ilk elmi icmalar qurulmağa başladı. Bu baxımdan qabaqcıl İngilis Elmin İnkişafı Birliyi (BAAS) və Elmi araşdırmalara daha güclü bir istiqamət vermək məqsədi ilə 1831-ci ildə 250 üzvü ilə quruldu.[5]

XIX əsrin sonların da isə bir çox məşhur elmi jurnalların sayı sürətlə artırdı. “Scientific American” and “Popular Science Monthly” bunlardan ən məşhuru idi. İnsanların elmlə əlaqəsinin yanaşması vurğulayır ki, ölkələrin elm və texnologiya siyasətlərini müəyyən edərkən və elmi qərarlar qəbul edərkən ictimaiyyətin fikirləri nəzərə alınmalıdır. Beləliklə, möcüzə dərmanlar, möcüzə müalicələr, problemləri dərhal həll edən

sağlamlıq və gözəllik məhsulları, insanları məlumat və informasiya əsrinə gətirən kompüter və internet məhsulları haqqında məqalələr qəzetlərdə elmi jurnalistika materialı olaraq görünməyə başladı. Bundan əlavə, jurnalistikada müəyyən formalarda məzmunun formalaşması miqdarının artması ilə elmi ünsiyyət hazırki əlavələrə doğru irəliləyir.

Elmi jurnalistilərin sayı XX əsrin başlanğıcında bir çox ölkələrdə artdı. Elm jurnalistlərinin ölkədə xüsusi təşkilatlarının yaradılması ilə yanaşı, Dünya Elm Jurnalistləri Federasiyası kimi qlobal birliklər də yaranıb və dünya universitetlərində formal elmi jurnalistika təhsili verilməyə başladı. [7]

XX əsrin 50-ci illəri insan və elm arasındakı əlaqələrin bir çox aspektində, elmin tibb, rabitə və nəqliyyat texnologiyası olaraq insan həyatına getdikcə daha çox girməyə başladığı dövrdür. 60-cı illər insanların kosmosa getdiyi, dövri nəşrlərdə kosmik araşdırmaların tez-tez yer aldığı və elmə böyük bir heyranlığın bəsləndiyi illər idi. 70-ci illər, artan ekoloji problemlər səbəbiylə bu heyranlığın sosial qayğılarla əvəz olunduğu dövrdür. 80-ci illərdə elm və texnologiyaya həvəsli bir istiqamət var idi və texnologiya ucuzlaşdı və asanlıqla əldə edildi.

90-cı və 2000-ci illər həyatın bütün sahələrində kompüterlərin inkişafının sürətlə və geniş yayıldığı, eyni zamanda ətraf mühitlə bağlı narahatlıqların artdığı dövr idi. Gündəlik insan həyatı hədəfi olan insan, qeyd olunan dövri meyllərdən, şəxsi maraqdan, yaşadığı problemlərdən başqa bir çox səbəbə görə elmə maraq göstərə bilər. Səbəblər fərqli olsa da, cəmiyyətin böyük təbəqələrinə maraq və gözləntilərin getdikcə artdığı bir həqiqətdir. Məşhur elmi nəşrlərin əsas məqsədi elmə dair göstərilən tələblərə cavab verməkdir. Elm savadlılığı anlayışının ortaya çıxmasından sonra elmə olan ictimai maraq artdı.

Son illərdə sosial şəbəkələr elm ünsiyyətində aktiv olmağa başladı. Müasir dövrdə informasiya kanalı olaraq internetin mövcudluğu izləyicilərin məlumat axtarmaq vərdişlərinə ciddi təsir göstərmişdir. Elm jurnalistləri, digər istifadələr arasında, əsas vasitə kimi interneti mənimsəmişdilər. Son bir araşdırmada iştirak edən respondentlər gündə orta hesabla internetdə üç saatdan çox vaxt sərf etdiklərini bildirdi. Avropanın 14 ölkəsində elm yazarları arasında sorğu jurnalistlərin BBC News və New Scientist kimi saytlara güvəndiyini aşkar etdi. Nəhayət, internet auditoriya üzvləri ilə həm elm adamları, həm də jurnalistlər arasında birbaşa rabitə xətləri açdı.

**Ədəbiyyat:**

1. Akoğlu. A. “Popüler bilim yayıncılığı və gökyüzü gözlem etkinlikleri” Journal of İstanbul Kültür University. 2005

2. Briggs. P “New visions for associations for the advancement of science: A case study”Sciecne Communication in theory and practice. Netherlands. 2001

3. Buchi. M. “Sciecne in Society: An introduction to social studies of science” London. 2004

4. Bülent G. “Popüler bilim anlayışı ve coğrafyanın popülerliği, bilim ve teknik dergisi örneği”. Doğu coğrafya dergisi. Türkiye. 2010

5. Çiler D. “Dünyada bilim iletişimin gelişimi ve farklı yaklaşımlar: toplum için bilimden toplumlu bilime”. Online international journal of communication studies. Türkiye. 2010

6. George J, Miller S. “The public Understanding of science”. Handbook of science communication.UK. 1998

7. Seçil U. “Bilimsel okuryazarlık: bilim iletişimi ve medyadakı bilim haberlerini doğru okumak”. Uluslararası sosyal araşdırmalar dergisi. Türkiye. 2017

**The history of scientific journalism**

**Summary**

There was a great need for the spread of scientific thinking among the masses to affect the society in a positive way. In such a condition the significance of communication, especially scientific communication is gradual increasing. This article contains the history of scientific journalism, its development through the centuries. It is mentioned that it was possible to come across new that can be classified as “science” in any newspaper of the XVIII, XIX and XX century.

**История возникновения научной журналистики**

**Резюме**

Существовала острая необходимость в распространении научного мышления в массах, чтобы позитивно влиять на общество. В таких условиях значение общения, особенно научного общения, постепенно возрастает. Эта статья содержит историю научной журналистики, ее развитие на протяжении веков. Упоминается, что в любой газете XVIII, XIX и XX веков можно было встретить новое, которое можно отнести к категории “науки”.

**Rəyçi: dos. V.Əliyev**

ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ

DOI: 10.36719/AEM/2007-2019/49/37-39
**Cahidə Etibar qızı Yaqubova**
Bakı, Azərbaycan
ccahide@bk.ru

# ƏFSANƏ JANRININ TƏSNİFATI

***Açar sözlər:*** *əfsanə, folklor, müqayisə, epik növ, xalq ədəbiyyatı*
***Key words:*** *legend, folklore, comparison, epic type, folk literature*
***Ключевые слова:*** *легенда, фольклор, сравнение, эпический вид, народная литература*

## GİRİŞ

Əfsanələr epik növün janrlarından biridir. Bu janrda xalqın dünyagörüşü, məişət həyatı, adət və ənənələri öz əksini tapmışdır. Əfsanələr uzun müddət nağılların növü hesab edilmiş, lakin sonradan ayrılmışdır. Əfsanələr XIX əsrdən başlayaraq toplanmış və nəşr edilmişdir. Şifahi ədəbiyyatımızda əfsanələr janr kimi kosmoqonik, dini, etnoqrafik, tarixi, toponomik, qəhrəmanlıq səciyyəsi daşıyır. Əfsanələr xronika, salnamə, cüng və əlyazmalar kimi tarixi qaynaqlarda qorunub saxlanmışdır. Onlar dildə - ağızda dolaşaraq dövrümüzə kimi gəlib çatmışdır. Müstəqil janr kimi əfsanələrin özünəməxsus xüsusiyyətləri vardır. Burada mətn sabit deyil, süjet isə bütöv yox yarımçıq və ya epizodik formadadır.

## ƏFSANƏLƏRİN NÖVLƏRƏ BÖLÜNMƏSİ, XÜSUSİYYƏTLƏRİ

Hələ eramızdan əvvəlki dövrlərdə əfsanələr yaradılır, xalq içərisində yayılırdı. Y.V.Çəmənzəminli, Y.A.Poxomov, A.P.Fituni, V.M.Sısayev, V.Vəliyev və digərləri əfsanələrin toplanması və nəşr edilməsində mühüm işlər görmüşlər.

Bəzi tədqiqatçılar əfsanələri bir neçə növə bölərək qruplaşdırmışlar. Azad Nəbiyevin, Paşa Əfəndiyevin və Sədnik Paşayevin kitabında, 1976-cı ildə çap edilmiş “Yurdumuzun əfsanələri” adlı kitabda əfsanələr fərqli formada qruplaşdırılır: “Azad Nəbiyevin kitabında əfsanələrin növləri: astral təsəvvürlər, səma cisimləri və bürclərlə əlaqəli əfsanələr; bitki və heyvanlar aləmi ilə bağlı əfsanələr; toponomik əfsanələr; tarixi şəxsiyyətlər, el tayfa və qövm ilə əlaqəli əfsanələr; dini əfsanələr.

Paşa Əfəndiyevin kitabında: heyvanlar, quşlar haqqında olan əfsanələr; yer adları, qalalar, abidələr ilə bağlı əfsanələr; tayfa, el, xalq, nəsil, totem adları ilə bağlı əfsanələr; Nizami Gəncəvi yaradıcılığı ilə bağlı əfsanələr; ailə-məişət, xalqın arzu-istəkləri haqqında əfsanələr; tarixi şəxsiyyətlərlə bağlı əfsanələr; səma cisimləri haqqında əfsanələr; dini əfsanələr. Sədnik Paşa Pirsultanlının kitabında: dağ, daş, qayalar; bulaq, çay, dəniz haqqında; çiçək, gül haqqında; quş, heyvanlar haqqında; Ay, Gün, Dədəgünəş haqqında; qədim qalalar haqqında; “Dədə Qorqud” əfsanələri, Nizami Gəncəvinin mövzuları ilə səsləşən əfsanələr, Koroğlu əfsanələri, “Apardı sellər Saranı”, müxtəlif mövzulu əfsanələr. 1976-cı ildə çap edilmiş “Yurdumuzun əfsanələri” kitabında: təbiət və insan haqqında əfsanələr; qəhrəmanlıq əfsanələri; ailə-məişət”. Sədnik Paşayev azərbaycanlıların yaşadığı yerləri gəzərək əfsanələr toplamış və mövzularına görə onları ayrıca qruplaşdırmışdır.

Azərbaycan əfsanələri uzun bir tarixi yol keçmişdir. Onu fərqləndirən cəhət məzmununun real və bədii, həqiqi təbiətə sahib olmasıdır. “Əfsanə” fars mənşəli sözdür, “dillərə düşən vaqeə”, “əsli olmayan hekayə” deməkdir. Əfsanələr e.ə V əsrdə yazıya alınsa da, müəyyən əfsanələr bu janrın çox qədim tarixə malik olduğunu söyləməyə şərait yaradır.

Araşdırmalara əsasən belə nəticəyə gəlmək olar ki, əfsanələr indiki dövrümüzə üç yol ilə gəlib çatmışdır:

a) Şifahi formada tam müstəqil əsər kimi: Qız qalaları, Ovçu Pirim, Dədə Günəş haqqında əfsanələr və sair.

b) Nağılların, eposların daxilində bir tərkib kimi: “Koroğlu” dastanındakı Misri qılınc, Düratın doğulması və sair.

c) Klassik sənətkarlarımızın əsərlərində: Əlinin “Qisseyi Yusif”, Nizami Gəncəvinin “Xəmsə”si. “Yanardağ” əfsanələri, “Azərbaycan xalq əfsanələri” adlı kitablarda mövzuların zənginliyi önə çəkilir və əfsanələr mövzuya görə qruplaşdırılır: Daş və qayalar; dağ; bulaq, çay, göl, dəniz; Sara haqqında; çiçək və gül; quşlar haqqında; Ay və Gün; ilan; maral və ceyran; Nuhla əlaqəli; qədim qalalar; Qız qalaları; Dədə Günəş; Nizami mövzuları ilə səsləşən; Koroğlu dastanı ilə səsləşən; müxtəlif mövzulu əfsanələr.

Bölgülər əsasında toplanan əfsanələr xalqımızın necə inkişaf etməsi, adət və ənənələri Aya, Günə, oda, atəşə, suya, torpağa inanma səbəblərini öyrənməyə imkan verir. Görkəmli araşdırmaçı M.Seyidov suya inanmanın əkinçilik və maldarlıqla bağlı olduğunu bildirmişdi.

"Yaşayan əfsanələr", "Azərbaycan xalqı əfsanələri", "Azərbaycan eposunun əfsanə qaynaqları", "Eldən-obadan eşitdiklərim", "Azərbaycan əfsanələrinin öyrənilməsi", "Nizami folklor", "Xalqın söz mirvariləri" kitablarında əfsanələr bir yerə cəmləşdirilmiş, çoxlu jurnal, qəzet məqalələri çap edilmişdir. Əfsanə tarixsiz deyildir, onda həyatın hər hansısa izi vardır.

Tarixi şəxsiyyətlərlə bağlı əfsanələr müxtəlif zamanlarda yaşamış sərkərdə, sənətkar, dahi insanlar haqqındadır. Astiaq kimi tarixi şəxslər tarixi əfsanələr aiddir.

Professor S.Pirsultanlıya görə Azərbaycan eposu əfsanə və rəvayətlərlə sıx şəkildə əlaqəlidir. Dastanların poetik strukturu əfsanə və rəvayətlərin strukturu ilə bağlıdır. Burada inam, etiqad kimi xüsusiyyətlər dastana əfsanə və rəvayət janrlarıyla daxil olur. Alimin fikrincə, dastanın strukturunun öyrənilməsi əfsanə janrının tədqiqini zəruri edir. Dini əfsanələrin yaranması xüsusilə İslam dini ilə əlaqədardır. Belə ki, bu cür əfsanələr Quranda, dini kitablarda yer almışdır. Bibliya, Zəbur, İncil kimi müqəddəs dini kitablarda dini əfsanələr öz əksini tapır.

Kosmoqonik əfsanələr səma cisimləri ilə bağlıdır. Ən çox Ay və Günəş haqqında kosmoqonik əfsanələr var. Ayın gecələr, Günəşin gündüzlər çıxması insanların marağına səbəb olurdu. Onların nişanlı, hətta bacı, qardaş olması haqqında müxtəlif əfsanələr söyləmişlər .

Məxəzlərin məlumatına görə "leqenda" yəni "əfsanə" termini orta əsrlərdə yaranıb və bu ad müqəddəs insanların həyatından bəhs olunan, xatirə günlərində oxunan əsərlərə verilmişdir. Əfsanələrin demək olar ki, çoxusunda çevrilmələr var. Bunun nəticəsində əfsanələr rəvayətə və ya əksinə rəvayət əfsanəyə çevrilə bilər. Nümunə kimi "Kirpi" əfsanəsini göstərmək olar. Əfsanədə oğlun səbəb olmadan evdən getməsi anasını çox sarsıdır. Ana Allaha yalvarır ki, məni elə bir şeyə çevir ki, oğlumu görüm, ancaq o məni görməsin. Ana kirpiyə çevrilir, başına batırdığı iynələrin sayı artır. Oğul bunu görəndə etdiyi hərəkətə görə çox peşman olur.

Bəzi bitkilərə uğur və uğursuzluq rəmzi kimi baxıldığından birmənalı olmayan münasibət yaranmışdı. Məsələn, yasəmən ağacı və çiçəyi zərdüştlük dinində uğuru, xoşbəxtliyi təmsil edirdi. Bu səbəbdən döyüşçülərin geyimlərinə yasəmən uğurun simvolu kimi həkk olunardı. Sonradan yasəmən hüznü ifadə etməyə başladı. Hüznü ifadə etməsi Həzrəti Əlinin qəbri üzərinə qoyulması ilə başladı. Ancaq məzmun baxımından Ağ gül, Qırmızı gül, Sarı gül qədimdən olan mənasını itirməmişdir.

Fərhad obrazı Azərbaycan folklorunda diqqət çəkən surətlərdəndir. "Nəğməkar Fərhad" əfsanəsi "Koroğlu" dastanımızla səsləşir. Çünki Koroğlunun nərəsi, səsi, qəhrəmanlığı Nigarın qəlbində məhəbbət toxumları səpdiyi kimi Fərhadın səsi də öz elçisi olur. Onun füsunkar səsi Pərinin səsinə bağlıdır. Pəri olduğu zaman Fərhadın ecazkar səsi könüllərdə məhəbbətin gücünə inamı artırır.

Sabit süjet kimi olmayan əfsanələrin vasitəsilə fantastik düşüncələr yaranır. "Kar daş", "Daş gəlin", "İncəbel", "Ocaq daşı", "Oğlan-qız" daşı və sair kimi əfsanələrdə toponimlərin izahları xalq etimologiyasında verilir.

Belinski əfsanələrin miflərdən fərqli olaraq real həyatla əlaqəli olduğunu düşünürdü. Azərbaycanda əfsanələr eramızdan əvvəl V əsrdə nəşr edilsə də, bəziləri zamanla unudulmuş, bəziləri isə yaddaşlarda qalmışdır. Əsatir ilə əfsanə arasında müəyyən səddlər qoymaq çətindir, çünki əsatirlərin yaradılması qədim dövrlərdə baş vermişdir. Rəsul Rza "Alagöz" adlı hekayə yazmışdır. Burada dahi şairimizin gənclik dövründən, Göy Gölün necə əmələ gəldiyindən danışılır. Göy Göl haqqında şairə atası danışır. Sonradan bu söhbət əfsanələşir, dastanların, eposların yaradılması üçün mənbə rolunu oynamağa başlayır.

Digər maraq cəlb edən əfsanələrdən biri də Nizami Gəncəvinin yaratdığı qəhrəmanlar haqqında olan əfsanələrdir, "Xosrov və Şirin" poemasında "Fatma nənənin darağı" əfsanəsi, İsgəndərin xəzinəsi haqqında əfsanə, "Ədalətli Nuşirəvan", "Şirinqala", "Şirin bulaq" və başqa əfsanələr var. Makedoniyalı İsgəndərin xəzinəsi haqqında əfsanəni V.M.Sısoyev Şamaxıdan toplamışdır. A.P,Fituni, S.Paşayev, V.M. Sısoyev Nizami Gəncəvinin qəhrəmanları haqqında əfsanələri toplamışlar.

Azərbaycana gələn alimlər, tarixçilər şifahi dildən əfsanələri toplayaraq xarici dildə çap edirdilər. Sübut olunur ki, Azərbaycan folkloruna xarici alim və yaradıcılar, tarixçilər xüsusi maraq göstərmişlər. Əfsanələrimiz xalq arasında yaradılıb yaşansa da, dövrümüzə kimi yazılı ədəbiyyatda gəlib çata bilmişdir.

## NƏTİCƏ

Əfsanə epik növün janrlarından biridir. Əfsanələrdə xalqın həyatı, adət və ənənələri təsvir edilir. Sədnik Paşayev, A.P.Fituni, V.M.Sısoyev, Paşa Əfəndiyev əfsanə janrını tədqiq etmişdir. XIX əsrdən başlayaraq əfsanələr toplanır və nəşr olunur. Əfsanələr şifahi formada yaranmışdır. Uzun bir müddət əfsanələr nağılların bir növü sayılırdı. Sonradan əfsanələrin xüsusiyyətləri müəyyən edilmişdir.

**Ədəbiyyat**:

1.AZərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqlər, XI, Bakı, 2002.

2. Azərbaycan folklorşünaslığının problemləri, Paşa Əfəndiyev, Bakı, 2011, Elm və təhsil.
3.Azərbaycan türklərinin xalq əfsanələri, prof.dr. Sədnik Paşa Pirsultanlı, Bakı, Azərnəşr, 2009.
4.Azərbaycan şifahi xalq ədəbiyyatı, Paşa Əfəndiyev, Bakı, 2015, Elm və təhsil.
5.Azərbaycan xalq ədəbiyyatı, Azad Nəbiyev, Bakı, Elm, 2006, II.
6.Əfsanələr, Gənclik, 1986.
7.Azərbaycan folkloru antologiyası, II, Bakı, 1969.
8. Əsatirlər, əfsanə və rəvayətlər, Şərq-Qərb, Bakı, 2005.

## Classification of legend genre

**Summary**

Legend is one of the epic genre of folklore. They reflect the life, customs and traditions of the people. The legend was the subject of research by such scientists as Sadik Pashayev, A.P. Fituni, V. Sysoev, Pasha Afandiev and others. Since the 19th century, legends have been written and published. For a long time legends were identified with fairy tales. But scholars of this genre have identified its genre specific features.

## Классификация жанра легенда

**Резюме**

Легенда – это один из фольклорных жанров эпического рода. Они отражают жизнь, быт, обычаи и традиции народа. Легенда была предметом исследования таких ученых как Садик Пашаев, А.П. Фитуни, В.Сысоев, Паша Афандиев и др. Начиная с XIX века легенды были письменно оформлены и опубликованы. Долгое время легенды идентифицировались со сказками. Но ученые-исследователи этого жанра определили его жанровые специфические особенности.

**Rəyçi: f.e.d. Ş.Cəlilova**

DOI: 10.36719/AEM/2007-2019/49/40-42
**Aynur Qələndər qızı Mustafayeva**
Bakı Dövlət Universiteti
aynur.mustafa@inbox.ru

# MİRZƏ CƏLİLİN YARADICILIĞINDA KAMİL İNSAN OBRAZI

***Açar sözlər:*** *Mirzə Cəlil, İskəndər, Rind və Zahid, Məcnun*
***Key words:*** *Mirza Jalil, Iskender, Rind and Zahid, Mejnun*
***Ключевые слова:*** *Мирза Джалил, Искендер, Ринд и Захид, Меджнун*

Mirzə Cəlilin yaradıcılığının başqa sahələri kimi, dramaturgiyası da yeni-yeni tədqiqat əsərləri yazmaq üçün zəngin material verən bir xəzinədir. Onun dramaturgiyasının şah əsəri “Ölülər”dir. M. İbrahimov qeyd edir ki, “Cəlil Məmmədquluzadənin “Ölülər” əsəri din, mövhumat və feodal həyat tərzi əleyhinə mübarizəsini əks edən bir əsərdir. Azərbaycan ədəbiyyatında istər inqilaba qədər və istərsə də ondan sonra mövhumat əleyhinə yazılmış əsərlər içərisində “Ölülər” qədər güclü klassik əsər yoxdur”. (4, s.138) Amma onu da qeyd etməliyik ki, bu əsəri təkcə dini mövhumatın ifşasına həsr olunmuş bir əsər kimi şərh etmək doğru deyil. Çünki əsərdə toxunulan problemlər ailə, əxlaq, kəbin, təhsil, tərbiyə, qadın hüququ məsələlərindən tutmuş, milli şüurumuzun və ictimai həyatımızın bütün sahələrini əhatə edir.

Firidun Hüseynov “Molla Nəsrəddin və Molla Nəsrəddinçilər” monoqrafiyasında qeyd edir ki, “Ölülər” janrca komediya olsa da, ictimai məzmun və ideyasına görə faciədir. (3, s.107) Fikrimizcə, “Ölülər” əsərini komediya hesab etmək düzgün olmaz. Bu əsər məzmun və ideyası ilə yanaşı, elə janrca da faciədir.

Mirzə Cəlil İskəndər obrazını yaratmaqla göstərir ki, “ölülər aləmi”ndə həqiqətə, sağlam şüura yer yoxdur. Lakin bunu təkcə XIX əsrdə deyil, eyni zamanda XIV əsrdə Əssar Təbrizinin “Mehr və Müştəri” əsərində İstəxr şahı Şapurun simasında da görürük. Sanki onun sarayı Şeyx Nəsrullah və həmin cəmiyyətin əksidir. Belə ki, onun sarayı da fitnə-fəsad yuvasıdır. İskəndərin yaşadığı cəmiyyətdəki kimi burada da ağıl və düşüncənin yeri dar, yalan və hiylənin meydanı genişdir.

M. İbrahimov öz monoqrafiyasında düşündürücü bir sualla çıxış edir, əslində isə elə o sualın içərisində cavabı da verir: “Bəs necə olur ki, yüzlərlə yeyən, içən, hərəkət edən, düşünən, özlərini ağıllı hesab edən (təbii ki, M. İbrahimov bu sözləri istehza ilə qələmə alıb. Axı əsl ölülər düşünə bilməzlər! –A.M) yekə-yekə adamlar “ölülərin dirilməsi” kimi axmaq, mənasız bir şeyə inanır, həm də belə heyrət ediləcək bir şəkildə aldanırlar”. (4, s.138) Mirzə Cəlil isə bu suala cavabı “ölülər dünyası”nın, daxili cəhalətin içərisində, daxili çürüklüyündə axtarıb göstərir.

Pyesin ideyası sovet dönəmində bir çox ədəbiyyatlarda dinə, mövhumata qarşı mübarizə kimi qeyd olunsa da, ədib İskəndər obrazını yaratmaqla əsl və ən vacib ideyanı oxucuya çatdırmaq istəyib: **həyat, varlıq və həqiqət!**

Əsərdə həzin bir kədər də vardır. Bu kədər Nazlı və yüzlərlə Nazlı kimi namuslu, istedadlı gənclərin ölülər aləminin cəhalət içərisində boğulub getməsindən doğur.

İskəndərin valideynləri özlərini bədbəxt hesab edirlər ki, o, mömin, başıaşağı, dinpərəst deyil, haqq yolundan azmışdır. Lakin heç kim başa düşmür ki, İskəndər elə haqq yolunun yolçusudur. Anasının sadəlövhlüyünü görüb, dərin kədər duyğusu ilə “yazıq ana” deməsi, doqquz yaşlı Nazlını şeyxə siğə etmək istəyən atasını “dəli” adlandırıb təhqir etməsi İskəndərin onlara olan ürək yanğısından irəli gəlir. O heç də boş-boş dolaşmaq və içki içməklə gününü keçirmir, İskəndər hərəkət etmək, fəaliyyət göstərmək, yaratmaq üçün çırpınan bir ruha malikdir. Onun ilk, əsas fəaliyyəti odur ki, “ölülər aləmi”nə tabe olmur. İkinci fəaliyyəti isə odur ki, bu aləmə qarşı mübarizə aparır.

F. Hüseynov İskəndər obrazından danışarkən qeyd edir ki, “bütün səhnələrdə yaramazlıqları izləyən, şeyx Nəsrullahın sözü ilə işi arasındakı dərin uçurumu görüb göstərən, avam camaata həqiqəti anlatmağa çalışan İskəndər həm təkdir, həm də hakim feodal adətləri və islam zehniyyəti qarşısında zəif və gücsüzdür”. (3, s.111) Tədqiqatçının fikri müəyyən qədər doğru olsa da, birtərəfli səslənir. İskəndəri zəif və gücsüz adlandırmaq doğru deyil. Əgər o, gücsüz olsaydı, bütün cəmiyyətə qarşı mübarizə apara bilməzdi. O, tək idi, lakin gücsüz deyildi.

“Ölülər” pyesi səhnəyə ilk dəfə qoyulanda İskəndər haqqında çox yanlış mülahizələr irəli sürmüşlər. Onu gah yalançı, duyğusuz, cani, gah da xalqı elmdən uzaqlaşdıran, bütün elmi, maarifi, onun əsl məna və əhəmiyyətini məhv edən sərsəm adlandırmışlar. Ədəbin dramaturgiyasının şah əsərinin əsas qəhrəmanı İskəndər haqqında belə əsassız ittihamlar Mirzə Cəlilin elminə, düşüncəsinə zərbə vurmaqdan başqa bir şey deyildi. Onu da nəzərə almalıyıq ki, o lüzumsuz sözləri irəli sürənlər elə Şeyx Nəsrullah kimilərdir. Lakin bu

yanlış ittihamlar çox çəkməmişdir. X.Əlimirzəyevin də öz kitabında qeyd etdiyi kimi, "40-cı illərdən başlayaraq M. İbrahimov, Mir Cəlal, Ə. Şərif, Ə. Sultanlı, C. Cəfərov, C. Xəndan və b. görkəmli tədqiqatçılar öz məqalə və kitablarında İskəndər haqqında yanlış mülahizələrə son qoymuş, daha düzgün fikirlər irəli sürmüşlər". (1, s. 109)

Mirzə Cəlilin "Ölülər" əsəri ilə Füzulinin "Rind və Zahid" əsəri arasında oxşar cəhətlər var. Mir Cəlal Paşayev "Füzuli sənətkarlığı" adlı monoqrafiyasında "Rind və Zahid" əsərindən danışarkən ilk cümləsi bu olur: "Cəmiyyət tarixi boyu həmişə iki bir-birinə zidd qüvvələrin, qara və işıqlı qüvvələrin mübarizəsindən ibarət olmuşdur". (5, s.158) Bu cümləni bütün cəmiyyət tarixinə aid etdiyimiz kimi, "Ölülər" əsərinə də aid edə bilərik. İskəndər işıqlı, Şeyx Nəsrullah qaranlıq qüvvəni təmsil edir.

"Özünü zahid adlandıran və "təqva şüar edən" adamlar adətən həyat və həqiqət hissini itirmiş, mövhumata, xuravata qapılmış adamlar olduğundan xalq arasında heç bir hörmət və rəğbət qazana bilməmişlər". (5, s.159) Füzulinin dövründə xuravata, mövhumata qapılan insanlar cəmiyyət tərəfindən qəbul edilmirdisə, Mirzə Cəlilin dövründə isə elə cəmiyyətin özü mövhumat içində boğulurdu.

"Rind və Zahid" əsərində Zahid Rindi məscidə ibadət etməyə dəvət edəndə Rind imtina edir. Füzuli bununla dini ehkamlara qarşı çıxmır. Rindin məscidə daxil olmaq istəməməsinin səbəbi o idi ki, ora Allahın evidirsə, deməli kamil insanların məqamıdır. Rind orada ibadət edənlərin də kamil, yaxud riyakar olduğunu bilmirdi. Füzuli bu məqamı qələmə almaqla oxucuya çatdırmaq istəyir ki, məsciddə ibadət edənlərin hamısı daxilən də Allaha ibadət edirlərmi?!

Mirzə Cəlil də Şeyx Nəsrullah obrazı ilə İslam dinini inkar etmir, din pərdəsi altında öz işini görən riyakar, hiyləgər insanları tənqid edirdi. Şeyx Nəsrullaha inananların da çoxu namaz qılıb ibadət edənlər idi. Amma onlarda da daxili ibadət yox idi. Bu yalnız İskəndərdə idi. İskəndər də Rind kimi mey içib başqa aləmi görür və öz ailəsini bataqlıqdan çıxarmağa çalışır.

İskəndər bu cəmiyyəti qəbul etmir və ona qarşı çıxır. İskəndərin bu xüsusiyyəti qismən Məcnun obrazını xatırladır. Məcnunla İskəndərin oxşar cəhəti o idi ki, hər ikisi yaşadığı cəmiyyətin tələb etdiyi qayda-qanunları qəbul etmirdi, onların təsiri altında yaşamağı inkar edirdi. Yəni, hər iki obraz mühitin danlağından çəkinməyərək mübarizə aparır: Məcnun sevgi uğrunda, İsgəndər isə cəhalətə qarşı. Fərqli cəhəti isə o idi ki, Məcnun cəmiyyətdən uzaqlaşıb səhraya gedir, İskəndər isə cəmiyyətin içində qalaraq ona qarşı mübarizə aparırdı.

İskəndər, Rind və Məcnun həyata adi şəkildə baxıb cəmiyyətləşmirlər. Onların hər üçü başqa düşüncənin sahibidirlər. Onlar həyata məna, həqiqət nöqteyi-nəzəri ilə baxmağı bacarırlar.

Rindin meyxanəyə girib əsl həqiqəti görməsi və İskəndərin də içki içib həqiqəti görüb və söyləməsi, insanları cəhalət yuxusundan ayıtmaq istəyi arasında möhkəm bağı görürük. Belə ki, Zahid Rində abad olan bir binanı izah etməyə çalışarkən buranın meyxanə, "şeytan yuvası" olduğunu qeyd edir. Rind içəri daxil olanda orada əyləşən qoca nurani kişidən suallarına cavab tapır. Qoca Rində "sən əsl həqiqətdən xəbərsizsən" dedikdə əsərin ən vacib ideyası ortaya çıxır. Burada içilən şərab ağılı başdan çıxartmır. Rind saqinin gətirdiyi şərabı içərək bir növ özünün ariflik istedadını kəşf edir, qara pərdə gözündən qalxır, artıq o mövcud aləmi yox, yeni bir aləmi görür. Hər kəs bilir ki, Rində verilən şərab vəhdəti-vücud şərabıdır. Bəs İskəndərin içdiyi mey də vəhdət şərabı idimi? X. Əlimirzəyev, F. Hüseynov, M. İbrahimov və digər tədqiqatçılar qeyd edirlər ki, İskəndər heç vaxt ayıq başla o sözləri söyləyə bilməzdi, elə buna görə sərxoşluq onda rəmzi xarakter daşıyır. Fikrimizcə, İskəndərdə sərxoşluq rəmzi deyildi. O, heç sərxoş da deyildi. Əsl sərxoşlar şeyxə uyub qızlarını ona siğə edən cahil insanlar idi. İskəndərin içdiyi içki vəhdəti-vücud fəlsəfəsinə əsaslanırdı. Əgər Füzulinin əsəri başdan-ayağa təsəvvüfdən ibarət idisə, Mirzə Cəlilin tənqidi realizmin bir nümanəsi olan bu əsərində təsəvvüfün izlərini İskəndərin simasında görürük. Təsəvvüf yalnız romantik yazıçıların yox, realist yazıçıların da əsərlərində ola bilər. Necə ki, romantiklərin yaradıcılığı real gerçəklikdən, realistlərin əsərləri isə bədii xəyaldan, romantikadan uzaq deyildir. Xalid Əlimirzəyev də yazır ki, "hər iki metoda məxsus sənətkarların yaradıcılığında romantizm ilə realizm həmişə vəhdətdə, müştərək şəkildə meydana çıxır, təzahür edir". (2, s.383)

Ümumiyyətlə, qeyd etməliyik ki, Mirzə Cəlilin yaratdığı İskəndər obrazı Azərbaycan ədəbiyyatında kamil insan obrazıdır. Əgər təsəvvüf ədəbiyyatında bu məqama Məcnun çatırsa, Mirzə Cəlil realizmində İskəndər həmin zirvəyə çatır.

**Ədəbiyyat:**

1. Əlimirzəyev X.A. Dahi sənətkar, böyük vətəndaş, Bakı: Elm və təhsil, 2010, 684 s.
2. Əlimirzəyev X.A. Ədəbiyyatşünaslığın elmi-nəzəri əsasları. Bakı: "Nurlan", 2008, 432 s.
3. Hüseynov F.C. Molla Nəsrəddin və Molla Nəsrəddinçilər, Bakı: Yazıçı, 1986, 279 s.
4. İbrahimov M.Ə. Böyük demokrat, Bakı: Azərbaycan SSR EA, 1957, 214 s.
5. Paşayev M. C. Füzuli sənətkarlığı. Bakı: ADU nəşriyyatı, 1958, 270 s.

**A miracle of humanity in creation of Mirza Jalil**

**Summary**

Jalil Mammadguluzadeh, who is also known as a dramatist in the history of our literary literacy, is in the history of our public opinion, and has been an artist who has lived in a new style, with advanced, democratic ideas. The struggle of this work has shown that this work actually played a great revolutionary role in the struggle against the spiritual, evolution of our people, and at the same time completely satisfied the expectations of progressive intellectuals.

**Образ совершенного человека в творчестве Мирза Джалиля**

**Резюме**

Джалил Мамедгулузаде, который также известен как драматург в истории нашей литературной грамотности, вошел в историю нашего общественного мнения. Он жил передовыми, демократическими идеями и боролся за них. История показала, что эта работа действительно сыграла большую революционную роль в борьбе за развитие, эволюцию и процветание нашего народа и в то же время полностью оправдала ожидания прогрессивно мыслящих людей.

**Rəyçi: dos. L.Əliyeva**

DOI: 10.36719/AEM/2007-2019/49/43-48

**Rəşid Əmənulla oğlu Fətəliyev**
AMEA, Akademik Həsən Əliyev adına Coğrafiya İnstitutu

# SƏMƏD VURĞUNUN "AZƏRBAYCAN" ŞEİRİNİN POETİK TƏHLİLİNƏ DAİR

***Açar sözlər:*** *Səməd Vurğun, "Azərbaycan" şeiri, Vətən, vətənpərvərlik*
***Key words:*** *Samad Vurgun, "Azerbaijan" Poetry, Homeland, Patriotism*
***Ключевые слова:*** *Самед Вургун, стихотворение «Азербайджан», Родина, патриотизм*

Bəzən yazıçılar, şairlər elə bil irəlicədən duyurmuşlar kimi, əsərlərində öz gələcək talelərini üstüörtülü şəkildə əks etdirmişlər. Çox ehtimal ki, S.Vurğun da öz gələcək taleyinin bəzi cizgilərini "Azərbaycan" şeirində qeyd etmişdi. Şeirin dördüncü bəndində o, saçlarına vaxtsız dən düşməsindən və gələcəkdə qınanılmasından söz açmışdı. Bu şeiri 28 yaşı olan şair niyə belə yazmalıydı, onu narahat edən nə idi? Maraqlıdır, nədən onun bu ən məşhur şeiri məhz 22 bənddən ibarətdir? Cəmi 50 il yaşayan həssas şair bəlkə bu şeirlə, sövqi-təbii olaraq, qalan 22 illik ömrünün gizli işarəsini, şifrəsini vermişdi? Bu təsadüfdür, yoxsa mistika? – demək çətindir. Rəqəmlərlə bağlı hər hansı inancım olmasa da, burada düşündürücü məqamların varlığı mümkündür. Əminəm ki, onun yaradıcılığında sirləri açılmamış hələ çox laylar var, amma təqdim olunan yazının məqsədi, bu bənzərsiz şeirə bir qədər fərqli rakursdan baxıb, onu təbiət mütəxəssisinin gözü ilə incələməkdir.

Adətən, istənilən xalqın ədəbiyyatında vətənin tərənnümünə həsr edilmiş çoxlu sayda poeziya nümunəsinə rast gəlmək olur. Azərbaycan ədəbiyyatı da bu cəhətdən istisna deyil. Məşhurlarla bərabər, imzaları çox və ya az tanınan əksər şairlərimiz zaman-zaman bu həssas mövzuda qələmlərini sınamışlar, lakin onların heç də hamısı kifayət qədər yüksək sənət örnəyi ortaya qoya bilməmişlər. Amma bu mövzuda sevdiyim 3-4 şeir var ki, hər dəfə onları oxuyanda və ya dinləyəndə qəlbim coşur, könlüm riqqətə gəlir. Bunlar, böyük dramaturq Cəfər Cabbarlının "Ölkəm", dahi Səməd Vurğunun və ulu Şəhriyarın "Azərbaycan" və bir də nakam şairimiz Almas İldırımın "Azərbaycan, mənim taxtım, tacım oy..." şeirləridir. Bu şeirlərin hər birində coşqun hiss, həyəcan, güclü Vətən sevgisi, millət təəssübkeşliyi olsa da, onlarda, təbii ki, öz müəlliflərinin xarakterinə, üslubuna məxsus çalarlar əks olunmuşdur. Azərbaycanın poeziya kəhkəşanında həmin şeirlərin hər biri layiqli yerini tutmaqdadır, lakin bu və ya digər poeziya ulduzları arasında öz şüasının gücü, işığının parlaqlığı ilə fərqlənən, kiçikdən böyüyə qədər hər bir azərbaycanlının, heç olmasa, bir bəndini əzbər bildiyi tək bir şeir - S.Vurğunun "Azərbaycan" şeiridir.

Dahi sənətkar bu şeiri 1934-cü ildə, ilhamının, istedadının çağlayan vaxtlarında - 28 yaşı olanda yazmışdır. Cəmi 22 bənddən, 110 misradan və irili-xırdalı 378 sözdən ibarət olan bu möhtəşəm poeziya nümunəsində nələr yoxdur?! Onu mübaliğəsiz, Vətənin kiçik ensiklopediyası adlandırmaq olar. Bəli, ustad şair cəmi 378 sözlə poeziya dilində Azərbaycanın kiçik ensiklopediyasını yaratmış - onun tarixini, coğrafiyasını, mədəniyyətini, iqtisadiyyatını və hətta, gələcək inkişafının proqnozunu əks etdirmişdir. Həqiqətən, çox zəngin informasiya yüklü bu şeirdə məkan haqqında ensiklopedik bilgilərə məxsus bir struktur, nizam müşahidə edilməkdədir.

Böyük şair şeirin ilk bəndlərində (1-4-cü) sanki mövzuya giriş verərək, məram və məqsədlərini açıqlayır, məqsədə çatmaq üçün kifayət qədər hazırlaşdığını, bununla belə, bu işin heç də asan olmayacağını bildirir. Sonra Vətənə, xalqa ulu sevgisini, uşaq-ana bağlılığını tərənnüm edir, keçirdiyi mənəvi-psixoloji hisslərini oxucu ilə bölüşür. Şair qısa müddətə olsa da, Vətəndən ayrı düşməyin necə ağır dərd olduğunu, zamanın - ayların, illərin onu necə sıxdığını və bu səbəbdən saclarına vaxtsız dən düşməsini, çəkdiyi iztirabları, çox şey demək istədiyini, lakin deyə bilmədiyi üçün əvvəlcədən, öncəgörənliklə xalqından onu qınamamasını dilə gətirir:

Saçlarıma dən düşəndə
Boğar aylar, illər məni,
Qınamasın ellər məni.

Məkan haqqında bütün ensiklopedik məlumatlardakı struktura uyğun olaraq, mövzuya giriş verdikdən sonra 5-6-cı bəndlərdə vətənpərvər şair Vətənin tarixindən bəhs edir:

Böyük bir keçmişin vardır;
Bilinməyir yaşın sənin,
Nələr çəkmiş başın sənin.

- deyərək, Vətənin nə qədər qədim bir tarixə malik olduğunu və bu tarixdə xalqın nə müsibətlərə düçar olduğuna, "uğursuz dillərə düşdüyünə" baxmayaraq, illərin sınağından üzüağ çıxmasını qeyd edir və göstərir ki, bu gün Vətən övladının bəxtiyarlığı üçün millət əsrlərə sinə gərərək öz halal şöhrətini qorumuş və "nəsillərdən nəsillərə" ötürmüşdür. Şairin tariximizin qədimliyi haqqında poetik dillə dediyi həqiqət arxeoloqlarımız tərəfindən aşkar edilib elmi cəhətdən öyrənilmiş qədim insan düşərgələrində və yaşayış məskənlərində (Qobustan, Daşsalahlı, Azıx) öz təsdiqini tapdı: on və hətta, yüz min illərlə əvvəl bu torpaqlarda insanların məskən saldığı sübuta yetirildi.

Çox maraqlı məqamlardan biri də şeirdə Azərbaycan təbiətindən, coğrafiyasından gen-bol bəhs edilməsidir. Vətənin tarixi barədə qısa məlumat verdikdən sonra sənətkar onun coğrafiyasını nəzmə çəkir, misralar qayalardan süzülüb axan gur şəlaləyə bənzəyir:

Sıra dağlar, gen dərələr,
Ürək açan mənzərələr...
Ceyran qaçar, cüyür mələr,
Nə çoxdur oylağın sənin!
Aranın, yaylağın sənin.

Gördüyümüz kimi adi sözlərin harmoniyasından gözümüz önündə bəndlərin ayrı-ayrı misralarında kifayət qədər zəngin coğrafi bilgilər yer almışdır. Şeirdə Azərbaycana məxsus 12 toponim - Bakı, Qarabağ, Muğan, Lənkəran, Xəzər, Kəpəz, Göy-göl kimi bölgə, şəhər, dəniz, dağ, göl və s. xüsusi adlara rast gəlirik. Əslində, bunlar hamısı göz önündə möhtəşəm bir mənzərə canlandırır. Bu, şair-rəssamın söz boyaları, misra fırçaları ilə çəkdiyi əzəmətli bir tablodur! Təkcə 9-cu bəndi oxumaq yetər ki, Azərbaycanın fiziki coğrafiyası haqqında tam təsəvvür yaransın. Azərbaycan barədə bilgisi olmayan insanın bu şeiri oxuduqdan sonra vətənimizin dünya xəritəsində coğrafi mövqeyi, təbiəti haqqında kifayət qədər dolğun məlumat əldə edə biləcəyi şübhəsizdir. Şeirdə coğrafi terminlərin bolluğu diqqət çəkir: təkcə "dağ" sözü doqquz dəfə, "qar" sözü üç dəfə, "dərə" və "yaylaq" sözləri iki dəfə, o cümlədən "aran", "düz", "sahil" və s. bu kimi coğrafi anlayışlar bildirən sözlər işlənmişdir.

Ölkəmizin coğrafiyasını yaxşı bilən sevimli şairimiz doğma diyarın nəinki relyefi, fauna və florası, hətta, onun iqlim xüsusiyyətləri haqqında məlumat verməyi də unutmamış, Vətən torpağının zəngin bitki örtüyünə və heyvanlar aləminə malik olduğunu qeyd etmişdir. Bağlarımızda gül-çiçəklə bərabər, çinar, limon ağaclarının bitməsi, tarlalarımızda taxıl, üzüm və pambıqla bərabər, çay bitkisinin yetişdirilməsi, dağlarımızda-düzlərimizdə ceyran-cüyür sürülərinin gəzməsi, göllərimizdə "yaşılbaş sonalar"ın üzməsi, bu yerlərin çox rəngarəng iqlim və landşaft xüsusiyyətlərinə, quru çöl, mülayim, subtropik və s. iqlimə malik olması haqqında oxucuda geniş təsəvvür yaradır.

Şair:

Afrikadan, Hindistandan
Qonaq gəlir bizə quşlar,
Zülm əlindən qurtulmuşlar...

- misraları ilə köçəri quşların qışlamaq üçün bizim torpaqlara uçub gəlməsindən bəhs etsə də, dolayısı ilə ölkəmizin həm əlverişli iqlim şəraitinə və həm də digər yerlərdən fərqli olaraq, burada sakitliyin, əmin-amanlığın hökm sürdüyünə diqqət çəkir və eləcə də o dövrün beynəlxalq siyasi vəziyyətinə üstüörtülü toxunaraq, müstəmləkə zülmündən əziyyət çəkən xalqların milli azadlıq mübarizəsinə işarə edir.

Sonrakı bəndlərdə (11-13-cü) ünlü şair iqtisadiyyatın kənd təsərrüfatı bölməsindən bəhs edir, torpaqlarımızda əsas strateji məhsul olan taxılın, eyni zamanda, pambığın, üzümün və habelə, çay

bitkisinin bol-bol yetişdirilməsi və onların da xalqımızın rifah halına, sağlamlağına xidmət etməsindən poeziya dili il söhbət açır.

Bu bölmədə yer almış aşağıdakı iki misraya fikir verin:

Anamın dilbər gəlini!
Yadlara açma əlini.

İlk baxışda çox bəsit görünən, cəmi altı sözdən ibarət bu iki misrada nə qədər dərin məna yüklü informasiya olduğunun fərqindəsinizmi!? Burada xalqın mentaliteti, etikası, etnoqrafiyası və iqtisadiyyatı əksini tapmışdır. S.Vurğun xalqın maddi-mənəvi dəyərlərinə, adət-ənənələrinə dərindən bələd idi, onun təəssübkeşi idi. "Anamın dilbər gəlini!" - deməklə o, xalqımızın tarixən formalaşmış qayınana-gəlin münasibətlərini önə çəkir və bu münasibətlərin digərlərinə örnək olmasını arzulayır. "Yadlara açma əlini" misrası ilə böyük şair sanki gələcək perspektivləri müəyyən edərək, demək istəyir ki, iqtisadiyyatımızı elə qurmalıyıq, məhsulumuz o qədər bol olmalıdır ki, heç kimə, xüsusən də yadlara əl açmayaq. Dahi şair Azərbaycan qadınını - gəlinini, qızını xalqın namus, qeyrət qalası hesab edir və bir xalqın qızı, gəlini yadlara əl açarsa, o, millətin faciəsidir, sonudur - fikrini ortaya qoyur. Eyni zamanda, o, qürurumuzu ayaqlar altına atmamaq, mənəviyyatımızı qorumaq üçün ilk öncə, çalışmağın və ölkədə bolluq yaratmağın vacibliyini vurğulayır.

Böyük şair Vətən övladlarının sağlamlığını da unutmamışdır, "Azərbaycan" şeirinin 13-cü bəndinin son üç misrası sanballı bir məsləhət kimi səslənir:

Hər üzümdən bir şirə çək
Səhər-səhər ac qarına,
Qüvvət olsun qollarına.

Burada tədbirli şair "hər üzümdən" deyərkən, şübhəsiz ki, təkcə üzüm şirəsini deyil, ümumiyyətlə, təbii olan digər meyvələri də (əncir, tut və s.) nəzərdə tutur. Belə meyvələrin səhər-səhər ac qarına yeyilməsinin faydası el arasında da, tibdə də çoxdan məlumdur.

Şeirin ən uğurlu bölmələrindən biri də 14-18-ci bəndlərdə Azərbaycan mədəniyyətinə dair xeyli sayda informasiyanın poeziya dili ilə sərgilənməsidir. Bu bəndlərdə biz xalqımızın ədəbiyyatına, incəsənətinə, musiqisinə və etnoqrafiyasına dair kifayət qədər önəmli bilgilərin yer almış olduğunu müşahidə edirik.

Şair "Min Qazaxda köhlən ata" deməklə Azərbaycan xalqının ta qədimdən atla bağlılığına, burada təmizqanlı cins atların ("Qarabağ", "Dilboz" və s.) yetişdirilməsinə, dolayısı ilə türkçülüyə işarə edir. Və ya:

Bizim xalı - xalçalardan
Sər çinarlar gölgəsinə.

- deyərək, xalqımızın zəngin xalçaçılıq ənənələrinə, xalça sənəti üzrə çeşidli məktəblərə (Quba-Şirvan, Qazax-Qarabağ, Təbriz və s.) malik olduğunu bildirmək istəyir. Xalqımız haqqında etnoqrafik məlumatların poetik dillə ifadəsi xeyli maraqlı məqamlardandır.

İstəkli şairimiz:

Axşamüstü qoy uzaqdan
Havalansın Xanın səsi,
Qarabağın şikəstəsi.

və "Aşıq deyər sərin-sərin" misraları ilə xalqımızın zəngin musiqi mədəniyyətinə, o cümlədən muğam və aşıq sənəti ənənələrinə malik olduğunu diqqətə çatdırır və Vətənimizin "şeir, sənət ocağı" kimi tanındığını vurğulayır. "Azərbaycan" şeirinin 16-cı bəndində iki dəfə "Qarabağ" sözünü işlətməsi ilə vətənpərvər şair bir tərəfdən Vətənin bu parçasına necə yüksək önəm verdiyini göstərir, digər tərəfdən də o cənnət kimi yerlərin faciəli gələcəyini görürmüş kimi, sövqi-təbii olaraq, narahatlığını bildirirdi. "Könlüm keçir Qarabağdan" ifadəsi ilə duyğusal şairin indi milyonlarla azərbaycanlı üçün könül dağına çevrilmiş o şahanə yerlərə həsrət qalacağımızı sanki əvvəlcədən duyması heyrət doğurur. Qarabağın himninə çevrilmiş möhtəşəm "Qarabağ şikəstəsi"nin sonunda həmin bəndin oxunması da bu şeirin əzəmətinin göstəricisidir.

Şeirin 18-ci bəndi bütövlükdə Azərbaycan ədəbiyyatına, ona verilən dəyərə həsr edilmiş və böyük şair dahi Nizamini və Füzulini xatırlayaraq, əsl sənət əsərlərinin və sənətkarın ölməzliyi

fikrini önə çəkmişdir. O, "Deyilən söz yadigardır" ideyasına əminlik bildirərək, bütün Vətən yazarlarını hünər və cəsarətlə qəlblərindəkini deməyə, yazmağa səsləyir.

Səməd Vurğun şeirlərində heç bir sözü, misranı gəlişi gözəl olsun deyə və ya qafiyə xatirinə yazmayıb. Onun yaradıcılığında hər sözün, hər misranın öz yeri, öz məna yükü var. Məsələn, şeirin 17-ci bəndindəki ilk iki misrasını götürək:

Gözəl vətən! Mənan dərin,
Beşiyisən gözəllərin!

Baxın, dəyərli şair birinci misrada nə demək istəyir? Bilirik ki, Vətənimizin adının mənası haqqında çeşidli yozumlar mövcuddur, onun mənası tam dəqiqliyi ilə müəyyən edilməsə də, əksər tədqiqatçılar onun "odlar yurdu", "ərənlər ölkəsi" kimi yozulmasının tərəfdarıdır. Onu "xəzərlər ölkəsi" kimi yozanlar da var. Bu dərin mənanın araşdırılması toponimika elminin predmetidir. İstənilən halda, "Azərbaycan" sözünün mənası üzərində dilçi, tarixçi və coğrafiyaçı alimlərimiz hələ çox işləməlidirlər ki, şair də buna işarə etmişdir.

İkinci misradakı "gözəllər" deyərkən şair yalnız qadın gözəlliyini nəzərdə tutmur. Həmin misranın sonunda nida işarəsinin qoyulması dahi şairin həm də antropologiya elminin məlum nəticələrindən xəbərdar olduğunu göstərir və bununla o, Azərbaycan xalqının zahiri gözəlliyinin hələ qədimdən dəyişməyən avropoid irqinin Qafqaz qoluna məxsus, düzgün fizioloji quruluşa malik olduğunu əminliklə diqqətə çatdırır.

Vətənin tarixi, coğrafiyası, kənd təsərrüfatı, mədəniyyəti haqqında əhatəli məlumatlardan sonra şeirin 19-20-ci bəndlərində qüdrətli şair iqtisadiyyatımızın flaqmanı olan neft-qaz və energetika sənayesindən bəhs edir və "İşıqdadır qüvvət sözü" deyərək, paytaxt Bakının, bütövlükdə ölkəmizin gələcək inkişafının bu enerji növü ilə bağlı olacağını uzaqgörənliklə, iti şair fəhmilə duyurdu, görürdü. Unutmayaq ki, dahi şair bu şeiri yazanda hələ uzaq - 1934-cü il idi...

"Azərbaycan" şeirində mühüm bir ideya bütün şeir boyu qırmızı bir xətt kimi keçir. Bəndləri bir-birinə bağlayan bu qırmızı xətt böyük şairin Vətən sevgisi, Vətənə olan məhəbbətidir. O, bu məhəbbəti bənddən-bəndə yeni rənglərlə, yeni çalarlarla, amma tam səmimiyyətlə izhar edir və sanki onu təkrar-təkrar nümayiş etdirməkdən zövq alır, rahatlıq tapır. Şeirində 16 dəfə Vətənlə bağlı ifadə, o cümlədən dörd dəfə "Azərbaycan", dörd dəfə "vətən", "elim", "obam", "yurdum", "yuvam", "məskənim" və s. bu kimi istilahları sevə-sevə işlətməsi, şairin bu torpağa, bu Vətənə, bu yurda bağlılığının bariz nümunəsidir. Ölməz şair:

Anam, doğma vətənimsən!
Ayrılarmı könül candan?

- deyərək, Vətəni anası kimi doğma bilir, ona, ən əziz bir insana müraciət edən kimi, hər dəfə "Gözəl vətən!" deyə müraciət edir, Vətən-ana vəhdətindən söz açır və bu sevgisini, ülvi hissini ən yüksək mərtəbəyə, ən ali səviyyəyə - uşaq-ana, könül-can səviyyəsinə qaldırır.

Bunun əksini düşünənlər, heç olmasa, bu şeiri bir daha oxusunlar, anlayaraq, başa düşərək, hiss edərək oxusunlar. O insanlara həm də məsləhət görərdim ki, 7 mart 1997-ci ildə Səməd Vurğunun 90 illik yubileyinə həsr edilmiş gecədə ümummilli liderimiz Heydər Əliyevin bu gün onun adını daşıyan saraydakı nitqini tapıb dönə-dönə oxusunlar. Mən ömrümdə sənətkar haqqında nə belə möhtəşəm çıxış görmüşdüm, nə də eşitmişdim. 20-25 dəqiqəlik nitqi ilə Ulu Öndər sanki bir alim-filoloq kimi böyük şairin yaradıcılığını təhlil etdi və onun Azərbaycan poeziyasında layiqli qiymətini verdi. Onun hər kəlməsi, hər cümləsi S.Vurğun poeziyasına, S.Vurğun şəxsiyyətinə başdan-başa dərin hörmət, ehtiram və məhəbbətlə dolu idi. Dahi siyasətçinin dahi şair haqqında dediklərini sənətə, sənətkara verilən qiymətin zirvəsi hesab etmək olar. Doğrudan da əsl sənətə qiyməti ixtisasından, peşəsindən asılı olmayaraq, əsl sənətkar verə bilər - istər yazar olsun, istərsə də siyasətçi və s. Yoxsa, siyasətdə heç bir uğur qazana bilməyənlər və ya yazılarını ədəbsiz ifadələrlə bəzəyərək, guya yenilik etmək istəyənlər, gündəmdə qalmaq üçün böyük şairə hörmətsizlik göstərməklə, özlərinin nə qədər cılız və itedadsız olduqlarını sübut etmiş olurlar. Bu, ayrıca bir yazının mövzusu olsa da, ona bir-iki kəlmə ilə münasibət bildirmədən yan keçə bilmirəm.

Baxın, görün Ulu Öndər o nitqində nə deyirdi: "Səməd Vurğun böyük şairdir. Şərq aləmində şair həmişə ən yüksək hörmətə layiq olubdur. **Səməd Vurğun isə öz dövrünün şairlərinin şairi**

**olubdur.**" Və ya: "Şübhəsiz ki, Səməd Vurğunun əsərləri öz dövründə yazılıbdır. O dövrün hökmü, tələbləri S.Vurğunun əsərlərində də öz əksini tapıbdır. Bu gün heç kəs buna görə S.Vurğunun əvəzindən üzr istəməməlidir. S.Vurğunun bütün əsərləri ilə Azərbaycan xalqı əvvəldən axıradək fəxr edir, bundan sonra da fəxr edəcəkdir!" İndi o insanlardan sual olunur - məgər siz, siyasətdə zirvələr fəth etmiş, lider olmuş, tarixi, ədəbiyyatı, incəsənəti dərindən bilən və duyan dahi bir şəxsiyyətdən çoxmu bilirsiniz!? Əcəba, doğrudanmı, bəziləri bu qədər kar, kor və anlaqsızdırlar, yoxsa, başqa məqsədlər güdürlər? Amma əbəs yerə! Azərbaycan xalqının ilk Xalq şairinə qara yaxmaq, onun inkaredilməz yaradıcılığını inkar etmək, onu aşağılamağa cəhd etmək heç kimə müyəssər olmayıb, bundan sonra da olmayacaqdır! S.Vurğun yaradıcılığının heç kimin müdafiəsinə də ehtiyacı yoxdur, o, öz təsir gücü ilə nəhəng bir buzqıran gəmi kimi hələ çox buzları sındıracaqdır. O, qiymətli daş-qaşla yüklənmiş bir karvan kimi hələ çox səhralardan, çox səsli-küylü kəndlərdən və şəhərlərdən keçəcəkdir...

Heydər Əliyev bütövlüklə S.Vurğun yaradıcılığını və xüsusən, "Azərbaycan" şeirini çox sevirdi, yeri gələndə ondan bir bənd əzbər deyirdi. Ulu Öndər yuxarıda qeyd edilən nitqinin sonunda həmin şeirə münasibətini belə bildirdi: "Səməd Vurğunun "Azərbaycan" şeiri dillərdə əzbər olubdur. Bilirsiniz, o qısa sözlərdə o qədər dərin məna var ki, həmin sözləri hər bir insan dilinə gətirib, təkrar edərkən, ölkəsinə bir daha öz məhəbbətini, sevgisini, sədaqətini ifadə edir" və şeirin ikinci bəndini özünəməxsus gözəl avazla söylədi:

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən!
Anam, doğma Vətənimsən!
Ayrılarmı könül candan?
Azərbaycan, Azərbaycan! -

və sonra onun ruhu qarşısında baş əydiyimizi dilə gətirərək, "Yaşasın Səməd Vurğun yaradıcılığı!, Səməd Vurğuna eşq olsun!" şüarları ilə bənzərsiz nitqini yekunlaşdırdı.

Yəqin ki, dəyərli oxucular Ulu Öndərin daha bir çıxışını - 2001-ci ildə keçirilmiş Dünya azərbaycanlılarının I qurultayındakı məşhur nitqini da yaxşı xatırlayırlar. Həmin görüşdəki nitqini də ulu öndər "Azərbaycan" şeirinin dillər əzbəri olan ikinci bəndi ilə başa vurdu və son misraları söyləyərkən o dahi insanın necə kövrəldiyinin, qəhərləndiyinin şahidi olduq. O an ulu öndərlə bərabər hamımız - salondakılar da, görüşü izləyən milyonlarla tamaşaçı da o kövrək hissləri yaşadı. Budur, S.Vurğun poeziyasının sehri, tilsimi!

Və nəhayət, son iki bənddə (21-22-ci) S.Vurğun bu möhtəşəm şeirini xoş ovqatla bitirərək, Azərbaycanın uğurlu bir gələcəyə nail olacağına əminlik bildirir:

Güləcəksən hər bir zaman,
Azərbaycan, Azərbaycan!

Şair sanki dissertasiya işini, elmi monoqrafiyasını tamamlayır, onu nəticəyə bağlayır və gələcəyin proqnozunu verir. Təbii ki, bu, elmi əsər deyil, dərslik deyil, ilk öncə alovlu şair ruhu, şair eşqi ilə yoğrularaq, Vətən haqqında yazılmış zəngin informasiya yüklü bir şeirdir, dəyərli bir poeziya nümunəsidir və onu Vətən haqqında ballada da adlandırmaq olar, kiçik ensiklopediya da!

Bir daha Ulu Öndərin həmin çıxışında S.Vurğun şəxsiyyətinə verdiyi qiyməti oxucuların və bəzi ağa qara deməkdə israrlı olanların diqqətinə çatdırmaq istərdim: "Səməd Vurğun o vaxt bizim üçün nümunə - xalqına, ölkəsinə, Vətəninə sədaqətlilikdə nümunə idi. Səməd Vurğun Azərbaycanı, öz xalqını, öz dilini nə qədər sevirdi! Biz Səməd Vurğunla fəxr edirik!".

Sonda cəsarət edib, dahi sənətkarın məşhur misralarını ona olan xalq, Vətən sevgisinin əbədi olacağı ideyasına uyğun dəyişərək, onun ruhuna müraciət etmək istərdim:

El bilir ki, sən dahisən,
Bir incisən, mirvarisən,
Şairlərin şairisən!
Səninlədir xalqın, yurdun,
Səməd Vurğun, Səməd Vurğun!

**Samad Vurgun "Azerbaijan" poetic poetry analysis**

**Summary**

The greatest Azerbaijani poet, the first Azerbaijani poet Samad Vurgun wrote the famous Azerbaijani poem when he was 28 years old. Differences between the poetry of domestic mysticism, patriotism load and multi-faceted picture of the country. This poem reflects the encyclopedic content. The author achieves this result thanks to the complex poetic structure. Each of the 22 paragraphs expresses the poet's own ideas about the motherland and is able to convey them more fully to the reader, using powerful poetic imagery. All of this makes the poem a work of immortality that cannot be erased from memory.

**К поэтическому анализу стихотворения Самеда Вургуна "Азербайджан"**

**Резюме**

Величайший азербайджанский поэт, первый Народный поэт Азербайджана Самед Вургун написал знаменитое стихотворение «Азербайджан», когда ему было 28 лет. Его отличают глубокий мистицизм, патриотизма и яркое описание родины. Оно обладает почти энциклопедическим содержанием. Автор достигает этого результата благодаря сложной поэтической структуре. В рамках 22 параграфов автор выражает собственные представления о Родине. Этого автор достигает за счет глубинной поэзии, символов, образов, средств выразительности, которые делают это стихотворение незабываемым.

**Rəyçi: dos. D.F.Hümbətova**

DOI: 10.36719/AEM/2007-2019/49/49-52
**Дудариша Сартбаева**
Қожа Ахмет Ясауи атындағы Халықаралық қазақ-түрік университеті,
Dudarai-d@mail.ru

# Р.БЕРДІБАЙҰЛЫ ЖӘНЕ ҚАЗІРГІ ҚАЗАҚ БАЛАЛАР ӘДЕБИЕТІ

***Кілт сөздер:*** *Балалар әдебиеті, Р.Бердібай,жанр, балалар поэзиясы, балалар прозасы.*
***Key words:*** *children's literature, R. Berdibay, genre, children's poetry, children's prose.*
***Ключевые слова:*** *детская литература, Р. Бердибай, жанр, детская поэзия, детская проза.*

Балалар әдебиеті туралы анықтама бергенде, балалар әдебиеті— балаларға арналып жазылған әдеби шығармалар. Сондай-ақ, арнайы балаларға арналып жазылмағанымен, олардың ойлау, түсіну қабілетіне, талғамына, арман-қиялына әсер етіп, өзіне балаларды тартатын көркем шығармаларды да Балалар әдебиеті қатарына жатқызуға болады. Балалар әдебиеті — сөз өнерінің арналы бір саласы. Әдебиеттің бұл түріне жататын шығармалар оқиғасының қызықты да тартымдылығымен, композициясының ширақтығымен ерекшеленеді. Тілі жеңіл, көркем, түсінікті,айқын әрі әсерлі болуы тиіс. Балалар әдебиетінің негізгі мақсаттары: жас буынның сана-сезімін оятып, ақыл-ойын дамыту, оларды адамгершілікке, отансүйгіштікке, т.б. ізгі мұраттарға баулу, деп түсінік беріледі. Бірақ біздің мақаламыз, балалар шығармашылығы емес, балалар әдебиетінің мәселелерінің Р.Бердібай зертеулерінде көрініс табуы жөнінде болмақ.

Р.Бердібаевтың ұлт қамын ойлап, сонау 1956 жылы «Қазақ әдебиеті» газетін үлкен рухани серпіліске түсіріп, елді елең еткізген «Ең үлкен мәдени байлық» деп, мақала жариялауы үлкен сенсация болатын. Дәл осы жылы басылым бетінде қазақ тілі, тарихы, мәдениеті, ұлт мектептерінің аянышты суреті жөнінде аса маңызды мақалалар басылып, жұртшылық пікірі кең көлемде көрініс тапқан еді. Қарапайым газет қызметкерінің мақаласы қазақ қоғамын дүр сілкіндірді. Мақалада қоғамда белең алып бара жатқан орыстандыру саясатына қарсылық білдірілген болатын. Ия, дәл осы кезеңнен бастап орыстандыру саясаты ашық түрде кең көлемде жүргізіліп жатқан. Ауыл мектептерін үздік бітірген балалар жоғарғы оқу орындарына түсе алмай, құлайтын болды. Себебі, оларға қабылдау емтиханы кезінде орыс тілінен шығарма жаздыру үрдіс ала бастаған. Осыдан кейін орыс тілінде шығарма жазу былай тұрсын диктанттың өзін қиналып жазатын қазақы ауыл баласының мүшкіл халін көз алдыңызға елестетіп көріңіз. Міне бұл көрініс, ұлттың болашағы - балалар, деп есептейтін, жанашыр тұлғаның қоғамға қозғау салуы еді.

Қазақ әдебиетіне қатысты зерттеулерден, Р.Бердібай - балалар әдебиетін зерттеуші, деген тақырыпты кездестірмейсіз. Ғалымның фольклортану, әдебиет тарихының, теориясының және сын мәселелері, түркі руханиятына қосқан үлесі төңірегінде жүздеген мақалалар мен зерттеулері жариялануда. Алайда, ғалымның әдебиетте кенже қалып қоя беретін балалар әдебиеті мәселелеріне де ден қойғанын айтпай кетуге болмайды. «Жасөспірімдерге табиғат пен адам өмірін, тіршілігі сан түрлі құбылыстардың сырын ұқтыруға балалар әдебиетінің атқаратын қызметі аса үлкен. Тарихқа аты мәлім атақты музыканттар мен жазушылардың, қолбасылар мен жиһанкездердің, ойшылдар мен оқымыстылардың ешқайсысы да «бірден болған» емес. Орыстың данышпан ақыны А.С.Пушкиннің сегіз жасында алғашқы пьесасын жазғанын кім білмейді? Ал М.Ю.Лермонтов үш-төрт жасында ана тілімен қатар бірнеше тілде сөйлейтін болған. Жасы жиырма-отызға келгенде басқа бір тілді үйрену мен бала кезде үйренудің көп айырмасы бар. Немесе поезды, тракторды, автомашинаны, заводты сырттай тамашалау мен тәжірибеде солардың барлық ерекшелігін білу бір емес. Машина тілін білмеген адам оған өмір бойы қызықпай кетуі де мүмкін. Міне, осы себептерден де балаларға ерте бастан мәдениеттің, әдебиеттің, техниканың негіздерінен білім беру жұмысы аса зор жауапкершілікті керек етеді»[1, 67.]-деуінің өзі бала тәрбиесінің баспалдағы бар екенінің белгісі.

Кейде бір мақаланың жүгі ғалымның ғылыми тұғырын анықтап жататын болса, Рақманқұл Бердібаевтың «Суретті кітапшалар жайында» деген мақаласы да балалар әдебиетінің кейбір мәселелеріне жауап береді. Мәселен, «Орыс халқының ұлы ойшылы В.Г.Белинский бұдан бір ғасыр бұрын өзінің «Балалар кітаптары жайында» деген мақаласында: «Балаларға орыстың халық өлеңдерін, азын-аулақ үзінді жасай отырып Кирша Даниловтың ертегі өлеңдерін оқып беру өте пайдалы, тіпті қажет-ақ. Әдетте халықтық деген нәрсе тәрбие мәселесінде ұмыт болып жүр. Жасөспірімдер былай тұрсын, балалардың өзі де Корнель мен Расиннің трагедияларынан үзінділі жатқа біледі, IV Генрих пен XIV Людовик жайында ондаған анекдоттар айта алады. Бірақ олардың өз

халқының поэзиясы, орыс әдебиеті туралы түсінігі де жоқ… Балаларға жалпы, бүкіл адамзаттық, дүниежүзілік білімнен мәлімет бергенде, оны оларға, негізінде ұлттық үлгілер арқылы таныстыруға талаптаныңыздар. Олар Генрихтардан, Карлдардан, Наполеондардан бұрын ұлы Петрмен ғана емес, III Иванмен де таныссын. Жалпының өзі жекеден тұрады ғой. Кімде-кім өз отанын сүймесе, ол бүкіл адамзатқа да жат» деген болатын. Бұл сөздердің ақиқаттығын барлық халықтардың да тарихы анық дәлелдеп келеді»-деп, өз позициясын ұсынады.

Халқымыз жас нәрестенің дүниеге келуін қуаныш еткен. Баланы жұбату, ойнату, тәрбиелеу, оның алдына неше алуан тілек-мақсаттар қою өлеңмен, жырмен, көркем сөзбен айтылған. Өйткені «Адам – дүниені ұйымдастырушы, екінші -жаратылысты, мәдениетті жасаушы күш-қуаттың иесі, адам- жаратылыстың органы, жаратылыс оны өзін тану, өзін көркейту үшін туғызған, міне, балаларға осыны ұғындыру керек. Балалар алты – жеті жасынан ой-пікірдің кереметей күшін түсіне бастауға, әлеуметтік көріністердің мағынасын ұғынып, өз қасиеттерін тануға тиіс. Сондықтан балаларды өмірмен таныстырғанды, бұрынғы өткен заман туралы еңбек процестерінің және ой – пікірдің ұйымдастырған жұмысының бастапқы кезеңі туралы әңгімелерден бастау керек», - депті М. Горький. Ал, қазақ әдебиетінде Р.Бердібай «Балалардың ақыл-ойын, дүниетануын өсіруге ертегілердің мәні зор. Тіпті ертегілерді балалар әдебиетінің ең ежелгі нұсқасы деп атауға болар еді. Халық ертегілерінде дүниедегі жақсылық пен жамандық, адалдық пен арамдық, ерлік пен қорқақтық, жомарттық пен сараңдық, қулық пен аңғалдық сияқты қасиеттер мол ұшырайды. Оларда жас балаға сан түрлі түсінік беретін, сұрыпталған, ашық бояулы, есепсіз мол оқиға бар. Сол сияқты тұрмыс-салт жырларында да, кәсіпке байланысты туған өлеңдер де бала психологиясына лайық шығармалар көптеп табылады: тапқыр сөздер, тақпақтар, жаңылтпаштар т.б. Бірақ кейінгі жылдарда ауыз әдебиетінің тамаша байлығы балаларға жеткілікті дәрежеде ұсынылмай келеді. Фольклордың сан алуан үлгілері бастауыш кластардың ана тілі оқулықтарына мүлде аз енген» деп,тағы да мәселе көтереді. Демек, халық ауыз әдебиетінің пайда болуы, шығуы халықтың балаларға арнап айтқан өлең, жыр, ертегілерден басталады. Зерттеуші үшін әдебиет балаларға тек қана рухани азық — базарлық болып қана қоймай, рухани тәрбиеші де болса, қадірі арта түспек. Балаларға арналған шығармалар өмір оқулығы болуға тиіс. Жас баланың өзі тани алмаған, бірақ білуге құштарланған мәселелерін әдебиет үйретуі керек. Шығарманың тілі жеңіл, анық, түсінікті болсын. Жасанды сөз әсіресе балалар әдебиетінде зиян. Оқушының өз ойындай қарапайым, мөлдір, таза, фокусы жоқ тіл қажет.

Бір дегенің – білек,
Екі дегенің – елек,
Үш дегенің – үсік,
Төрт дегенің – төсек,
Бес дегенің – бесік,
Алты дегенің – асық,
Жеті дегенің – желке,
Сегіз дегенің – серке,
Тоғыз дегенің – торқа,
Он дегенің – оймақ, -
Он бір қара жұмбақ.

Осы тақпақ өлең екі бірдей қызмет атқарып тұр. Мұны жаттаған бала біріншіден, сан үйренсе, екіншіден, бірталай заттың атын біліп шығады. Міне, осы секілді тәсілмен қазіргі өмір шындығынан неше алуан тақпақ өлеңдер жасауға болар еді. Бұл мысалдарды алған себебіміз – жазушы, ақын балалар әдебиетінің ертеден бар үлгілерін дамыта отырып, жаңа заманға лайық шығармалар тудыра алатынын ескерту еді. Жоғарыдағыдай тақпақ ретімен «Бір дегенің – бірлік, Екі дегенің - ерлік» сияқтандырып, неше құбылтып, өнерлеп алып кетуге болмас па еді?-деуі, тағы балалар әдебиетімен айналысып жүрген ақын-жазушылырымызға жөн сілтеп, жол көрсетіп отырғанын байқаймыз.

Сондай-ақ, соғыстан кейінгі жылдарда қазақ балалар әдебиеті кең өркендеп, бұрын жазба әдебиетте балаларға арналған шығармалар саусақпен санарлықтай болса, қазір жағдай мүлде басқаша. Атап айтқанда, қазіргі кезде балалар жазушыларының тұрақты тобы пайда болды. Бұрын балалар әдебиеті дегенде – аузымызға түсетіні Ыбырайдың әңгімелері, Абайдың кейбір өлеңдері, совет жазушыларының рабайда бір ұшырайтын шығармалары болушы еді. Соңғы жылдарда балалар әдебиеті С.Бегалиннің, Б.Соқпақбаевтың, Н.Ғабдуллиннің, С.Сарғасқаевтың, М.Гумеровтың, Ә.Дүйсенбиевтің, М.Жаманбалиновтың т.б. шығармаларымен молая түсті. Сөйтіп балалар әдебиеті сын көтере аларлық, профессионалды дәрежеге жетті. Бірталай автор өздерінің алғашқы шығармаларын балалар өмірін суреттеуге арнап отыр. Демек, ендігі жерде қазақ балалар әдебиетінің

даму тенденциясы туралы пікір алысу қажеттігі туа бастады, дей отырып, балалар әдебиетін арнайы ғылым ретінде қарастыру қажет екенін ғалым Р.Бердібай 1957 жылы көтеріп, әдеби ұсыныс айтқан болатын.

Ғалымның балалар әдебиетінде ескеруі тиіс мәселеленің бірі –суретті кітапшалардың ерекшелігі болды. Қазақ тілінде шыққан суретті кітапшаларды оқып шыққан кісі біздің жазушыларымыздың әлі де болса, бұл мәселеге жете көңіл бөлмей келе жатқандығын аңғартады. Суретті кітапшалар, шынында, оңай, жеңіл-желпі іс емес. Бұл жазушыдан балалар өмірін, мінез-құлқын терең зерттеуді; оларды қызықтыратын, сұрауына жауап айтатын тақырып-тарды таңдап алуды, педагогика, дидактика принциптерін жете білуді талап етеді. Әзірше қазақ жазушылары суретті кітапшалар жасаудың ең бастапқы сатысында ғана жүр. Тақырыптың кедейлігі таңқаларлық. Өңделген халық әңгімелері мен бүгінгі өмірге арналған бірен-саран кітапшадан басқа табысымыз шамалы. Ендігі жерде балалар өмірін жан-жақты, әсерлі көрсететін шығармалар қажет. Біздің жазушыларымыздың қазіргі ұстанған әдісі, педагогика тілімен айтқанда, дедукциялық әдіс төңірегінде ғана жүр. Өмір құбылысын жалпылама алып көрсетушілік басым. Әрине, балалар әдебиетінде бұл да керек. Бірақ жас оқушыларға арналған әдебиет әртүрлі ғылми әдіске негізделуі тиіс. Жекеден жалпыға, оңайдан қиынға, жеңілден ауырға тәрізді т.б. принциптерді қолдану қажет.

Р.Бердібай зерттеулеріндегі ескеретін жайт қандай да бір ой айтса да, халықтың даналығы мен ұлттың қазынасын насихаттауды ұмытпайды: Суретті кітапшалар оқушыны ана тілін ардақтауға ерте бастан үйретеді. Бала кезінде әжесінен, не басқа біреуден естіген қызық әңгімелер кімнің есінде қалмайды? Ертегілерде кездесетін неше түрлі таусоғар, желаяқ, көлтаусар, желден жүйрік арғымақ, ұшқыш кілем, самұрық құс кімнің қиялына қозғау салмаған? Аңыз әңгімелердегі керемет теңеулер, ашық эпитет, ғажап гипербола тіл өнеріне деген ықыласты күшейте түспеп пе еді? Қырық күншілік жолға бір-ақ күнде жететін тұлпар, жердің жеті қабатына түсіп мақсатын орындап шығатын өжет ерлер, жердің ол шеті мен бұл шетіне дейін бақыт іздеген еңбекші балалары – ауыз әдебиетінің жемісі, халық даналығы еді[2.65].

Балалар әдебиеті – әдебиеттің жеке арнасы, ол жалпы әдеби процеспентерең байлыныста болды. Әдебиеттің бұл саласының тәрбиелік, танымдық,тағылымдық, қоғамдық мәндері айрықша, өйткені жас ұрпақтың өнегелі,тәрбиелі, білікті де білімді азамат, жеке тұлға болып қалыптасуы сияқты зорқоғамдық міндеттерді атқарысуға белсене араласады. Сыншы Р.Бердібай көпшілік сыншылар бара бермеген балалар әдебиетініңөкілдері туралы жазған. Олардың әрқайсысының өмірінің елеулі тұстарына,шығармашылықтарының ерекшеліктеріне тоқталып, әділ баға берген. Қазақбалалар әдебиетінің «жоқ» емес, «бар» екенін дәлелдеген сыншы. Әрбіреуі«осылай ма еді?» деген ойға қалдыратындай ақындарды танытуы – азаматтығыдесек болар. Сыншының ақын Өтебай Тұрманжанов туралы ойларын жүйелесек, ақынтұлғасы биіктеп шыға келеді. «Ө.Тұрманжановтың творчестволық жолын шолып қарасақ өзінің негізгі жанры мен іздену өрісін ерте бастан анықтап алған үлкен мақсаттылықты көреміз. Ол ауыз әдебиеті мұраларын жинаушы, өңдеуші, насихаттаушы есебінде де бір кісідей іс тындырған. Өзгелерін айтпағанда, ауыз әдебиетінің інжу-маржаны – мақал-мәтелдерді жинап жариялауының өзі өшпес мәні бар еңбегі дер едік. Өтекең поэзиясында еңбекшілдіктің үлгісі ретінде бал арасының, тынымсыз әрекетін жиі суреттеп, оны балаларға ғибрат етіп ұсынатынын білеміз. Шындығында, Өтекеңнің өзі де халықтың даналық қазынасынан ерінбей нәр жинайтын, ізденуден, үйренуден жалықпайтын нағыз еңбекші суреткер. Саналы өмірін адам тәрбиесіне бағыштаған азамат қайраткер өмірдің асыл мұраты мен мәні туралы айтуға әбден хақы бар»-деп, мақсаты айқын ақынның болмысын ашып береді. Ө.Тұрманжановтың өлеңдерінде үлкен заманалық ойлар мен идеяларды әлеуметтік поэзия деңгейінде көтеріп жырласа, екінші жерде төтелей үгіт-насихат айтады, енді бір тұста мысал түрінде өрнектейді. Бірақ түптеп келгенде азаматтық, саяси поэзиясының да, дидактикасының да, мысалдарының да құятын арнасы біреу – ол жас қауымды адамдық кәмелетке жеткізу, болашаққа болымды ұрпақ тәрбиелеу мүддесі екенін саралап жеткізеді.

Ойымызды қорыта айтқанда, қазақ балалар әдебиетінің қалыптасуы мен дамуы халқымыздың әдеби мұралары сияқты халықпен бірге жасасып, жалғасын тауып келеді. Алайда, балалар әдебиетінің маңызды мәселелері төңірегінде ауқымды ой тастап, қазақ баспасөзіне ашық пікірін білдіріп отырған батыл қалам иесі Р.Бердібай еңбектерінің орны айрықша екенін бүгінгі ұрпақ білуі тиіс.

**Пайдаланған әдебиеттер:**

1. Бердібаев Р. Суретті кітапшалар жайында (1957ж.). /Әдебиет сынының көкжиегі.Түркістан 2006 - 554 б.
2. Бердібаев Р. Ғибратшыл өлең шебері. (1970ж.). /Әдебиет сынының көкжиегі.Түркістан 2006 - 554 б.

**R. Berdibay and modern kazakh children's literature**

**Summary**

Children's literature, which is a separate part of our literature are still in need of research. In this connection, scientific articles on the children's literature of academician R. Berdibayuly are analyzed in this article.

**Р.Бердибай и современная казахская детская литература**

**Резюме**

Детская литература, которая является отдельной частью нашей литературы, все еще нуждается в исследований. В связи с этим анализируются научные статьи по детской литературе академика Р. Бердибайулы.

• nitq çatışmazlıqlarının korreksiyası və nitqin inkişafı alınmış biliklərin sözlü səviyyəyə keçirilməsi, lüğətin zənginləşdirilməsi.

Dayaq-hərəkət aparatı pozulmaları olan uşaqların sensor inkişafı üzrə korreksiya-inkişafetdirici məşğələlərin məzmunu aşağıda qeyd edilən prinsiplərə uyğun təşkil edilir:

– antropoloji-humanist prinsip təlim-tərbiyə prosesinin təşkilini uşaq orqanizminin inkişaf qanunları və şəxsiyyətinin qurulmasını nəzərdə tutur. Korreksiya işi dayaq-hərəkət aparatı funksiyalarının pozulması olan uşaqların psixo-fiziki xüsusiyyətlərinin öyrənilməsini, təlabat və imkanları nəzərə almaqla onu tam qəbul etməyi ehtiva edir.

– elmilik prinsipinə görə uşaqlara təqdim edilən biliklər, hətta onların idraki imkanlarına uyğun adaptasiya edilsə, sadələşdirilmiş olsa belə, elmi xarakterli olmalıdır.

– əlyetərlik prinsipi uşaqların psixo-fiziki, yaş xüsusiyyətlərinin, həmçinin aktual inkişaf səviyyə və hər bir uşağın potensial imkanlarını nəzərə almağı ehtiva edir.

Uşağın bütün təlimi “yaxın inkişaf zonasına” istinad etməklə qurulur və onun mənimsəmə imkanları, təlim çətinlikləri nəzərə alınır.

– əyanilik prinsipi isə təlimi əşya və hadisələri birbaşa qavramağa istinad etməklə təşkilini nəzərdə tutur. Bu zaman əsas məsələ qavrayış prosesində müxtəlif duyğu orqanlarının iştirakıdır. Bəzi hallarda hər hansı bir sensor sistemin çatışmazlığı digərinin fəallaşması hesabına kompensasiya edilir.

– təlimdə fəallıq və şüurluluq prinsipi. Təlim və tərbiyə özündə ikitərəfli proses olub, bir tərəfdən öyrədilən və tərbiyə edilən obyektlərə- uşağa təsir, digər tərəfdən isə uşağın özünün təlim prosesində fəal iştirak etməsi və təlimdə onun subyektiv fəallığı nə qədər yüksək olarsa, bir o qədər də uğurlu nəticələr alınar. Dayaq-hərəkət aparatı pozulmaları olan uşaqlarda subyektiv fəallıq səviyyəsinin aşağı düşməsi, idraki maraqların zəifliyi, motivasiyanın formalaşmaması onların tədris materialını uğurla mənimsəməsinə böyük təsir göstərir.

– ardıcıllıq və sistemlilik prinsipi uşaqda vahid bilik, bacarıq və vərdişlər sistemini formalaşdırmağa imkan verir.

Dayaq-hərəkət aparatı pozulmaları olan uşaqların təlimi sadədən mürəkkəbə doğru qurulur, fənlərdaxili və fənlərarası əlaqələrdə reallaşdırılır, bununla da uşaq şüurunda ətraf aləm haqqında bütöv bir mənzərə formalaşdırmağa imkan yaradır.

– fəaliyyət prinsipi şəxsiyyətin qurulmasında və inkişafında ictimai rol oynayır. Aparıcı fəaliyyət çərçivəsində psixikada keyfiyyət dəyişmələri baş verir. Keyfiyyət dəyişmələri yeni yaş mərhələsində daha mürəkkəb fəaliyyətə keçməni təmin edir.

– inteqrasiya prinsipi isə dayaq-hərəkət aparatı pozulmaları olan uşaqların digər təhsil və korreksiya komponentinə keçməni şərtləndirir.

Dayaq-hərəkət aparatı pozulmaları olan uşaqlarda sensor inkişaf üzrə korreksiya məşğələlərinin təşkili və aparılması zamanı aşağıda qeyd edilən metodiki şərtlərin gözlənilməsi tələb edilir:

1. Ətrafdakı obyektlərin qavranılmasını və onlarla məhsuldar qarşılıqlı fəaliyyəti yüngülləşdirən xüsusi mühitin (uşağın tələbatlarını nəzərə alan mühitə adaptasiya) yaradılması .

2. Polisensor qavrayış üsullarının inkişafı: a) ayrı -ayrı perspektiv bacarıqların (görmə, eşitmə, taktil və d-r.) təkmilləşdirilməsi; b) bu bacarıqlardan kompleks istifadənin təlimi (müxtəlif duyğu analizatorlarından daxil olan informasiyaların sintezi). Sensor sistemin inkişaf ontogenezinə və onların birgə fəaliyyətinə müvafiq olaraq daimi qarşılıqlı əlaqələrin obyektiv nizamlanmasının üç əsas zənciri fərqləndirilir:

1) taktilli - proprioseptivli - vestibulyar -görməli;
2) taktilli - eşitmə - vibrasiyalı - görməli;
3) taktilli - dadbilmə - qoxubilmə - görməli

**Ədəbiyyat:**

1. N.T.Hüseynova, S.R.Aslanova Xüsusi psixologia Bakı - 2018
2. Семенова К.А. Детские церебральные параличи Медицина, 1968.
3. Шипицина Л.М., Мамайчук И.И. Психология детей с нарушениями опорно-двигательного аппарата – М., 2004.

**The main features of corrective aimed at the development of sensory processes in children with impaired musculoskeletal system apparatus**

**Summary**

Sensory development is the development of the child's dream processes and the perception of objects and events in the environment. Sensory perception is the foundation of our perception of reality and the first step is experience. In this article, the author provides a comprehensive overview of the main features of sensory development in children with locomotor disorder.

**Основные особенности коррекционных направленный по развитию сенсорных процессов у детей с нарушением окорка-двигательного аппарата**

**Резюме**

Сенсорное развитие - это развитие у ребенка процессов представлений и восприятия предметов и событий в окружающей среде. Сенсорное восприятие является основой нашего восприятия реальности и первым шагом его является опыт. В данной статье автор дает полный обзор основных особенностей сенсорного развития у детей с опорно-двигательным расстройством.

**Rəyçi: f.f.d.T.Ağayeva**

DOI: 10.36719/AEM/2007-2019/49/69-69

**Ləman Ceyhun qızı Şahvəlıədli**
Azərbaycan Dövlət Pedaqoji Universiteti lamanshax@gmail.com

# USİ-Lİ UŞAQLARDA SENSOR İNKİŞAF ÜZRƏ TƏŞKİL EDİLƏN KORREKSİON MƏŞĞƏLƏLƏRİN MƏZMUN VƏ İSTİQAMƏTLƏRİ

(Tezislər)

***Açar sözlər:*** *uşaq serebral iflici, sensor inkişaf, duyğu, qavrayış, korreksiya.*
***Key words:*** *cerebrel palsy, sensor development, sense, perception, correction*
***Ключевые слова***: *церебральный паралич, сенсорное развитие,ошущение, восприятие, коррекция*

USİ-li uşaqların sensor inkişaf üzrə təşkil edilən korreksiya işinin əsas məzmununu pozulmanın quruluşu, dayaq -hərəkət aparatı funksiyasının ağır nitq, eşitmə, görmə çatışmazlığı ilə birgə özünü göstərməsi, həmçinin uşağın sensor, intellektual, motor və nitq inkişafı səviyyəsi, uşağın şəxsiyyət inkişafının xüsusiyyətlərini müəyyən edir.

Korreksiya məşğələlərin seçilməsi, təşkili formaları, onun keçirilmə saatlarının miqdarı bütövlükdə (tədris planına müvafiq) müəllim -defektoloq tərəfindən hər bir uşağın fərdi psixo - fiziki xüsusiyyətlərini dərindən öyrənməsi əsasında həyata keçirilir.

Buna görə də, müəllim -defektoloqun təşkil etdiyi korreksiya işi psixofiziki cəhətdən əsaslandırılmış sosial -pedaqoji cəhətdən məqsədyönlü olub, korreksiya -inkişafetdirici səmərəyə malik olur. Korreksiya məşğələlərində müəllim-defektoloqun fəaliyyəti USİ-li uşaqların vacib olan bilik və bacarıqların mənimsənilməsinə yönəldilir. Korreksiya məşğələlərinin təşkil və aparılması zamanı mütləq aşağıda qeyd edilən metodiki şərtləri gözləmək lazımdır:

1. Xüsusi sensor mühitin yaradılması;
2. USİ -li uşaqlarda polisensor bacarıq çatışmazlıqların korreksiyası;
3. Sensor funksiyalardan təlim prosesindən (eşitmə, görmə, taktil və d-r) istifadə bacarığının formalaşdırılması;

USİ-li uşaqlarda sensor inkişaf üzrə təşkil edilən korreksiya işinin aşağıdakı istiqa mətləri müəyyənləşdirilimişdir

1) vestibuluar qavrayışın inkişafı;
2) əlin və əl barmaqlarının funksional imkanlarının inkişaf etdirilməsi;
3) taktil və taktil -hərəkət qavrayışının inkişafı;
4) görmə qavrayışının inkişafı ;
5) vibrasiya qavrayışının inkişafı ;
6) eşitmə qavrayışının inkişafı;
7) kinestetik qavrayışın inkişafı ;
8) dadbilmə qavrayışının inkişafı;
9) qoxubilmənin inkişafı;
10) məkan və zaman təsəvvürlərinin formalaşdırılması;

## Ədəbiyyat:

1. N.T.Hüseynova, S.R.Aslanova Xüsusi psixologia., Bakı - 2018
2. Семенова К.А. Детские церебральные параличи. Медицина, 1968.
3. Шипицина Л.М., Мамайчук И.И. Психология детей с нарушениями опорно -двигательного аппарата – М., 2004.

**Rəyçi: f.f.d. T.Ağayeva**

DOI: 10.36719/AEM/2007-2019/49/70-72
**Zümrüd Yaqub qızı Həsənova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
zumrud.hesenova24@gmail.com

# İNKLÜZİV SİNİFDƏ TƏLİM PROSESİNİN TƏŞKİLİNDƏ MÜƏLLİMİN ROLU

***Açar sözlər:*** *inklüziv təhsil, müəllim fəaliyyəti, təlim prosesi, inklüziv sinif*
***Key words:*** *inclusive education, teacher activity, learning process, inclusive class*
***Ключевые слова:*** *инклюзивное образование, учительская деятельность, учебный процесс, инклюзивный класс*

Daim inkişafda olan, suveren dövlətimiz hər zaman uşaqlara xüsusi qayğı və diqqətlə yanaşır. Belə ki, yeni inkişaf və müasir dövlət quruculuğunun geniş vüsət aldığı bir mərhələdə də əlilliyi olan uşaqlara daha keyfiyyətli reabilitasiya xidmətlərinin göstərilməsi dövlətimiz üçün prioritet məsələlərdən biridir. Bu sahə üzrə respublikamızda çox geniş, yeni layihələr hazırlanır və həyata keçirilir. Təhsilimizin bugünkü inkişaf sahələrindən biri də məhz, əlilliyi olan uşaqların təlim və tərbiyəsinin ictimailəşdirilməsidir.

Hazırkı dövrdə beynəlxalq təşkilatlarla əməkdaşlıq istiqamətində tədbirlər həyata keçirilir, inklüziv təhsil üzrə layihələr reallaşdırılır.

İnklüziv təhsilin əsas məqsədi əlilliyi olan uşaqların bacarıqlarının inkişaf etdirilməsi, onların sosial mühitə inteqrasiyasına şərait yaratmaq, valideylərin maarifləndirilməsi və onlarla müvəkkillik sahəsində işin aparılmasına köməklik göstərmək və bu sahədə çalışan müəllimlərin metodik hazırlığının inkişaf etdirilməkdir.

İnklüziv təhsilin ən üstün cəhətlərindən biri də əlilliyi olan uşaqlarla əlilliyi olmayan uşaqların bir yerdə təhsil almasıdır. Bildiyimiz kimi bu çox çətin bir prosesdir. Belə ki, burda müəllim həm pedaqoq, həm həkim, həm də psixoloq olmalıdır. Bütün bunları nəzərə alaraq deməliyik ki, bu sahə üzrə ali təhsil müəssisələrimizdə ixtisaslar açılmış və qabaqcıl təcrübə öyrənilərək tətbiq edilməkdədir.

İnkuliziv təhsil əlilliyi olan uşaqlara cəmiyyətdəki yanaşılma tərzini də dəyişir. Yəni belə uşaqlardan qorxmaq, qaçmaq və onların halına acımaq kimi fikirləri cəmiyyətdən uzaqlaşdırır.

Bu sahədə respublikamızda müxtəlif yeni layihələr həyata keçirilir. Belə ki, Azərbaycan Hökuməti reabilitasiya xidmətlərinin təkmilləşdirilməsi məqsədi ilə ixtisaslaşmış vətəndaş cəmiyyətinin resurslarından istifadə etməyə başlamışdır. Bu məqsədlə Azərbaycan Respublikası Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi ölkəmizin müxtəlif regionlarında əlilliyi olan uşaqlara reabilitasiya xidmətləri göstərən Uşaq İnkişaf Mərkəzləri ilə QHT-lər tərəfindən Əlilliyi Olan Uşaqlara İcma Əsaslı Reabilitasiya Xidmətlərinin Göstərilməsi adlı pilot layihələr həyata keçirilir.

Belə ki, təhsil sahəsində aparılan islahatlardan biri də inklüziv təhsildir. Dünya təcrübəsində inklüziv təhsil tibbi modeldən sosial modelə keçmişdir. Əlilliyin sosial modeli cəmiyyətdə mövcud olan və uşağa öz həyatını müəyyənləşdirməyə imkan verməyən, onu əlil edən maneələrə diqqət yetirir. Sosial model pozuntu və əllilliyi tamamilə fərqli anlayışlar kimi qəbul edir.

İnklüziv sinifdə işləyən müəllim bir sıra bacarıqlara yiyələnməlidirlər. Bu bacarıqları aşağıdakı kimi qruplaşdıra bilərik:

1. Xüsusi qayğıya ehtiyacı olan uşaqların cəmiyyətə inteqrasiyası;
2. Uşaqların təhsilə cəlb olunması;
3. Əqli inkişafın, qavrama bacarıqlarının qiymətləndirilməsi və inkişaf etdirilməsi;
4. Kiçik və böyük motor bacarıqlarının qiymətləndirilməsi və onlar üzərində iş;
5. Sosial və özünəxidmət bacarıqlarının aşılanması;
6. Uşaq inkişafı sahəsində müxtəlif mövzulu təlimlərin keçirilməsi;
7. Uşağın və ailənin psixoloji problemlərinin araşdırılması, konsultasiya xidmətlərinin verilməsi;
8. Ünsiyyət və nitq bacarıqlarının qiymətləndirilməsi və inkişaf etdirilməsi;
9. Ailələrə sosial xidmətin göstərilməsi, ailələrin maarifləndirilməsi.

Dərsdə müəllim konkret mövzu ilə əlaqədar faktları elə qruplaşdırmalı, elə müqayisə və şərh etməlidir ki, hər bir şagird müəyyən qanunauyğunluqları və ideyaları mənimsəmək üçün zəruri olan düzgün mülahizə və nəticələri əldə etsin.

Müəllim dərsi düzgün idarə etməklə, şagirdlərin maraq və arzularını nəzərə almaqla, onların diqqətini tədqiqat sualına cəlb edə bilməklə, həmçinin öyrənməyə istiqamətləndirməklə şagirdlərin təfəkkürünü inkişaf etdirə və təlim fəallığını artıra bilər. Təlimin nəzəri səviyyəsinin yüksəldilməsi, nəzəri bilikləri tətbiq edə

bilmək bacarığının formalaşdırılması, kiçik yaşlı məktəblilərin təlim fəallığının artırılmasının əsas istiqamətlərindən biridir.

İnklüziv sinifdə müəllim əməkdaşlıq mühiti yaratmaqla aşağıdakı üstünlükləri əldə edirlər:

1. Müəllim dərsdə əməkdaşlıq mühit yaratmaqla şagirdlərdə yaranan psixoloji vəziyyətlərin qarşısını ala bilir.
2. əlilliyi olan uşaqların qayğıya, səmimiyyətə, özünə inama daha çox ehtiyacı olduğundan, hər bir şagird şəxsiyyətinə hörmətlə yanaşıldığını, müəllim tərəfindən qiymətləndirildiyini, ona böyük qayğı göstərildiyini duyarsa, dərsdə yüksək həvəslə iştirak edər.
3. Müəllim özünü şagirdə bərabər hüquqlu şəxs kimi göstərərək onlarda yeni müsbət keyfiyyətlərin formalaşmasına şərait yaratmış olur. Bu zaman şagird çəkinmədən öz fikrini çatdırır, sərbəst sual verir, yoldaşlarının cavabı ilə razılaşar və ya razılaşmaya da bilir.
4. Bildiyimiz kimi, məktəbin məqsədlərindən biri də şagirdlərin fiziki, psixi, sosial inkişafına kömək etməkdir. Əməkdaşlıq əsas götürülən təlim prosesində şagirdlərin öyrənmələri ilə yanaşı, onların hərtərəfli inkişafına müsbət təsir göstərilir. Yəni, müəllim uşaqların psixi, fiziki inkişafına düzgün təsir göstərməklə yanaşı, sosial inkişafına da imkan yaratmış olur. Biliklərə sərbəst yiyələnmək, qazandığı bilikləri yoldaşlarına öyrətmək, yoldaşlarının fikrinə hörmətlə yanaşmaq və s. bu kimi yaradılan təlim şəraiti uşağın sosial inkişafını artırır.
5. Şagirdlərdə digər yoldaşlarının da öyrənməsində məsuliyyət hissi formalaşdırır.
6. Müəllim şagirdlərin inkişafına təkan verdiyi kimi, şagirdlərdə müəllim fəaliyyətini nizamlayır.

İnklüziv sinifdə dərs deyəcək müəllimin səriştələliliyi aşağıdakıları əhatə edir. Məsələn, inklüziv təhsilin fəlsəfəsini anlamaq, şagirdlərin şəxsi və yaş inkişafının qanunauyğunluqlarını, xüsusiyyətlərini bilmək, inklüziv təlimin təşkilinin optimal üsullarını seçmək, inklüziv sinifdə təlim prosesini layihələndirmək, pedaqoji ünsiyyətin bütün subyektləri arasında uşaqlara münasibətdə dəyərlərə əsaslanmış müxtəlif üsulların tətbiqi, inklüziv təlimin əhatə dairəsində korreksiyaedici-inkişafetdirici mühitin yaradılması və resurslardan bütün uşaqların inkişafı üçün istifadə etmək, inklüziv təhsillə bağlı peşəkar özünütəkmilləşdirməsini təmin etmək. Müəllimin səriştəliliyi onun xarakterində özünü göstərir.

İnklüziv sinifdə müəlimin bir sıra vəzifələrə əməl etməsi işini daha da yüngülləşdirmiş olacaq.

1. Uşaqları cəmiyyətə bərabərhüquqlu şəxs kimi hazırlamaq;
2. İnklüziv təhsilə cəlb olunmuş şagirdin fərdi xüsusiyyətlərini bilmək;
3. İnklüziv təhsillə bağlı nəzəri və praktik biliklərə malik olmaq;
4. Uşaq ailə dəstək planının hazırlanmasında iştirak etmək;
5. Dərsdə differensial təlimi təşkil etmək;
6. Uşaqların daha çox maraq göstərdiyi fənlərlə əlaqəsini təmin etmək; 7. müəssisədə təhsil alan hər bir şagirdin uğurları ilə bağlı müşahidələr aparmaq;
7. Uşaqların təlim nəticələrinin diaqnostik, formativ və summativ qiymətləndirilməsini aparmaq;
8. Hər yarımilin sonunda məktəb rəhbərliyi qarşısında hesabat vermək;
9. İnklüziv təhsilə cəlb olunan şagird haqqında bütün məlumatların məxfiliyini qorumaq;
10. Şagirdin fərdi və qrup fəaliyyətlərinə cəlb olunmasına kömək etmək;
11. Məktəb psixoloqu ilə əməkdaşlıq etmək;
12. Valideynləri uşağın inkişaf dinamikası barədə müntəzəm məlumatlandırmaq;

Ümumiyyətlə, inklüziv siniflərin əsasını heç kəsin kənarlaşdırılmadığı və hər kəsin fərdi qabiliyyət və ehtiyacları ilə birgə qəbul edildiyi kollektivə olan münasibət təşkil edir. Qabiliyyət və ehtiyaclardan asılı olmayaraq, şagirdlərin hamısı eyni qaydada sinif kollektivinin üzvü sayılır.

Şagirdlər dərslərin və məktəb fəaliyyətlərinin məqsədlərini başa düşdükdə daha çox motivasiya olurlar. Uşaqların gündəlik həyatları ilə bağlı nəyi və necə öyrənməni əlaqələndirmək mütləqdir. Bu yalnız müəllimlər şagirdləri ilə əlaqə qurarsa, onlar üçün nəyin mühüm olduğunu və uşaqların bir-biri və həmçinin müəllimi ilə mübadilə etməsi üçün təhlükəsiz hiss edəcəyi rahat bir atmosfer yaranarsa mümkün ola billər.

Belə ki, inklüziv sinifdə dərs keçən müəllim bilməlidir ki, bütün uşaqlar müxtəlif yollarla, müxtəlif anlarda öyrənirlər. Məsələn, şifahi, məntiqi, vizual, bədən, musiqi, şəxsiyyətlərarası və şəxsiyyətdaxili.

İnklüziv siniflərdə müəllimin uşaqyönümlü yanaşmanın əsas xüsusiyyətlərini aşağıdakı kimi qruplaşdırmaq olar:

1. Faydalı təlim imkanları.
2. Bütün uşaqların fərqli yollarla öyrəndiklərini bilmək və müvafiq olaraq tədris üslubunun ona uyğunlaşdırılması.
3. Birgə öyrənmə.
4. Təlim məkanlarının cəlbedici və hər kəs üçün əlçatan olması.

5. Formativ qiymətləndirmədən istifadə.

**Problemin aktuallığı:** inklüziv sinifdə təlim prosesinin təşkili məsələsi dövlətin təhsil sistemi qarşısında qoyduğu prioritet məsələlərdəndir.

**Problemin elmi yeniliyi:** məqalədə inklüziv sinifdə təlim prosesinin təşkilində müəllimin rolunun imkan və yolları araşdırılaraq təsnif edilmişdir.

**Problemin praktik əhəmiyyəti:** məqalədən inklüziv sinifdə təlim prosesinin təşkilində müəllimin rolu mövzusunda mühazirə, məqalə, tezis və elmi işlərin hazırlanmasında istifadə oluna bilər.

**Ədəbiyyat:**

1. http://castprofessionallearning.org/project/top-5-udl-tips-for-learning-environments/ (Son giriş tarixi 13/11/18): CAST Peşəkar Təlimi, 2018.
2. İnklüziv təhsil müəlliminin təlimi. Proqram 4 - Dərslərin hazırlanması." Aşağıdakı linkdən götürülmüşdür: https://www.eenet.org.uk/the-10-videos-and-manuals/ (Son giriş tarixi tarixi 13/11/18): EENET, 2017.
3. Müxtəlifliyin əhatə edilməsi: İnklüziv mühiti dəstəkləyən mühitin yaradılması üçün vasitələr toplusu" Banqkok: UNESCO, 2004.

**The role of the educator in the organization of the inclusive classroom teaching process**

**Summary**

One of the main benefits of inclusive education is the fact of children and children with disabilities have an education together. Inclusive education is also changing the way society approaches children with disabilities. At present, activities are underway to cooperate with international organizations, and projects on inclusive education is being implemented. A teacher who works in an inclusive classroom must acquire a range of skills. Thus, an inclusive classroom teacher should know that all children learn in different ways and at different times. For example, verbal, logical, visual, body, music, interpersonal and mutual personal. Generally, the core of inclusive classes are the attitude towards the collective, where no one is excluded and everyone is accepted along with their individual abilities and needs.

**Роль педагога в организации инклюзивного учебного процесса**

**Резюме**

Одним из основных преимуществ инклюзивного образования является тот факт, что дети и дети-инвалиды получают образование вместе. Инклюзивное образование также меняет подход общества к детям с ограниченными возможностями. В настоящее время ведется работа по сотрудничеству с международными организациями, а также реализуются проекты по инклюзивному образованию. Учитель, который работает в инклюзивном классе, должен приобрести целый ряд навыков. Таким образом, инклюзивный учитель в классе должен знать, что все дети учатся по-разному и в разное время. Например, словесный, логический, визуальный, телесный, музыкальный, межличностный и взаимно личностный. Как правило, ядром инклюзивных классов является отношение к коллективу, где никто не исключается, и каждый принимается вместе со своими индивидуальными способностями и потребностями.

**Rəyçi: f.f.d.T.Ağayeva**

DOI: 10.36719/AEM/2007-2019/49/73-76
**Aytac İlham qızı İsgəndərova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
isgenderova91@gmail.com

# OXU POZUNTULARININ SƏBƏBLƏRİNİN ÖYRƏNİLMƏSİNDƏ ƏSAS YANAŞMALAR

***Açar sözlər:*** *disleksiya, oxu pozuntuları, fonematik qavrama, vizual qavrama, etiologiya*
***Key words:*** *dyslexia, reading disorders, phonemic perception, visual perception, etiology*
***Ключевые слова:*** *дислексия, нарушения чтения, фонематическое восприятие, визуальное восприятие, этиология*

Müasir loqopedik tədqiqatlara görə disleksiyanın etiologiyası dörd əsas nəzəriyyə ilə şərtlənmişdir.

Bu nəzəriyyələrdən biri olan vizual çatışmazlıq nəzəriyyəsinin (magnetocellular nəzəriyyə) tərəfdarları disleksiyanın səbəbini uşaqların vizual funksiyalarının formalaşmasının özünəməxsus xüsusiyyətləri ilə (vizual tanıma, göz hərəkətlərinin izlənməsi, əl-göz koordinasiyası və s.) əlaqələndirirlər.

Fonoloji çatışmazlıq nəzəriyyəsinə əsasən disleksiyanın yaranma səbəbi uşaqların fonemləri düzgün qavrayıb təhlil edə bilməmələri ilə əlaqədardır.

Son zamanlar interhemisferik qarşılıqlı təsir və disleksiyası olan şəxslərdə serebellar disfunksiya nəzəriyyələri loqopediyada geniş şəkildə müzakirə olunur. Bununla yanaşı, yuxarıda qeyd edilən nəzəriyyələrdən fonoloji və vizual çatışmazlıq nəzəriyyələri əsas nəzəriyyələr kimi qəbul olunur.

Disleksiyaya aid tədqiqatların çox böyük hissəsi, xüsusilə, rus tədqiqatçıları tərəfindən fonoloji çatışmazlıq konsepsiyasının bir hissəsi olaraq təqdim edilmişdir. Avropa, tədqiqatçıları tərəfindən isə hər iki anlayış eyni dərəcədə təqdim olunur. Lakin, vizual çatışmazlıq nəzəriyyəsi, xüsusilə, İngilis tədqiqatlarında daha dərindən araşdırılmışdır. Bu fərqlər hər bir dilin orfoqrafik sisteminin xüsusiyyətləri ilə izah edilə bilər. Belə ki, ingilis dilində ənənəvi prinsip şifahi nitq məlumatlarının yazıya köçürülməsi və onların oxusu prosesində sözlərin yazı-tələffüz formalarının fərqliliyi səbəbindən vizual məlumatların və vizual yaddaşın təhlilinə böyük ehtiyac duyulur.

Fonoloji çatışmazlıq nəzəriyyəsinin əsasları S.Orton, R.E.Levina, L.F.Spirova, A.V.Yastrebova, T.A.Altuxova, R.I.Lalayeva, M.Snowling, J.Stakhaus və başqaları tərəfindən işlənib hazırlanmışdır. Müəlliflərin fikirlərinə görə, disleksiyanı nitq prosesinin fonoloji sisteminin düzgün fəaliyyət göstərməməsinin nəticəsi hesab etmək olar.

Uşağın nitq sisteminin inkişafının mərkəzində nitqin impressiv və eksperssiv tərəfinin qarşılıqlı əlaqəsi durur. Tipik inkişaf edən uşaqlarda şifahi nitq oxu təliminin başlaması ilə tam formalaşır və oxu bacarığının əsasını təşkil edir. Buna görə də oxu prosesi artıq formalaşmış şifahi nitq əsasında inkişaf edir. Nəticə etibarilə, uşağın nitq inkişafının səviyyəsi mütaliəni mənimsəmə müvəffəqiyyətini müəyyənləşdirir. Oxu prosesinin formalaşmasına artikulyasiya problemləri, nitqin fonetik, leksik və qrammatik tərəflərinin inkişaf etməməsi və s. mənfi təsir edən əsas amillərdəndir. Oxu pozuntularında nitq çatışmazlığı konsepsiyasının tərəfdarları müvəffəqiyyətli oxunun əsas şərtləri kimi aşağıda qeyd edilmiş meyarları müəyyənləşdirmişlər:

– Uşaq nitq səslərini həm fonematik, həm də artikulyativ şəkildə differensasiya etməlidir, sözün tərkibində səsin mahiyyətini anlamalıdır, yəni, fonem haqqında təsəvvürə malik olmalıdır. Çünki, qeyri-səlis tələffüz olunan səsi hərflə əlaqələndirməkdə çətinlik çəkilir;

– Uşaq sözün səs tərkibi haqqında təsəvvürə malik olmalıdır;

– Şifahi nitq seqmentlərini birləşdirə bilməlidir;

– Cümlənin komponentlərini düzgün şəkildə kompleksləşdirməyi bacarmalıdır. Bu əməliyyatlar zamanı meydana gələn pozuntular sözlərdə səs ixtisarına, səs əlavəsinə, heca ixtisarı və əlavələrinə səbəb olur;

– Uşaqda morfologiya haqqında fikir formalaşmalıdır;

– Sözün məntiqi tərkibi və cümlədəki sözlərin uyğunluğunu təhlil etməlidir. Əks təqdirdə nitqin məzmunu pozulur;

– Uşağın kifayət qədər söz ehtiyatı olmalıdır;

– Oxuduğu nitqin məzmununu təhlil etməyi bacarmalıdır;

Qeyd etmək lazımdır ki, son zamanlara qədər rus tədqiqatçıları R.E.Levina, L.F.Spirova və digər tədqiqatçılar disleksiyanı əsasən uşaqlarda nitqin ekspressiv tərəfininn formalaşmaması ilə əlaqələndirirdilər. Onlar nitq və oxu pozuntularının bir patogenetik mənşəyə malik olduqlarına əsaslanaraq onun yüngül formasının yalnız savad təlimi mərhələsində özünü göstərdiyini iddia edirdilər. Ağır hallarda isə ilk növbədə nitq pozuntusu yarandığını və nəticə olaraq oxu və yazı pozuntularının yarandığını düşünürdülər [1, 2, 3, 4].

G.A Kache, R.E.Levina, L.F.Spirova qeyd edir ki, səs tələffüzü pozulmuş uşaqların 25-30% -də disleksiya diaqnozu qoyulur. Bu cür uşaqlarda səs tələffüzünün pozulması, tədqiqatçıların fikrincə, fonemin yaranma prosesinin natamamlığıdır. A.N.Kornev apardığı tədqiqatlar nəticəsində aşağıdakı nəticələri əldə etmişdir [5]:

– Oxu pozuntusu olan uşaqların 92% -i kifayət qədər səs analizi bacarıqlarına sahib deyil.
– Uşaqların 33% -də fonematik qavrayış düzgün deyil.
– Uşaqların 44% -də səs tələffüz qüsurları mövcuddur.

Disleksiyada şifahi nitqin pozulmasının fonematik proses çatışmazlığı ilə məhdudlaşmadığını göstərən bir sıra tədqiqat işləri var. A.N.Kornevin qeydlərinə əsasən, disleksiyası olan uşaqların 22% -də ümumi nitq inkişafının pozuntusu aşkarlanır. Uşaqların nitqində fonetik və fonematik tərəflərin pozuntuları ilə yanaşı, leksik-qrammatik səhvlər və davamlı monoloji nitqin pozuntuları da müşahidə olunur. Nitqində pozuntu olan bir uşağın frazalı nitqdə sözləri əlaqələndirməkdə ciddi problemləri meydana çıxır. Bu, belə uşaqların oxunan fərdi sözləri ifadələrə və cümlələrə birləşdirə bilməmələrini izah edir. Oxu anlayışının tamlığı və dəqiqliyi söz ehtiyatının məhdud olmasından təsirlənir. Qeyd etmək lazımdır ki, bu konsepsiyanın tərəfdarları disleksiyası olan uşaqlarda vizual və optik oxu problemlərinin mövcudluğunu da qəbul edirlər. Lakin, onlar oxu pozuntusunun səbəbini fonematik analiz və sözün qrafik görünüşünün təhlili arasında ixtiyari diqqətin bölüşdürülməsini təmin edən fonoloji əməliyyatların yaranmaması ilə əlaqələndirirlər.

Oxu pozuntularında vizual çatışmazlıq nəzəriyyəsinin inkişafı W.Morganın tipik intellekt, eşitmə və görmə qabiliyyətlərinə sahib olan uşaqlarda oxu pozuntularını izah edən əsəri ilə başladı. Tədqiqatçı disleksiyalı uşaqlardakı mövcud oxu çətinliklərini informasiyanın vizual emalının xüsusiyyətləri (normal fiziki görmə ilə) ilə izah etdi və onları anadangəlmə "şifahi korluq" adlandırdı. Bu cərəyanın nümayəndələri G.Helm-Goltz, F.Warburg, P.Ransburg idi. Onlar vizual oxu pozuntularını qavrayışın məhdudluğu, disleksiyası olan uşaqlarda hərf və sözlərin vizual tanınmasının daha gec mənimsənilməsi və göz hərəkətlərinin pozulması kimi xarakterizə edirdilər.

Görmə insana ətraf aləm haqqında informasiya almağa, hərəkətlərinə nəzarət etməyə və dəqiq obyektiv əməliyyatlar aparmağa imkan verir. Biologiya elmləri doktoru, professor G.I.Rozhkova müxtəlif vizual qabiliyyətlərin formalaşmasının bütün göstəricilərini üç qrupa bölmüşdür [6]:

– Birinci qrupa vizual sistem üçün optimal iş şəraiti təmin edən optik-fizioloji parametrlər daxildir. Bu qrupa refraktiv indekslər, yerləşmə həcmi, vizual sahə dəyərləri, kor nöqtələrin ölçüləri, işığın parlaqlıq səviyyəsi daxildir.

– İkinci qrupa vizual mexanizmlərin iş keyfiyyətini xarakterizə edən əsas vizual parametrlər daxildir. Bunlar görmə kəskinliyi, kontrasta həssaslıq, rəng differensasiyasının incəliyi, qəbul edilən hərəkət sürətinin həddi, stereo görmə hədləri və s. daxildir.

– Üçüncü qrup daha yüksək vizual mexanizmlərin formalaşma dərəcəsini, vizual və digər sistemlərin (oculomotor sistem, yaddaş və diqqət sistemləri) birgə fəaliyyətinin effektivliyini əks etdirən kompleks parametrlərdən ibarətdir. Bu qrupun parametrləri vizual olaraq idarə olunan davranışı, vizual yaddaşı və vizual diqqəti, vizual fəaliyyəti xarakterizə edir. G.I.Rozhkovanın qeyd etdiyi kimi, bu göstəricilər koqnitiv bacarıqlar və insanın öyrənmə qabiliyyəti ilə birbaşa əlaqəlidir [7. s.4].

Görmə qabiliyyətinin optik-fizioloji və əsas parametrlərinin patalogiyaları valideynlər və uşağın özü tərəfindən aşkar edilir və bir qayda olaraq oftalmoloji və nevroloji müayinə ilə asanlıqla diaqnoz qoyulur. Görmə qabiliyyətinin mürəkkəb prametrlərinin pozulması əksər hallarda nəzərə çarpmır. Çünki onlar uşağın gündəlik həyatına təsir göstərmir və yalnız müəyyən həssas vəziyyətlərdə görünür. Buna başlıca nümunə olaraq oxu prosesini göstərmək olar. Standart oftalmoloji müayinə zamanı onlar, ümumiyyətlə, aşkar edilmir. Görmə qabiliyyətinin optik-fizioloji və əsas parametrlərinin pozuntusu olan uşaqlarda mütaliə pozuntusu tədqiqatçılar tərəfindən disleksiyaya aid edilir. Görmə sisteminin parametrlərinin üçüncü qrupunun göstəricilərindəki pozuntular görmə çatışmazlığı konsepsiyasının nümayəndələri tərəfindən oxumağı öyrənməyə maneə kimi qəbul olunur.

Yuxarıda qeyd edildiyi kimi, oxu zamanı vizual qavrayış görmə qabiliyyətinin və motor komponentlərin kompleks işi ilə dəstəklənir. Bu nəzəriyyənin nümayəndələri disleksiyanı ontogenezdə oftalmokinesisin meydana gəlməsinin patoloji növü olaraq qəbul edirlər. G.Th.Pavlidis apardığı tədqiqatlarda disleksiyası olan uşaqların və həmyaşıdlarının göz hərəkətlərinin müqayisəsində kəmiyyət və keyfiyyət fərqlərini aşkarladı. Fərqlər nəinki, hərflər, həmçinin, sözlər və cümlələr, hətta uşaq yatarkən yuxu zamanı da qeyd olunur.

Disleksiyada vizual çatışmazlıq nəzəriyyəsi çərçivəsində öyrənilən başqa bir fenomen Helen Irlenin təsvir etdiyi həssas skotopik sindromdur [8]. Tədqiqatçının qeydlərinə əsasən, çap olunmuş mətni disleksiyalı

şəxslər digərləri ilə müqayisədə vizual olaraq normal şəkildə qavramadıqları üçün oxumaqda çətinlik çəkirlər. H. Irlen skotopik sindromun beş əsas əlamətini müəyyənləşdirdi.

– Skotopik sindromdan əziyyət çəkənlər oxumaq üçün rahat işıqlandırma, işıq mənbəyinə nisbətən düzgün mövqe seçə bilmirlər. Oxu zamanı bu cür insanlar baş ağrısı, migren halında özünü göstərən və daimi yorğunluğa səbəb olan başgicəllənmə, həyəcan və narahatlıq hiss edə bilirlər.

– Mətnin fondan seçilməsinin pozulması ağ fon rəngi ilə çap şriftinin qara rəngi arasındakı kəskin ziddiyyət ilə əlaqələndirilir. Arxa plan daha çox diqqəti cəlb etməyə başlayır, hərflər fərdi görünüşlərini itirir, arxa plana keçir, görünməz, oxunmayan hala gəlir, elementlərini itirirlər.

– Qavranılan işarələrin sabit olmaması, hərəkətsiz olan hərflərin "hərəkətli" cisimlərə çevrilməsi əlamətlərdən biridir. Hərflər pulsasiya edir, titrəyir, sürüşür və qaçırlar. Çox vaxt hərflər və bütün sözlər düzləşmiş, bir-birinə yapışmış, rəngsiz və ya azalmış kimi görünür. Oxumağı öyrənməyin ilkin mərhələlərində problem yaşamayan bəzi uşaqlar, səhifədəki sətirlərin artması və şriftin kiçilməsi ilə çətinlik çəkməyə başlayırlar. Hərfləri fərdi şəkildə oxuya bilir, lakin sözün, cümlənin tərkibində differensasiya edə bilmirlər.

–Mətn elementlərinin vizual tanınmasının pozulması. Bu pozuntu, tunel oxuması kimi tanınır, mətnin oxunması və ya yenidən yazılması zamanı sətirdən-sətirə keçid qeyri-mümkün olur. Çünki, qrafik məlumatlar yalnız dar vizual sahə daxilində qəbul edilir. Ənənəvi yazı prinsipini mənimsəmək üçün zəruri olan vizual qavrama formalaşmır və ya təhrif edilir.

– Bir kompüterdə oxumaq, yazmaq və ya işləyərkən uzun müddət diqqət toplamağın mümkünsüzlüyü problemi olan insanlar iş qabiliyyətini bərpa etmək üçün daim müxtəlif tövsiyələrə müraciət etmək məcburiyyətində qalırlar.

H. Irlenin fikrincə, həssas skotopik sindrom görmə qabiliyyətindən daha çox qavrayış disfunksiyasıdır. Skotopik sindromun yuxarıdakı təzahürlərinin normal oxuya ciddi maneələr yaratdığına və digər akademik bacarıqların mənimsənilməsinə, bədən tərbiyəsi və idman dərslərindəki müvəffəqiyyətlərinə, incəsənət, xüsusilə, musiqi qabiliyyətlərinə təsir göstərir.

Görmə çatışmazlığı konsepsiyası çərçivəsində disleksiyası olan uşaqlarda vizual diqqətin öyrənilməsi böyük əhəmiyyət daşıyır [9, 10, 11, 12]. Müasir konsepsiyalara görə, vizual diqqət vizual qavrayışa səbəb olan bir amildir.

Hazırda vizual disleksiya amillərinin öyrənilməsində bir neçə cəhət şərti olaraq fərqlənir: görmə qavrayışı, vizual yaddaş, görmə diqqəti və oculomotor fəaliyyətin öyrənilməsi [13]. Vizual öyrənmə komponentləri oxu prosesinin funksional əsasını təşkil edən amillərdir. Onlardan hər hansı birinin meydana gəlməməsi uşaqlarda davamlı oxu pozuntusuna səbəb ola bilir.

Bu nəticəyə gəlmək olar ki, oxu pozuntularının yaranma səbəblərinin öyrənilməsinə əsas yanaşmalar vizual çatışmazlıq və fonematik çatışmazlıq nəzəriyyələridir. Hər iki nəzəriyyə kifayət qədər geniş tədqiqatlar nəticəsində təstiqlənmişdir. Görmə çatışmazlığı nəzəriyyəsi uşaqların görməsində heç bir optik çatışmazlıq olmamasına baxmayaraq, oxu prosesində problemlərinin yaranma mexanizmini tədqiq edir. Fonematik çatışmazlıq nəzəriyyəsi isə fonemlərin qavranılması zamanı uşaqların differansasiya problemləri nəticəsində oxu prosesində yaşanan çətinliyin mexanizmini araşdırır. Disleksiyalı şəxslərlə aparılan korreksiya işi həm vizual, həm də fonematik istiqamətdən aparılır.

## Ədəbiyyat:

1. Левина Р. Е. Нарушения письма у детей с недоразвитием речи. — М.: Изд-во АПН РСФСР, 1961.
2. Левина Р. Е. Недостатки произношения, сопро-вождающиеся нарушениями чтения и письма // Логопедическая работа в школе. — М.: Изд-во АПН РСФСР, 1953.
3. Спирова Л. Ф. Особенности звукового анализа у детей с недостатками речи. — М.: Изд-во АПН РСФСР, 1957.
4. Спирова Л. Ф. Соотношение между недостатками произношения, чтения и письма // Вопросы логопедии. —М.: Изд-во АПН РСФСР, 1959.
5. Корпев А. Н. Нарушения чтения и письма у де-тей. — СПб.: МиМ, 1997.
6. . РожковаГ. И., Токарева В. С. Таблицы и тесты для оценки зрительных способностей. — М.: Владос, 2001.
7. . РожковаГ. И., Токарева В. С. Таблицы и тесты для оценки зрительных способностей. — М.: Владос, 2001.
8. Irlen H. L. Reading by the Colors: Overcoming Dyslexia and Other Reading Disabilities through the Irlen Method. — New York: Aveolury Publishing, 1991.

9. Глезер В. Д. Механизмы опознания зрительных об-разов. — Л., 1966.
10. Демьянов Ю. Г. Об онтогенетическом подходе к проблеме нарушений восприятия // Дефектология: XXIX Герценовские чтения. — Л., 1976.
11. Карпенко Н. П. Роль внимания в происхождении и коррекции дисграфий: Автореф. дис. ... канд. психол. наук. — М., 1980.
12. Aaron P. A. Is There a Visual Dyslexia? // Annals of Dyslexia. -1993. — Vol. 43.
13. Левашов О. В. Нарушение зрительно-моторных функций при дислексии: Обзор новых экспериментальных данных // Письмо и чтение: трудности обучения и коррекция. — М.; Воронеж, 2001.

**Basic directions in the study of the causes of reading disorders**
**Summary**

The main approaches to the study of the causes of reading disorders are the theory of visual impairment and the theory of phonemic impairment. Both theories have been validated by extensive research. The theory of visual impairment investigates the mechanism of occurrence of problems in reading, even though there is no optical defect in children. The theory of phonemic deficiency examines the mechanism of difficulty in learning as a result of the problems of children's differentiation in the perception of phonemes. Correction work with persons with dyslexia is conducted both visually and phonemically.

**Основные направления в изучении причин нарушения чтения**
**Резюме**

Основными подходами к изучению причин нарушений чтения являются теория нарушений зрения и теория фонематических нарушений. Обе теории были подтверждены обширными исследованиями. Теория нарушений зрения исследует механизм возникновения проблем при чтении, хотя у детей нет оптических дефектов. Теория фонемной недостаточности рассматривает механизм трудности обучения в результате проблем дифференциации детей в восприятии фонем. Коррекция дислексии проводится в фонемном и зрительном восприятии.

**Rəyçi: f.f.d.T.Ağayeva**

DOI: 10.36719/AEM/2007-2019/49/77-79
**Nərmin Rəcəb qızı Şərifova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
nzerifova@gmail.com

# İNKLÜZİV TƏHSİLİN YARANMASININ TARİXİ MƏRHƏLƏLƏRİ

***Açar sözlər:*** *inklüziv təhsil, inklüziya, xüsusi məktəb, seqresiya, normallaşma*
***Key words:*** *inclusive education, inclusion, special school, segregation, normalization*
***Ключевые слова:*** *инклюзивное образование, инклюзия, специальная школа, сегрегация, нормализация*

Bəşər cəmiyyəti yarandığı dövrdən psixi, əqli və fiziki cəhətdən sağlamlığında çatışmazlıq olub, xüsusi qayğıya ehtiyacı olan insanlara qarşı münasibət çox fərqli olmuşdur. Xüsusi qayğıya ehtiyacı olan insanlar təlim, təhsil, tərbiyəyə yiyələnmək və onların digər normal insanlar tərəfindən qəbul edilməsi üçün mürəkkəb bir inkişaf yolu keçmişdir və aşağıda göstərilən mərhələlərlə təsvir oluna bilər:

- I mərhələ eramızdan əvvəl XI-VIII əsrdən – XII əsrə qədər olan vaxtı əhatə edir - Cəmiyyət sağlamlıq imkanları məhdud olan insanlara qarşı aqressiv rəfdar edir, onları qəbul etmirdi. [1, səh 47]
- II mərhələ XII əsrdən - XVIII əsrin 70-80-ci illərini əhatə edir. Bu dövrlərdə fiziki, əqli və psixi sağlamlıqlarında çatışmazlıqlar olan insanlara qarşı münasibət kəskin dəyişilmiş, yəni onların təliminin mümkünlüyü başa düşülmüşdür. [1, səh 49]
- III mərhələ XVIII əsrin 70-80-ci illərindən – XX əsrin əvvəllərinədək olan vaxtı əhatə edir. Bu mərhələdə həm Avropada, həm də Rusiyada müxtəlif kateqoriyalı çatışmazlıqları olan uşaqlara öyrənmə bacarıqları ilə yanaşı, öyrətmək zərurəti -xüsusi təhsilin təşkilinin vacibliyi də dərk edilmişdir. [1, səh 50]
- IV mərhələ XX əsrin əvvəllərindən – 1980-ci illərin ortasını əhatə edir. Bu illərdə artıq təcrid olunmuş təhsildən inteqrativ təhsilə doğru inkişaf getməyə başladı. İnteqrativ təhsildə uşaqlar ümumtəhsil məktəblərində tipik uşaqlarla birlikdə, lakin ayrı siniflərdə xüsusi proqram əsasında oxuyur. Bununla da uşaqların yaşadıqları cəmiyyətin mədəni ənənələrinə uyğun tərbiyəsini vacib hesab edirdi.
- V mərhələ 1980-ci illərin ortasından – hal-hazırki vaxta qədər olan illəri əhatə edir. Bu mərhələdə inteqrativ təhsillə yanaşı inklüziv təhsil də tətbiq olunmağa başladı.

Əlilliyi olan uşaqların inklüziv təhsili ilə bağlı problemlər son onilliklərdə təkcə aparıcı elm adamları, müəllimlər, psixoloqlar, tibb nümayəndələri tərəfindən deyil, uşaqlarını ictimai təhsil müəssisələrində tərbiyə etmək və tərbiyə etmək istəyən əlil uşaqların valideynləri tərəfindən də fəal şəkildə müzakirə olunur. Məqsəd əlil uşaqların da cəmiyyətin tam üzvü olmaq imkanını təmin etməkdir.

"İnklüziv təhsil" modeli xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsili ilə yanaşı, onların həyata transformasiyasını və inkişafını nəzərdə tutur. Burada yalnız sağlamlıq imkanları məhdud olan uşaqlar deyil, həm də kimsəsiz, valideyn himayəsindən məhrum, çətin tərbiyə olunan, davranışında problemlər olan, zərərli vərdişlərə meyl edən, təhsildən kənarda qalan, hüquqları pozulan, zorakılığa məruz qalan uşaqlar da aid edilir.

İnklüziv təhsil bütün şagirdlərə uşaq bağçasında, ümumtəhsil məktəblərində, texniki peşə məktəblərində, texnikom və kolleclərdə, institut və universitetlərdə tam iştirak etmək üçün imkan verir.

1945-ci ildə İkinci Dünya Müharibəsindən sonra dünyada humanizm ideyalarının gücləndirilməsi Birləşmiş Millətlər Təşkilatının (BMT) yaradılması üçün vacib şərt idi. Bu təşkilat əlilliyi olan uşaqların təhsil sistemində bərabər hüquqlarının həyata keçirilməsinə təşəbbüs göstərir və əlilliyi olan uşaqların keyfiyyətli və əlverişli təhsil almaq hüquqlarının təmin edilməsinə dövlətlərin və hökumətlərin diqqətini cəlb edirdi. BMT təşəbbüslərini həyata keçirmək üçün qanun çərçivəsində aşağıdakı sənədləri hazırladı:

- "İnsan Hüquqlarının Ümumdünya Bəyannaməsi" (1948);
- "Uşaq hüquqları Bəyannaməsi" (1959);
- Təhsil sahəsində ayrı-seçkiliyə qarşı mübarizə haqqında konvensiya" (1960);
- "Əqli cəhətdən geri qalan şəxslərin hüquqları haqqında bəyannamə" (1971);
- "Əlillərin hüquqları haqqında bəyannamə" (1975);
- "Əlillərə dair Ümumdünya Fəaliyyət Proqramı" (1982);
- "Uşaq hüquqları haqqında Konvensiya" (1989);
- "Uşaqların yaşamasını, qorunmasını və inkişafını təmin etmək haqqında dünya bəyannaməsi" (1990);
- "Hamı üçün Təhsil haqqında Dünya Bəyannaməsi" (1990);

- "Əlillər üçün bərabər imkanların yaradılması üçün standart qaydalar" (1993);
- "Xüsusi təhsil ehtiyacı olan şəxslərin təhsili sahəsində prinsiplər və praktiki fəaliyyət haqqında Salamanka Bəyannaməsi" (1994);
- "Dünya Təhsil Forumu tərəfindən qəbul edilmiş Dakar Fəaliyyət Çərçivəsi" (2000)

Qəbul edilmiş beynəlxalq hüquqi sənədlərin əsas bazası olan humanist prinsiplərə zidd olaraq xüsusi təhsil sistemində ayrıseçkilik vardı. Xüsusi qayğıya ehtiyacı olan uşaqlar kütləvi təhsil müəssisələrindən ümumiyyətlə təcrid edilirdi. Xüsusi məktəblərin təhsil mühitində uşaqların bu cür təcrid olunması onların hüquqlarının pozulması kimi qiymətləndirilməyə başlandı[9]. Bununla əlaqədar, 1960-1970-ci illərin sonunda Avropa və Amerikada əlilliyi olan insanların, inkişaf əlilliyi olan uşaqların valideynlərinin, həmçinin kollegiya üzvlərinin cəmiyyətdə və təhsildə ayrıseçkiliklə mübarizəyə yönəlmiş kütləvi etirazları oldu [6].Tədbirlərin nəticəsi olaraq 1960-1970-ci illərdə İsveçdə, daha sonra inkişaf etmiş əksər ölkələrdə əlillər üçün böyük internat məktəbləri və psixiatriya xəstəxanaları bağlandı. [7]

1970-ci illərdə İsveçdə Danimarka Ruhi Sağlamlıq Xidmətinin rəhbəri N.Benk-Mikkelson və Zehni Əlillər Assosiasiyasının direktoru B.Nire "normallaşma" anlayışını təqdim etdilər[6]. Normallaşmanın təməl prinsipi əlilliyi olan şəxslərin təhsil almaq, işləmək və normal şəraitə yaxın yaşayış şəraiti almaq hüququ haqqında müddəadır [3].

1974-cü ildə İngiltərədə Əlilliyi olan Şəxslər Birliyi yaradıldı. Bu birliyin fəaliyyəti əlilliyi olan insanların ayrılıqlarına qarşı mübarizə məqsədi daşıyır. Bu birliyin üzvlərinin nəşrləri əlilliyi dərk etməyin yeni bir sosial konsepsiyasını açıq şəkildə ortaya qoydu: əlilliyi olan insanlar (xüsusən də uşaq) üçün cəmiyyət tərəfindən yaradılan maneələr onların normal həyat sürməsinə imkan vermir. 1970-ci ildə Amerikalı alim İ. Deno oxşar konsepsiya – "Kaskad" modelini təklif etdi [8]. Kaskad altında əlilliyi olan bir uşağın ümumi cərəyanda (əsas cərəyanda) mümkün qədər səmərəli qarşılıqlı münasibət yaratmasına imkan verən sosial və təhsil tədbirləri sistemi nəzərdə tutulur. 1975-ci ildən bu yana ABŞ-da "Əlil uşaqların təhsili haqqında" 94-142 qanununun qəbulu ilə təhsildə inteqrasiya prosesləri hüquqi əsasa qoyuldu. Bu qanun federal büdcə hesabına əlilliyi olan uşaqların dövlət məktəblərində pulsuz təhsil almaq hüququnu təmin etmək üçün hazırlanmışdır. İngiltərədə, 1978-ci ildə, İnkişaf Qüsurlu Uşaq və Gənclərin Tədrisi ilə Vəziyyətin Öyrənilməsi Komitəsi, əlil uşaqları orta məktəblər sisteminə inteqrasiya etməklə inklüziv təhsilin inkişaf perspektivlərini açıqladı. 1981-ci ildə Təhsil haqqında Qanun bu sahəni prioritet olaraq təsdiqlədi. M. Yornokdan əvvəl əlilliyi olan uşaqlara münasibətdə alçaldıcı və səhvən "əqli qüsurlu" və "təhsili olmayan" ifadələr işlədilirdi. M. Yornok tərəfindən edilən araşdırmalar, bir sinifdə hər beş şagirddən birinin öyrənmə çətinliyi olduğunu, öyrənmə çətinliyi olan uşaqların diaqnoz və müalicə aldıqları zaman nöqsanlı bir model çərçivəsində olmamaları lazım olduğunu göstərdi. M. Yornok iddia edirdi ki,öyrənmə çətinliyini yaxından görmək və uşağın ilkin vəziyyəti arasında qarşılıqlı asılılığı müşahidə etmək tədrisdə prioritet rol oynayan müəllimin pedaqoji fəaliyyətinin nəticələrindən asılıdır, nəinki xüsusi ekspertdən. Komitə "əqli gerilik" anlayışını "öyrənmə çətinliyi" termini ilə əvəz etməyi təklif etdi. M.Yornok ilə həmfikir olan tədqiqatçılar R. Kroll, D. Mosis və S. Danlop "asosial davranış" anlayışını öyrənmə problemlərinin meyarlarından biri kimi təqdim edərək "öyrənmə çətinlikləri" anlayışını bir qədər genişləndirdi[4].. 1981-ci ildə, əsasən M. Yornok tövsiyələrini özündə cəmləşdirən təhsil haqqında qanunda "əlil uşaqlar" anlayışını "xüsusi təhsilə ehtiyacı olan uşaqlar" anlayışı ilə əvəz etdi və ümumtəhsil məktəbində bu kateqoriyalı uşaqlar üçün müvafiq təhsil formalarının verilməsini tələb etdi.

Eyni zamanda Birləşmiş Ştatlar ümumi və xüsusi təhsilin ən yaxşı təcrübələrinin birləşməsinə əsaslanaraq müasir Amerika təhsil siyasətinin istiqamətini müəyyənləşdirən bir sıra qanunlar qəbul edib:

– 1980-ci ilin təhsil islahatları, müəllimlərin əlilliyi olan uşaqların təhsili üçün məsuliyyət almağa çağırışını dilə gətirdi;

– R.Reyqanın Təhsilin keyfiyyəti üzrə Milli Komissiyası tərəfindən təqdim olunan "Millətin riskləri: təhsil islahatı üçün vacibdir"məruzəsi (1983);

– İnkişaf qüsurlu şəxslərin təhsili haqqında qanun (1990).

1994-cü ildə İspaniyada (Salamanka) keçirilən Xüsusi Ehtiyaclı Şəxslərin Təhsili mövzusunda Dünya Konfransı dünya pedaqoji birliyi üçün parlaq bir hadisə idi. Nəticədə "inklüziv" termini pedaqogikaya daxil edildi və inklüziv təhsil prinsipi elan edildi. Xüsusi qayğıya ehtiyacı olan insanlar üçün təhsil sahəsində prinsiplər, siyasət və praktiki fəaliyyət haqqında Salamanka bəyannaməsi əsas beynəlxalq sənədlərdən biridir. Bu sənədin dəyəri, əlil uşaqların davamlı bir təhsil müəssisəsinə fəal cəlb edilməsi və iştirakını təmin etməklə yanaşı, həm də bütün kateqoriyalı uşaqların təhsil ehtiyaclarının reallaşdırılması üçün şərait yaratmaq məqsədilə kütləvi təhsil sisteminin yenidən qurulmasını əhatə edən inklüziv təhsil sahəsində qanunvericilik təşəbbüslərinin irəli sürülməsi və irəli sürülməsi prinsiplərini özündə ehtiva etməsindən ibarətdir.

Dakar Çərçivə Fəaliyyət Konsepsiyası (Dakar Framework for Action) və Təhsildə Minilliyin İnkişaf Hədəfləri (Millennium Development Goals on Education), 2015-ci ilə qədər hamının təhsili təmin etməsi üçün hazırlanmış ən əhatəli və müasir bir yanaşma təqdim edir. İnklüziv təhsil konsepsiyasının əsas prinsipləri fiziki vəziyyətindən asılı olmayaraq hər bir insanın müstəsna dəyərinin və unikallığının tanınması, əlilliyi olan uşaqlar üçün xüsusi şəraitin yaradılmasına, onların uğurlu ictimailəşməsini təmin etməyə yönəlmişdir.

Yuxarıda göstərilənlərin hamısına yekun vuraraq bir daha vurğulayırıq ki, dünyanın müxtəlif ölkələrində inklüziv təhsil prosesi konkret sosial-mədəni şərait və rəhbərliyin siyasi iradəsi nəzərə alınmaqla fərqlidir. İnklüziv təhsil səbr tələb edən uzunmüddətli, sistemli və ardıcıl, davamlı, həyata keçirilməsi üçün kompleks yanaşma tələb edən bir strategiyadır. İndiki mərhələdə inklüziya dünya birliyi daxilində təhsil sisteminin inkişafında aparıcı bir tendensiyadır.

**Ədəbiyyat**:

**1.** Hüseynova N. T., Məlikov M. Ş.–Xüsusi Pedaq. Müasir Problemləri, Bakı 2018

**2.** Малофеев Н. Н. Специальное образование в России и за рубежом: в 2-х ч. М.: Печатный двор, 1996. Ч. 1. Западная Европа. 182 с.

**3.** Culham A., Nind M. Deconstructing Normalization: Clearing the Way for Inclusion // Journal of Intellectual and Developmental Disability. 2003. Vol. 28. № 1. P. 65-78.

**4.** Deno E. N. Special Education as Developmental Capital // Exceptional Children. 1970. № 37. P. 229-237.

**5.** Dunn L. M. Special Education for the Mildly Retarded: Is Much of It Justifiable? // Exceptional Children. 1968. № 35. P. 5-22.

**6.** Nire B. The Normalization Principle and Its Human Management Implications // The International Social Role ValorizationJournal. 1994. Vol. 1. № 2. P. 19-23.

**7.** Pritchard D. G. The Development of Schools for Handicapped Children in England during the Nineteenth Century // History of Education Quarterly. 1963. Vol. 3. № 4. P. 215-222.

**8.** Review of the Present Situation of Special Education: ED–88 /ws/ 38. UNESCO, 1988. 150 p.

**Historical stages of creation of inclusive education**

**Summary**

Since ancient times, the attitude towards people in need of special care has been different. These people went through a complicated process of training, education, training and acceptance by other normal people. The article discusses the historical development of this process. It is divided into development stages and the article provides detailed information about these stages. Inclusive education is the education of children in need of special care in educational institutions with healthy children.

**Исторические этапы создания инклюзивного образования**

**Резюме**

С древних времен отношение к людям, нуждающимся в особой заботе, было различным. Эти люди прошли сложный процесс обучения, воспитания, обучения и принятия их другими нормальными людьми. В статье обсуждены исторические пути развития этого процесса. Он разделен на этапы разработки и в статье представлена подробная информация об этих этапах. Инклюзивное образование - это обучение детей, нуждающихся в особой заботе, в общеобразовательных учреждениях со здоровыми детьми.

**Rəyçi: f.f.d.T.Ağayeva**

DOI: 10.36719/AEM/2007-2019/49/80-81
**Günel Bağır qızı Bağırova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
gunel.baqir@gmail.com

# ƏQLİ CƏHƏTDƏN GERİ QALAN UŞAQLARIN SOSİAL-MƏDƏNİ İNKİŞAF XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *əqli gerilik, sosial-mədəni inkişaf, emosional-iradi sfera, nitq, sosial-perseptiv vərdişlər*
***Key words:*** *mental retardation, socio-cultural development, emotional and spatial field, speech, social and perspectives*
***Ключевые слова:*** *умственная отсталость, социокультурное развитие, эмоционально-сферическая сфера, речь, социально-перспективные навыки*

Əqli cəhətdən geri qalan uşaqları öyrənən tədqiqatçıların əksəriyyəti bu kateqoriyadan olan uşaqlarda sosial-mədəni inkişaf çətinliklərini ünsiyyət təlabatlarının formalaşmasının mürəkkəbliyi ilə əlaqələndirirlər. Bu uşaqlar digər uşaqlarla, hətta öz yaxınları ilə ünsiyyətə maraq göstərmirlər. Digər uşaqlarla qarşılıqlı fəaliyyət təlabatının olmaması onlarda kommunikativ və sosial vərdişlərin formalaşmasını xeyli çətinləşdirir. Lakin əqli cəhətdən geri qalan uşaqların sosial inkişafının xüsusiyyətlərini aşkarlamaq üçün mütləq onların erkən ontogenez mərhələsini araşdırmaq lazımdır. Əqli cəhətdən geri qalan 3-4 yaşlı uşaqlar demək olar ki, köməksiz olur, onlarda ən sadə özünəxidmət, sanitar-gigiyenik vərdişlər formalaşmamış olur, onlar kənardan kömək olmazsa, müstəqil yemək, soyunmaq, yuyunmaq və s. bacarmırlar. Uşaqlar böyüklərlə, öz həmyaşıdları ilə ünsiyyətə girmirlər. Bu onların çoxunda təkcə nitqin inkişadan geri qalması və ya heç olmaması ilə deyil, həm də verbal öncəsi mərhələdə ünsiyyət formasının məsələn, uşaqla böyüklərin birgə uşaqların əksəriyyətində situativ-şəxsiyyət və emosional ünsiyyət pozulması böyüklərlə birgə əşya və əşya-oyun fəaliyyəti prosesində meydana çıxan situativ-işçi əlaqələrinin, həmçinin situativ-işçi əlaqələrinin yaranmaması bağlıdır. Bu xüsusiyyət daha çox uşaq evindən və ixtisaslaşdırılmış körpələr evindən məktəbə daxil olan, ana nəvazişi və yaxınları ilə kontaktı olmayan uşaqlarda özünü göstərir. Əqli cəhətdən geri qalan uşaqlarda nitqdən öncə və nitqli ünsiyyət mexanizmlərinin qurulmaması praktik fəaliyyətdə ondan kifayət qədər yiyələnməməsi ilə sıx bağlıdır.

Məlumdur ki, ünsiyyətin müxtəlif formaları aparıcı fəaliyyət növünün xarakterinin dəyişməsinin təsiri altında baş verir. Əqli gerilikli uşaqlarda əşya fəaliyyətindən başlamış bütün fəaliyyət növlərinin kobud inkişafsızlığı özünü göstərir. Əgər normal inkişaf edən həmyaşlarında həmin yaşda böyük oyun təcrübəsi və nitq inkişafı müşahidə olunursa, əqli cəhətdən geri qalan uşaqlar göstərilən yaşda ancaq oyuncaqlarla yeni-yeni tanış olur və elementar ifadələrə malik olurlar. Əqli cəhətdən geri qalan uşaqlarda bu yaşda məhsuldar fəaliyyətdən söz belə gedə bilməz. Belə ki, onlarda şüurlu, məhsuldar nəticə almağa yönəlmiş fəaliyyət yalnız manipulyativ-prosessual olur. Əgər normal inkişaf edən həmyaşıdlarında öz fəaliyyətlərində böyüklərə ehtiyacları olduğu zaman çox zaman əqli cəhətdən geri qalan uşaqlarda əşyalarla müxtəlif manipulyativ fəaliyyət zamanı onların böyüklərlə ünsiyyətə tələbatları olmur. Kiçik yaşlı əqli cəhətdən geri qalan uşaqlarda fəaliyyətin məhsuldarlığı, həm də fəaliyyət prosesində davranışının primitiv səviyyəsi onlarda intellektual pozulmalarla yanaşı, həm də fəaliyyətin emosional affektiv komponentlərinin də geri qaldığını göstərir. Bu isə təlim fəaliyyətinin təşkilində korreksiya-tərbiyə işinin metod, vasitə və üsullarının seçilməsi və tətbiqində nəzərə alınmalıdır. Əqli cəhətdən geri qalan uşaqların sosial-mədəni inkişafının təhlili zamanı nəzərə almaq lazımdır ki, ünsiyyət vasitə və üsulları arasında aparıcı rolu nitq, xüsusi ilə də onun emosional-ifadəliliyi və ya ekspressiv funksiyası oynayır. Baş beyin qabığının üzvü zədələnməsi nəticəsində koqnitiv fəaliyyət pozulmasının spesifik xüsusiyyətləri, həm də əqli cəhətdən geri qalan uşaqlarda ali psixi funksiyaların çatışmazlığı digər insanların emosional vəziyyətinin qavranılma çətinliyini yaradır. Onlarda bununla bağlı şəxsiyyətlərarası ünsiyyət prosesində insanların adekvat olmayan qavranılmasını meydana gətirir və uşağın sosial inkişafını xeyli çətinləşdirir. Normal intellektli uşaqlarda sosial-perseptiv inkişafın dinamikasını yeni sosial-perseptiv səviyyəyə keçid kimi xarakterizə etmək olar. Əqli cəhətdən geri qalan uşaqlarda isə dinamika yalnız kompensator xarakteri, yəni psixoloji məna həcminin artması ilə izah etmək olar. Kollektivdə sosial status və birgə fəaliyyətdə iştirakına şəxsi qiymət səviyyəsi sosial-perseptiv vərdiş və bacarıqların inkişafına təsir göstərir. Uşağın ətraf aləmlə qarşılıqlı münasibətlər sistemi ilk öncə ailədə formalaşır. Buna görə də ünsiyyətin qavranılması və dərk edilməsi uşağın erkən mərhələdə böyüklərlə kifayət qədər və sabit fiziki əlaqələri və məktəbəqədər və məktəb yaşında özləri ilə böyüklər arasında onlardan optimal istifadə ilə müəyyənləşir. Əqli cəhətdən geri qalan uşaqlarda ünsiyyət xüsusiyyətlərinin

araşdırılması göstərir ki, bütövlükdə əqli cəhətdən geri qalan uşaqlar situasiyaya müvafiq, cəmiyyətin qəbul etdiyi norma və qaydalara uyğun ünsiyyət vasitələrindən istifadə edirlər, lakin bu çox nadir halda, yalnız xüsusi təlim şəraitində mümkün olur. Əqli cəhətdən geri qalan uşaqların şəxsiyyətlərarası münasibətində dostluq və yoldaş seçimi, bundan əlavə müxtəlif ünsiyyət formalarının formalaşmasında da müəyyən çətinliklərlə özünü göstərir. Belə ki, normal inkişaf edən məktəb yaşına qədər yaşlı uşaqlarda qeyri-situativ idraki ünsiyyət yarandığı halda, əqli cəhətdən geri qalanlarda ünsiyyətin situativ-işçi forması saxlanılır.

Beləliklə də, əqli cəhətdən geri qalan uşaqlarda sosial-mədəni inkişafın mürəkkəbliyi aşağıdakı xüsusiyyətlərlə müəyyənləşir:

1. Ünsiyyət tələbatının formalaşmaması;
2. Ünsiyyət vasitələrinə ( nitq və sosial - perseptiv vərdişlərə) yiyələnmədə çətinliklər;
3. Sosiallaşmanın ( sosial norma və qaydaların mənimsənilməsi və şəxsiyyətin əxlaqi-mənəvi sahələrinin formalaşması) mürəkkəbliyi;
4. Emosional -iradi sahə pozulmaları və özünütənzimin kifayət qədər olmaması.

**Ədəbiyyat:**

1. Hüseynova N.T..İntellektual inkişafı ləngiyən uşaqların pedaqogikası Bakı.,2017
2. Hüseynova N.T.,Aslanova S.R. Xüsusi psixologiya. Bakı., 2018. I və II cild
3. Исаев Д.Н. Умственная отсталость у детей и подростков. – СПб.: Речь, 2003.
4. Обучение детей с нарушением интеллектуального развития / под ред.
Б.П. Пузанова. – М.: Академия, 2001

**Features of socio-cultural development of mentally retarded children**

**Summary**

Most researchers who study children with intellectual disabilities associate the difficulties of social and cultural development of children in this category with the complexity of communication needs. These children are not interested in communicating with other children or even with their relatives. Lack of interaction with other children makes it difficult to develop communication and social skills. However, to identify the features of the social development of mentally retarded children, it is necessary to study their early phase of ontogenesis. Children with mental retardation are almost helpless, they do not have simple self-care, there are no hygienic habits, they can eat, dress, wash, etc. Without outside help, they cannot. Children do not communicate with adults and peers. This happens not only in many cases, but also in the preverbal phase of communication, for example, when situational-personal and emotional disorders occur in most children and adults in the process of doing things and objects with adults, non-existence of business relations, as well as situational-labor relations.

**Особенности социокультурного развития умственно отсталых детей**

**Резюме**

Большинство исследователей, которые изучают детей с ограниченными интеллектуальными возможностями, связывают сложности социального и культурного развития детей этой категории со сложностью потребностей в общении. Эти дети не заинтересованы в общении с другими детьми или даже со своими родственниками. Отсутствие взаимодействия с другими детьми затрудняет развитие коммуникативных и социальных навыков. Однако для выявления особенностей социального развития умственно отсталых детей необходимо изучить их раннюю фазу онтогенеза. Дети с умственной отсталостью почти беспомощны, у них нет простого самообслуживания, нет гигиенических привычек, они могут есть, одеваться, стираться и т. Д. Без посторонней помощи они не могут. Дети не общаются со взрослыми и со сверстниками. Это происходит не только во многих случаях, но и в довербальной фазе общения, например, когда ситуативно-личностные и эмоциональные расстройства возникают у большинства детей и взрослых в процессе выполнения дел и предметов со взрослыми. несуществование деловых отношений, а также ситуативно-трудовых отношений.

**Reyçi: dos. T.H.Ağayeva**

DOI: 10.36719/AEM/2007-2019/49/82-84
**Afaq Gülağa qızı Salamzadə**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
memmedovruslan955@gmail.com

# FONİATRİYA ELMİ, ONUN YARANMA TARİXİ VƏ FONASİYA PROBLEMLƏRİ

***Açar sözlər***: *foniatriya, larinqoskopiya, həkim-foniatr, fonasiya*
***Key words***: *phonetics, laryngoscopy, doctor phonatologist, phonation*
***Ключевые слова***: *фониатрия, ларингоскопия, врач-фонист, фонасии*

Qədim dövrlərdən bəri səsin öyrənilməsi problemlərinə həsr olunmuş elmin formalaşması prosesləri izlənilir. İnsanın nitqi və ünsiyyət vasitəsi kimi səsi həmişə sıx vəhdətdə nəzərə alınmışdır.

Ritorika, düzgün nitqin, möhkəm, gözəl səsin, düşüncələrin məntiqi şəkildə ifadə edilməsi və polemikanın inandırıcı şəkildə aparılması kimi vəzifələri özündə cəmləşdirən bir nizam – intizamdır. Qədim Yunanıstanın təhsil sistemində ritorika mühüm yer tutur. Demosfenin adı(e.ə.384-322) tarixə yalnız Qədim Yunanıstanın böyük natiqinin adı kimi deyil, xüsusi hazırlıq köməyi ilə öz nitqindəki qüsurları aradan qaldırmağı bacaran bir adamın adı kimi düşdü. Hippokrat (e.ə. 460-370), Aristotel (e.ə. 384-322), Qalen (e.ə. 130-200) insanların nitqindəki qüsurları araşdırdılar.

Tanınmış alim İbn Sina (980-1037) "Tibb elmi qanunu" fundamental əsərində vokal aparatının xəstəlikləri və müalicə üsullarını kifayət qədər ətraflı araşdırmışdır. 1024-cü ildə səsin yaranmasının bir çox problemlərini həll edən bir fonetik traktat hazırladı. İbn Sina öz əsərində səsin meydana gəlməsinin səbəblərini və onun eşitmə orqanları tərəfindən qəbul edilməsi proseslərini,səsli nitq orqanlarının işləmə anatomiyası və fiziologiyasını izah etmiş, fonemlərin fizioloji və akustik xüsusiyyətlərini vermişdir. Alim yazılarında insan beyninin funksiyaları ilə vocal aparatı arasındakı əlaqəni vurğulamışdır. Səsin və onun patologiyasının öyrənilməsi problemlərinə həsr olunmuş elmin mənşəyini Qədim Yunanıstan dövrünə təsadüf etmək olar.

1840- cı ildəki bu cür tədqiqatlar Alman fizioloqu İ. Müllerə səs dizaynının yalnız bağırsağın deyil, həm də uzatma borusunun quruluşundan asılı olduğunu müəyyən etməyə kömək etdi. Bu zaman canlı bir insanın mədəsini araşdırmaq əlçatmaz olaraq qaldı. Canlı bir insanın mədəsinin öyrənilməsində bir irəliləyiş 1855-ci ildə müğənni və vokal müəllimi Manuel Garcia tərəfindən edildi. İlk dəfə ingilis həkimi – diş həkimi Liston tərəfindən icad olunan güzgüdən istifadə edərək, qarın nahiyəsini müayinə etdi. Bunun sayəsində, diri-diri və canlı bir insanın titrəyən vokal qatlarını araşdırmaq mümkün oldu. Bu tədqiqat metodu "Larinqoskopiya" adlanır. Bu andan foniatriya elminin əsasının qoyulduğunu qeyd etmək olar. Bolqar foniatrist İ. Maksimov (1987) fikrinə görə, foniatriyanın yaranması haqqında danışmaq hələ tez idi. Foniatriya vocal aparatını müalicə edən tibb elmidir. Foniatriya səs aparatı xəstəliklərinin fiziologiyası, patologiyası, müalicə və profilaktikası məsələlərinə həsr olunmuş elm sahəsidir. Avropa Foniatrlar İttifaqının (UEP) təyininə görə Foniatriyanın əhatə dairəsi səs, nitq, dil ünsiyyətinin kommunikativ pozulmaları, uşaqlıq yaşlarında isə həm də yuxarıdakı funksiyalara birbaşa təsir edən eşitmə pozulmalarıdır. Başqa cür ifadə etsək, Foniatriya - səs, nitq, dil, eşitmə və udqunmanın xəstəlik və pozulmalarını öyrənən, otorinolarinqologiyanın anatomik, fizioloji, diaqnostik və terapevtik prinsiplərinə əsaslanan və nevrologiya, psixiatriya, endokrinologiya, pediatriya, stomatologiya, ortodontiya kimi digər tibb sahələrinin, eləcə də qeyri-tibbi profilli ixtisasların (dilçilik, psixolinqvistika, loqopediya, vokal pedaqogika, səhnə nitqi, psixologiya, pedaqogika, akustika) nailiyyətlərini istifadə edən tibb sahəsidir.

Foniatriya termini 1920- ci ildə G. Stern və M. Zeeman tərəfindən tətbiq edilmişdir. Zeeman ilk növbədə ekstrapiramidal pozğunluqlarda səs pozulmalarını təsvir edərək onları "ekstrapiramidal fonator sindromu" adlandırdı. Nəfəsalma, səsin və nitqin bütöv bir melodic rənglənməsində xarakterik bir pozuntu olduğunu qeyd etdi. Lakin, M. Zeeman qeyd etdiyi kimi rinofoniya qalıcı deyil. Belə nitq monotonluq, mono – dinamika və temp pozuntuları ilə xarakterizə olunur. Bunlar əvvəllər tələffüz pozulması (rinolalia) hesab olunurdu. Əslində, bu artikulyasiyanın pozulması deyil, səsin, səs tonunun pozulmasıdır və buna görə də onu rinofoniya adlandırmaq daha yaxşıdır.

Vokal pedaqogikasına və bərpaedici səs terapiyasına əvəzsiz bir töhfəni fransız foniatr D.bTarno etmişdir. Səsin funksional pozulmaları üçün artikulyar gimnastika, nəfəs və səs məşqlərini təklif edirdi. Orta hesabla xəstənin evdə müstəqil məşğul olması şərti ilə səsin bərpası 6 ilə 15 seans arasında tələb olunur.

1905-ci il foniatriyanın müstəqil bir tibb ixtisasına ayrılması anı hesab olunur. Bu il Berlin universitetində bir alman həkimi G. Guttsman "Danışıq funksiyasının pozulmaları klinik tədrisin mövzusu" mövzusunda

namizədlik dissertasiyasını müdafiə etdi. Foniatriyanı müstəqil bir tibb ixtisası olaraq təyin edən Guttsman idi. Hesab etmək olar ki, bu andan etibarən nitq terapiyasının inkişafı öyrənilir. 30-cu illərə qədər danışma terapiyasında, danışma motor əzələlərinin qüsurları olduğu üçün danışma pozulması sadələşdirilmiş bir anlayış idi. Nitqin çatışmazlıqlarının nəzərə alınması əsasən artikulyasiyanın motor çətinliklərini aradan qaldırmaq üçün simptomatik metodların işlənməsinə uyğun olaraq həyata keçirilmişdir. Bu məsələlər tənəffüs sisteminin düzəldilməsi problemi ilə yanaşı,nitq terapiyasının əsas tərkib hissəsini təşkil edir.

Praktik düzəliş tədbirləri əsasən tibbi xarakter daşıyır. XX əsrin əvvəlləri bir nitq terapiyasının inkişafı kimi böyük bir fəaliyyət ilə xarakterizə olunur. İki mətləb fərqlənir. Birincisi "Üzvi" adlanırdı. Onun mərkəzi Berlində idi və Guttsman başçılıq edirdi. İkinci Vyanadakı "Psixoloqlar" məktəbi idi. Bu məktəbin qurucusu Avstriya alimi E. Freschelsdir. Berlin və Vyanada foniatristlər və nitq terapevtlərinin sıx əməkdaşlığı ilə nitq və səs pozulmaları olan insanlara kömək etmək üçün şöbələr və ofislər yaradılırdı.

1924-cü ildə E. Frechelsin təşəbbüsü ilə 1-ci Beynəlxalq Konqres keçirildi və hələ də mövcud olan danışma terapevtləri və foniatrların birliyi təşkil edildi. 1971 –ci ildə səs patologiyası sahəsində çalışan bütün mütəxəssisləri bir araya gətirən Avropa Foniatriya Birliyi (UEP)yaradıldı. Hər il Avropa şəhərlərindən birində konqreslər keçirilir və burada səsin və onun pozulmalarının öyrənilməsinin müxtəlif aspektləri müzakirə olunur-diaqnostika, instrumental və obyektiv tədqiqat metodları, təsnifat və terminologiya, müalicə metodları və səs reablitasiyası.

Səs telləri xəstəlikləri ilə məşğul olan mütəxəssis həkim-foniatrdır. Adətən, bu mütəxəssislərə səsdə dəyişikliyi olan, səs telləri zədələnən insanlar müraciət edirlər. Səsin həddən artıq yorulması, periodik və ya daimi xırıltı, cingiltili səsin olmaması, səs yüklənməsi zamanı diskomfort olması, səs diapazonunun qısalması, udma zamanı diskomfort, boğaz, qırtlaq və ya boyun nahiyyəsində uzun müddətli ağrı hissiyatı, eləcə də boğazda yad cisim hissiyatı olarsa, həkim-foniatra müraciət etmək lazımdır. Həkim-foniatra hansı xəstələr müraciət etməlidir:

1. Funskional disfoniya və afoniya.
2. Kəskin və ya xroniki laringitin kəskinləşməsi; düyünlər, kistalar, poliplər, qırtlaq papillomatozu və s. kimi xoş xassəli səs teli törəmələri; qırtlaq parez və iflicləri.
3. Xərçəngönü xəstəliklərin və bədxassəli şişlərin erkən diaqnostikası.
4. Səs professionallarına müntəzəm profilaktik müayinə və qulluq proqramı.

Aşağıdakı hallarda, səs aparatı patologiyasının erkən aşkarlanması və səs funksiyasının ciddi pozulmalarının önünün alınması məqsədi ilə həkim-foniatrın müayinəsi mütləqdir:

- məslək həyatı səs yüklənməsi ilə əlaqədar olanlar: pedaqoqlar, rəhbər işçilər, menecerlər, satıcılar, hüquqşünaslar, diktorlar, dispetçerlər, həkimlər və b.;
- dramatik və musiqili teatrların aktyorları, vokalistlər, xanəndələr, aşıqlar;
- musiqi akademiyası və milli konservatoriya tələbələri;
- teatr və pedaqoji tədris müəssisələrinin, vokal şöbələrin abituriyentləri və tələbələri;
- musiqi məktəblərinin, uşaq vokal kollektivlərinin, teatr studiyalarının şagirdləri;
- aktiv və passiv siqaret istifadəçiləri.

Yetkinlik çağında bədənin bir çox yerində olan dəyişiklik, xüsusilə oğlan uşaqlarında səsdə də incə uşaq səsindən qalın kişi səsinə doğru çox aydın fərqliliklərə - dəyişikliklərə səbəb olur. Bu zaman böyümə və hormonların təsiri ilə tənəffüs, fonasiya (səslənmə) və rezonans orqanları inkişaf etməyə, bu səbəbdən səsin pərdə və keyfiyyəti dəyişməyə başlayır. Bəzən səsdəki dəyişiklik beyin tərəfindən qəbul edilmir. Ancaq artıq qırtlaq strukturu dəyişdiyi üçün fərd çox fərqli bir mexanizm istifadə edərək incə və metallik bir səs çıxarır və bu zaman pərdə və səs qırılmaları, stabillik və səs batıqlığı kimi problemlər yaşayır.

Qırtlaq toxumasında hər hansı bir problem olmamasına rəğmən səs qalınlaşmayıb nazik qala bilir. Bu səs cəmiyyətdə səhv anlaşılmalara səbəb olur və zamanla utancaq, əsəbi, iş və sosial həyatı problemli fərdlərin ortaya çıxmasına yol açır. Bunun səbəbi isə şəxsin həm psixoloji, həm də sosial baxımdan travmalar yaşamasıdır. Mutasion falset insanda özgüvən problemlərinə yol açır, özünə inamı sarsıdır. Bu insanlar özlərinə qapanmış, utancaq biri olurlar. Sosial münasibətlərində problem yaşayırlar. Müalicə edilmədiyi təqdirdə irəli yaşlara qədər bu problemlər davam edə bilir. Səs dəyişdirildikdən - qalınlaşdırıldıqdan sonra tamamilə həll olunur.

Xəstələr əsasən "səsim çox nazik çıxır, danışanda qəfildən nazikləşir, ya da qısılır" kimi şikayətlər edir. Belə xəstələrdə səs teli müayinəsində anatomik və fiziki bir problem müşahidə edilmir. Larinqostroboskopiya zamanı aşağıdakı əlamətlər görülür: "Səsin əsas tezliyi (F0) yüksək, Fonasiya zamanı qlottik açıqlıq, Mukozal dalğa zəif izlənilən, L-M hərəkət amplitudu azalmış". Danışarkən səs tellərin ancaq ön qisminin titrəməsi səsin incəlməsinə, fısıltılı, ya da nəfəsli olmasına səbəb olur.

Foniatrik xəstələr arasında bu problem 2-3% təşkil edir. Bu şəxslər çox vaxt telefonla danışarkən cinsiyyətləri aydın olmadığına görə lağ obyektinə çevrilirlər. Problemin üzə çıxmasının əsas səbəbi yeniyetməlik dövründə səsdə baş verən dəyişikliklərə fərdin özü vəya ətrafındakılar tərəfindən qarşı çıxmaq, yeniyetməlik dövründən sonrakı səsdən xoşlanmamaq, gənc qalmaq istəyi, utancaqlıq, psixoloji problemlərdir.

Puberfoniyanın müalicəsi isə verdiyi fəsadın əksinə olaraq çox rahatdır. Müalicədə əsasən səs terapiyası istifadə olunur. Səs terapiyası, səs problemləri müalicəsində ən çox tətbiq olunan müalicə üsullarından biri olub, səsi dəyişdirməyi hədəfləyən davranış üsullarıdır. Çox zaman maksimum 30 dəqiqə davam edən səs terapiyası ilə ilk seansda xəstə öz səsinə qovuşmuş olur. Səs terapiyası nəticəsiz olduqda isə səs qalınlaşdırma əməliyyatları icra olunaraq səs dəyişdirilir.

**Ədəbiyyat:**

1. Z. M. Əzizova, R. Q. Cəfərova, Ş. N. İsamayılov "Loqopediyanın nəzəri əsasları haqqında ümumi məlumat" 2008
2. И. Максимов "Фониатрия"-Мэдицина, 2008
3. Д. К. Вилсон "Нарушения голосо у детей" Медицина, 1990

**The science of phonology, its history and phonation problems**

**Summary**

Rhetoric is a discipline that combines taskes such as the right speech,the firm,beautiful voice,the logical expression of thoughts and the convincing conduct of polemics.A breakthrough in the study of the human stomach was made in 1855 by singer and vocal teacher Manuel Garcia.The term "Foniatry"was introduced in 1920 by G.Stern and M.Zeeman.İn 1924, at the initiative of E.Frechels,the First İnternational Congress was held,and a union of speech therapists and phonetists still exists.İn 1971,the European Phonetic Union (UEP) was established,bringing together all specialists in the field of sound pathology.The Physician-Foniatre is a specialist in vocal cord diseases.

**Наука о фонологии, ее история и проблемы со звуком**

**Резюме**

Риторика - дисциплина, в задачи которой входило формирование правильной речи, выносливого красивого голоса, умения логично излагать свои мысли, убедительно вести полемику. Прорыв в исследовании гортани живого человека был сделан в 1855 году певцом и педагогом по вокалу Мануэлем Гарсией. Термин «фониатрия» был введен в 1920 году Г. Штерном и М. Зееманом. В 1924 году по инициативе Е. Фрёшельса был проведен 1-й Международный конгресс и организована ассоциация логопедов и фониатров, которая существует до сих пор. В 1971 году был образован Союз Европейских фониатров (UEP), который объединил всех специалистов, работающих в области патологии голоса. Врач-фониатр является специалистом по заболеваниям голосовых связок.

**Rəyçi: dos. S. Aslanova**

DOI: 10.36719/AEM/2007-2019/49/85-87
**Lalə Əmrah qızı Fətəliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
lalefataliyeva97@gmail.com

# DİSQRAFİYA, ONUN ETİOPATOGENEZİ VƏ SİMPTOMATİKASI

***Açar sözlər:*** *nitq, yazılı nitq, disqrafiya, disleksiya*
***Key words:*** *speech, written speech, dysgraphia, dyslexia*
***Ключевые слова:*** *речь, письменная речь, дисграфия, дислексия*

Müasir elmi ədəbiyyatlarda yazı qüsurları “disqrafiya” termini ilə adlandırılır. Bu termin tədqiqatçılar tərəfindən müxtəlif mənalarda izah olunur. Rusiyalı tədqiqatçılardan L.Lalayeva disqrafiyanı yazı prosesində iştirak edən ali psixi funksiyaların formalaşmaması ilə şərtlənmiş, özünü davamlı və təkrarlanan səhvlər kimi göstərən yazı prosesinin qismən pozulması adlandırmışdır.

İ.N.Sadovnikova disqrafiyanı, əsasən, kiçik yaşlı məktəblilərdə yazılı nitqə yiyələnmə çətinliyi ilə bağlı, əsas əlaməti davamlı spesifik səhvlər olan yazının qismən pozulması kimi müəyyən etmişdir.

A.N.Kornevə görə, disqrafiya kifayət qədər intellektual və nitq inkişafı səviyyəsi olan, eşitməsində heç bir kobud çatışmazlığı olmayan uşaqlarda yazının qrafik qaydalarına, yəni yazının fonetik qanunlarına riayət etmək bacarığının kobud və davamlı pozulmasıdır. A.L.Siroyuk disqrafiyanı baş beyin qabığının inkişafsızlığı, disfunksiyası və ya ocaqlı zədələnməsi nəticəsində yazı vərdişlərinin qismən pozulması kimi xarakterizə etmişdir.

Qeyd etmək lazımdır ki, hələ də disqrafiyanın hansı yaşda və ya məktəb təliminin hansı mərhələsində diaqnozlaşdırmağın mümkünlüyü haqqında vahid bir fikir yoxdur. Buna görə də “yazıya yiyələnməyin çətinliyi” və ya “disqrafiya” anlayışları altında məktəb təlimi mərhələsində uşaqda yazı texnikasına yiyələnmənin tamamlanması zamanı yazı prosesinin həyata keçməsinin davamlı pozulması başa düşülür.

Məktəblilərdə disqrafiyanın yaranma səbəbi A.N.Kornev tərəfindən daha əhatəli təhlil olunmuşdur (1997,2003). O, qeyd edirdi ki, disqrafiya uşaqların həyatı üçün faydasız mikro və makrososial şəraitdə ilkin inkişaf zamanında patoloji amillərin fəaliyyəti səbəbindən əmələ gəlir. Disqrafiyanın etiologiyası ilə bağlı bir sıra fikirlər irəli sürülmüşdür. Bir çox alimlər belə fərziyyə irəli sürdülər ki, disqrafiyanı yaradan səbəblərdən biri də genetik amillərdir. Onların fikrinə görə, uşaqlar beynin müxtəlif hissələrinin inkişaf səviyyəsi öz valideynlərindən genetik olaraq keçir. Bu konkret funksiyaların inkişafında olan xüsusi ləngimələr ilə özünü göstərir. Ancaq tədqiqatçıların əksəriyyəti qeyd edir ki, müəyyən patoloji faktorlar prenatal, natal, postnatal dövrə təsir göstərir. Disqrafiyanın mənşəyi haqqında bir çox elmi fikirlər irəli sürülmüşdür və onlarda əsasən problemin mürəkkəbliyi qeyd olunur. Disqrafiyanın etioloji faktorlarına: bioloji və sosial-psixoloji səbəblər aid edilir. Bioloji səbəblərə prenatal, natal, postnatal inkişaf dövrlərində uşağın baş beyninin inkişafsızlığı və ya kifayət qədər inkişaf etməməsi, doğuş zamanı travmalar, patologiyalar, asfiksiya, meninqensofalit, ağır somatik xəstəliklər və infeksiyalar, sinir sistemində patologiyaların olması aid edilir. Nəticədə baş beyində yazı prosesini həyata keçirən psixi funksiyaların sahəsi zədələnmiş olur. Baş beynin bioloji pozulması nəticəsində yaranan disqrafiya əsasən ikincili qüsur olub, daha çox dizartriya, alaliya, afaziya kimi nitq patologiyalarında, həmçinin USİ (uşaq serebral iflici), PİL (psixi inkişaf ləngiməsi), əqli gerilik və psixomotor inkişafın ləngiməsində olan uşaqlarda müşahidə olunur.

Sosial-psixoloji səbəblərə əsasən nitq fəaliyyətinin kifayət qədər inkişaf etməməsi, pedaqoji baxımsızlıq, uşağın şəxsi keyfiyyətlərinə, bilik-bacarıqlarına uyğun olmayan didaktik metodlardan istifadə, ünsiyyətin zəif olması, uşağın nitq inkişafında valideynlərin diqqətsizliyi, ailədə iki dilliliyin olması və s. kimi proseslər aid olunur. Psixoloji dezadaptasiya etioloji faktorlarla sosial şəraitin uyğunsuzluğunun birləşməsi nəticəsində meydana gəlir.

Disqrafiyanın əsas simptomlarını qeyd edərkən, bir sıra kompleks xüsusiyyətləri göstərmək olar. Disqrafiyanın simptomatikasına məktəb yaşlı uşaqların orfoqrafik qaydaları bilməsindən və ya bilməməsindən asılı olmayaraq, yazı işlərində davamlı səhvlərin buraxılması daxildir. R.İ. Lalayeva müasir nəzəri loqopediyaya istinad edərək vurğulayırdı ki, disqrafiya zamanı onun xüsusiyyətlərini aşağıdakı spesifik səhvlər müəyyən edir:

1.Disqrafiya zamanı buraxılan səhvlər davamlı və spesifik olur. Bu səhvlər yazıya yiyələnmənin başlanğıc mərhələsində kiçik məktəb yaşlı uşaqlar üçün xarakterik olan digər səhvlərdən fərqlənir. Disqrafik səhvlər çoxsaylı, təkrarlanan və uzun müddət qalıcı olması ilə xarakterikdir.

2. Disqrafik səhvlər nitqin leksik-qramatik quruluşunun formalaşmaması, optik-məkan funksiyasının

inkişafsızlığı, eşitmə və tələffüzlə fonemləri differensasiya etmə bacarıqsızlığı, cümləni təhlil etmək, heca və fonematik təhlil və tərkib aparmağı həyata keçirə bilməməklə bağlıdır.

R.İ.Lalayevaya görə, yazının pozulmasına analizatorların sadə, elementar funksiyalarının pozulması kimi baxmaq olmaz. Müasir nəzəri loqopediyada disqrafik səhvlərə variant xarakterli və pedaqoji səhlənkarlıqla şərtlənmiş, yazının mürəkkəb nitq fəaliyyəti kimi təşkilinə mane olan diqqətin və nəzarətin pozulmasını daxil edirlər.

3. Disqrafiya zamanı buraxılan səhvləri yazının fonetik prinsipinin pozulmasına görə, xarakterizə edilirlər.

Disqafiyanın araşdırılması zamanı tədqiqatçıların disqrafik səhv növlərini müxtəlif cür xarakterizə etdiyini görmək olar. Məsələn, R.İ.Lalayeva disqrafiya zamanı aşağıdakı səhvləri fərqləndirirdi:

• hərflərin yazılışının təhrifi
• qrafik cəhətdən oxşar olan, həmçinin fonetik cəhətdən oxşar səsləri göstərən hərflərin əl yazısında əvəzlənməsi
• sözün səs-hərf quruluşunun təhrif edilməsi (sözlərdə hərflərin, hecaların yerdəyişməsi, buraxılması və ya əlavə edilməsi)
• cümlə quruluşunun təhrif edilməsi
• yazıda aqrammatizmlərin olması.

Yazı prosesində buraxılan səhvlər disqrafiyanın bu və ya digər növünə aid edilir. Məsələn, artikulyar-akustik disqrafiya özünü hərflərin əvəzlənməsi, buraxılması kimi göstərir. Hərflərin fonematik cəhətdən tanınmasının pozulması zamanı disqarafiya fonemati cəhətdən yaxın olan səslərə uyğun hərflərin qarışdırılması, əvəz edilməsi kimi xarakterizə edilir. Dilin təhlil və tərkib proseslərinin pozulması ilə şərtlənmiş disqarafik səhvlərə saitlərin buraxılması, sait-samit birləşmələrində yer dəyişmə, söz tərkibinə hərf və ya hecaların əlavə olunması, sözlərin bitişik və ya ayrı yazılması aiddir. Aqramatik disqrafiya sözün morfoloji quruluşunun təhrif olunması ilə göstərir. Bu hal, mənsubiyyət, kəmiyyət, növ və zaman şəkilçilərinin düzgün yazılmaması, cümlə konstruksiyalarının pozulması, nitqin sintaktik cəhətdən tərtibinin pozulması, mübtəda ilə xəbərin uzlaşmaması, cümlə üzvlərinin buraxılması ilə xarakterizə edilir. Optik disqrafiya səhvləri üçün qrafik cəhətdən oxşar hərflərin əvəz edilməsi, hərflərin güzgülü yazılışı, hərf elementlərinin düzgün yazılmaması və onların buraxılması xarakterikdir.

Psixoloqlar qeyd edirlər ki, disqrafiya qızlara nisbətən oğlanlarda 3-4 dəfə çox müşahidə olunur. Məktəblilərin 5-8 %-i disqrafiyadan əziyyət çəkir. Məktəbəqədər yaş dövründə disqrafiyanın ilkin əlamətlərinə aşağıdakıları göstərmək olar:

1.Akustik cəhətdən yaxın olan səsləri ayırd edə bilməməsi; Kar-cingiltili, fitli-fışıltılı, həmçinin, sonor: “R”, “Y”, “L” səslərinin qarışdırılması aid edilir.

2.Şifahi nitqin tələffüzün düzgün olmaması nəticəsində yazıda hərflərin qarışdırılması və ya əvəz olunması müşahidə olunur.

Disqrafiyalı uşaqların müayinəsi zamanı əsas prinsiplərinə - sistemlilik, patogenetik fəaliyyət, şəxsiyyətlilik, inkişaf prinsipləri aid olunur. Oxu və yazı pozulmaları olan uşaqların diaqnostik sxemi aşağıdakı prosesləri özündə birləşdirir:

1.Anket məlumatlarının və tibbi-pedaqoji sənədlərin toplanması;
2.Anamnez;
3.Eşitmə fəaliyyətinin vəziyyəti;
4.Səs tələffüzünün vəziyyəti;
5.Fonematik təhlil, tərkib və təsəvvürlərinin vəziyyəti;
6.Fonematik qavrama ( fonemlərin diffrensasiyası );
7.Söz ehtiyatı və dilin qrammatik quruluşunun xüsusiyyətləri;
8.Görmə fəaliyyətinin vəziyyəti: bioloji görmə, görmə qnozisi və mnezisi, görmə ilə təhlil və tərkib, məkan təsəvvürlər;
9.Yazının müxtəlif formalarda vəziyyəti (imla, ifadə, inşa, yanlış tələffüz edilən və fonetik fərqləndirilməsi çətin olan səslərin yazılması və s.).

Uşaqlarda oxu və yazı pozulmalarının erkən vaxtda müəyyən olunması, onun şifahi və yazılı nitqin düzgün şəkildə formalaşması prosesində əhəmiyyətli rol oynayır. Qeyd etmək lazımdır ki, bu pozulmaların müəyyən olunmasının əsas məqsədi oxu və yazı pozulmalarının mexanizmi, etiologiya və simptomatikası əlamətlərini zamanında üzə çıxarmaq və onları aradan qaldırmaq üçün düzgün korreksiya işi təşkil edilməlidir.

**Ədəbiyyat:**

1. N.Hüseynova, T.Ağayeva, Loqopediya. Bakı, ADPU, 2018
2. Л.С.Волкова. Логопедия. 2007
3. К.П. Беккер. М.Совак, Логопедия. М., 2001
4. Корнев А.Н. Нарушения чтения и письма у детей. СПб.: Речь, 2003. 286 с.

**Dysgraphia, its etiopathogenesis and symptomatology**

**Summary**

Written flaws in modern scientific literature are advertised by the term "dysgraphia". The term works in close sense to researchers. There is no unanimous opinion on the age or school of the dysgraphia, the beginning of the day, and the child's wrong behavior. Therefore, the notions of “the difficulty of acquiring a written speech” or "dysgraphia" continue to develop and improve children's time writing techniques at the child's school. The timely detection of reading and writing abnormalities in children plays an important role in the process of correcting verbal and written speech. Note, learn the basic features of these disorders, and correct the rules for correcting and correcting them at a convenient time, with the mechanism, etiology, and symptom of writing disorder.

**Дискография, ее этиопатогенез и симптоматика**

**Резюме**

Письменные недочеты в современной научной литературе называются термином «дисфункция». Этот термин используется исследователями по-разному. Нет единого мнения о том, в каком возрасте или на каком этапе обучения будет вести себя ученик и какие ошибки будет проявлять ребенок. Таким образом, в рамках понятий «трудность письма» или «дисфагия» происходит постоянное нарушение процесса письма во время обучения ребенка методам письма. Раннее выявление нарушений чтения и письма у детей играет важную роль в процессе коррекции устной и письменной речи. Следует отметить, что основной целью выявления этих нарушений является своевременное выявление механизма этиологии и симптоматики нарушений чтения и письма и обеспечение правильной коррекции для их устранения.

**Rəyçi: dos. S.R.Aslanova**

DOI: 10.36719/AEM/2007-2019/49/88-90
**Səkinə Həbib qızı Vəliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
Sv2015@icloud.com

# UŞAQLARDA NİTQ İNKİŞAFININ ÖYRƏNİLMƏSİ MƏRHƏLƏLƏRİ VƏ LOQOPEDİK İŞİN İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *nitq, nitqin ümumi inkişafdan qalması, qramatika,psixoloji-pedaqoji müayinə,loqopedik iş*
***Key words:*** *speech, retention of speech from general development, grammar, psycho-pedagogical research, speech terapy work*
***Ключевые слова:*** *речь, отставание от общего разития речи, грамматика, психолого-педагогическая экспертиза, логопедическая работа*

Nitqin ümumi inkişafdan qalması müxtəlif çətinlikdə olan nitq pozulmasıdır, burada uşağın nitq sisteminin səs və məna tərəfinin bütün kompanentlərinin formalaşması pozulur. Bu nitq pozulması eşitməsi və intellekti olan uşaqlarda da müşahidə edilə bilər. Belə ki, eşitmə və intellektin normal olmasına baxmayaraq, bu uşaqlarda nitqin gecikməsi, söz ehtiyatının kasadlığı, aqrammatizim, tələffüz və fonematik inkişafdan geri qalma müşahidə olunur.

Nitq pozulmalarının müxtəlifliyinə baxmayaraq, bu cür uşaqlarda müxtəlif cür xüsusiyyətlər özünü göstərir. Əlamətlərdən biri nitqin inkişafdan qalmasıdır. İlk sözlər 3-4, bəzən isə 5 yaşda tələffüz edilir. Belə hallarda əlbəttə ki, intellektin inkişafdan qalması müşahidə edilir.

Uşağın nitq inkişafı prosesinin vaxtında və səlis olması üçün müəyyən şərtlər vacibdir, yəni bu prosesin müvəffəqiyyətlə keçməsi üçün uşaq :

- Psixi və somatik cəhətdən sağlam;
- Normal əqli imkanlara, eşitmə və görməyə malik;
- Kifayət qədər psixi fəallığı;
- Nitq ünsiyyətinə tələbatı və normal nitq mühiti ilə əhatə olunmalıdır.

Uşaqların inkişafdan geri qalmasının erkən aşkar edilməsi birinci növbədə "yüksək riskli" ailələrdə aparılır. "Yüksək riskli" ailələrə aşağıdakılar aiddir:

1. Ailədə bir uşağın patologiyalı olması.
2. Valideynlərdən birində və ya hər ikisində əqli gerilik, şizofreniya, eşitmə qüsuru olan ailələr.
3. Hamiləlik dövründə anaların ağır toksikoz, kəskin yoluxucu xəstəliklər keçirməsi.
4. Dölün bətndaxili oksigen çatışmazlığı, yəni hipoksiya, doğuşdan sonra asfiksiya, zədə və ya neyroinfeksiya keçirtmiş, həyatının ilk aylarında kəllə-beyin travmaları almış uşaqlar.(3)

Nitq inkişafının pozulmasının profilaktikasında uşaqların dispanezerizasiyası böyük rol oynayır.

Bundan əlavə məktəbin və ailənin də nitq qüsurlarını aradan qaldırmaq və qarşısını almaqda rolu böyükdür. Buna görə də uşaq müəssisələri və ailə qarşısında duran əsas vəzifə uşağın nitqini inkişaf etdirmək və onun vasitəsilə sözün ən geniş mənasında ümumi mədəniyyətini yüksəltməkdir. Bu vəzifənin öhdəsindən gəlmək üçün uşaqlarda müşahidə edilən nitq qüsurları pedaqoji vasitələrlə korreksiya edilməli və qarşısı alınmalıdır. Qeyd etmək olar ki, nitq qüsurları amorf, qrup olmayıb, müxtəlif forma, xüsusiyyətlərə və xüsusi kliniki əlamətlərə malik olan patologiyadır.

Nitq qüsurlarının öyrənilməsində və qruplaşdırılmasında ilk dönüşü yaradan rus akademiki S.P.Pavlov olmuşdur. Onun beynin böyük yarımkürələrində apardığı elmi araşdırmalar neyrofiziologiyada inqilab edib. S.P.Pavlovun apardığı eksperimentlər nəticəsində insan və heyvanların ali sinir sisteminin qanunauyğunluqları, fəaliyyəti öyrənilmişdir. Onun fikrincə, dərketmə fəaliyyətini, prosesini həyata keçirən fizioloji mexanizm kimi siqnal sistemi, xüsusilə II siqnal sistemi yalnız insana məxsusdur.(3)

Müasir dövrdə nitqin öyrənilməsinin sərhədləri daha da genişlənmişdir. Belə ki, nitq qüsurlarının pedaqogika, fiziologiya, linqvistika mövqeyindən öyrənilməsi, eləcə də xüsusi elmlərin birgə tədqiqat işi aparması bu anomaliyanın aradan qaldırılmasında və profilaktikasında ciddi irəliləyiş olmuşdur.

Nitq qüsurlarının aradan qaldırılmasında həkimlərlə loqopedlərin sıx əməkdaşlığı nitq anomaliyalarının kliniki təsnifatına zəmin yaratdı. Kliniki təsnifatın yaradıcıları M.Y.Xvatset, F.A.Rau, O.V.Pravdina, S.S.Lyapidevskiy və b. nitq qüsurlarını, qüsurun yaranma səbəblərinə (etiologiyasına) və patoloji göstəricilərlə (patogenezə) əsaslanaraq təsnif etmişlər.

Kliniki təsnifata görə aşağıdakı nitq qüsurları vardır:

1. Fonetik qüsurlar – səslərin təhrif tələffüzü və ya heç olmaması. Bu qüsurlar dislaliya, dizartriya və rinolaliya kimi diaqnozlaşdırılır.
2. Nitqin itirilməsi və ya inkişafdan geri qalması. Bura alaliya və afaziya daxildir.
3. Nitqin sürətinin, ritminin və səlisliyinin pozulması taxılaliya, bradilaliya kəkələmə.

Qeyd etmək lazımdır ki, müasir dövrdə kliniki təsnifatla bərabər, digər bölgü pedaqoji-psixoloji təsnifatda işlədilir. Bu bölgü kliniki təsnifatdan nitq qüsurlarının pedaqoji təsir üçün vacib olan əlamətlərə görə qruplaşdırılması ilə fərqlənir. Pedaqoji-psixoloji təsnifatın müəllifi R.E.Levina psixolinqvistik meyarlara nitqin ünsiyyət vasitələrinin tətbiq edilməsinin pozulmasına görə nitq qüsurlarını 2 böyük qrupa ayırır.

I qrupa- fonetik inkişafdan geriqalma, fonetik-fonematik inkişafdan geriqalma və nitqin ümumi geriliyi daxildir.

II qrupa kəkələmə aiddir. Bu qüsurun əsasında dilin ünsiyyət vasitələrinin olmasına baxmayaraq, nitqin kommunikativ funksiyasının pozulması dayanır.(2,482)

Nitq anadangəlmə bacarıq olmayıb, uşağın fiziki və əqli inkişafı ilə paralel inkişaf edən onun ümumi inkişafının ən bariz göstəricisidir. Nitq qüsurlarının patalogiyasını başa düşmək üçün uşağın normal inkişafında nitqin formalaşması mərhələlərinin ardıcıllığını nəzərdən keçirmək lazımdır. Məs. " uşaq 1 yaş 5 ayında hələ danışmır. Bunun normal hal və ya patologiya olduğunu müəyyənləşdirmək üçün loqoped uşağın nə vaxt ilk sözləri deyəcəyi mərhələni bilməlidir. Digər tərəfdən nitq inkişafının qanunauyğunluqları haqqında biliklər, həm də nitq qüsurunun düzgün diaqnostikasına da kömək edir.

R.E.Levina və onun həmkarları tərəfindən 1969-cu ildə nitqin ümumi inkişafdan qalması 3 dövrə bölür. Hər dövrün özünəməxsus xüsusiyyətləri var. Bir dövrən o birisinə keçid nitqdə yeni imkanların yaranması, danışığın aktivləşməsi, nitqin motivasiyası və onun mənasının dəyişilməsi, kompensator fonunun səfərbərliyinə gətirib çıxardır.(2, 484)

UNİL olan uşaqlarla müayinə zamanı loqoped danışıq vərdişlərnin nə dərəcədə olduğunu, onların psixoloji inkişafının səviyyəsi ilə müqayisəsi, deffekt və kompensator fonunun uyğunluğu, nitq və dərketmə fəallığını müəyyən edir.

Müayinə 3 mərhələdə aparılır.

Birinci mərhələ istiqamətləşmə. Loqoped valideynlərin dediklərinə əsasən nitq xəritəsini hazırlayır, sənədləri öyrənir, uşaqla söhbət metodunun istifadə edərək ilkin məlumatlar toplayır.

İkinci mərhələdə nitq sisteminin komponentlərinin müayinəsi aparılır və alınan məlumatlar əsasında loqopedik nəticə verilir.

Üçüncü mərhələdə loqoped uşağın dərs prosesində dinamik müşahidə aparır və onun deffektlərini dəqiqləşdirir. (2, 488)

Sözün qrammatik quruluşunun formalaşması ən aparacı loqopedik müayinələrdən biridir. Burada isimlərin say və hal kateqoriyalarının uşaqlar tərəfindən istifadə edilməsi, isim və sifətin, müxtəlif nitq hissələrinin inkişaf səviyyəsinin aşkarlanması prosesi gedir. Sözün morfoloji quruluşunun düzgün yerinə yetirilməsini öyrənmək üçün isim və feilləri tək haldan cəm hala, sonra isə cəm haldan tək hala çevirmək təklif edilir.

Loqoped tərəfindən aparılan kompleks müayinə loqopedik nəticə kimi tamamlanır, burada uşağın nitqinin inkişaf səviyyəsi və nitq anomaliyasının forması qeyd edilir.

Loqopedik iş zamanı uşaqlarda nitq inkişafının birinci mərhələsi zamanı nəzərə alınır: nitqin qavranılmasının inkişafı, nitqin müstəqil inkişafı, elementar söz birləşmələri əsasında sadə iki hissəli cümlələrin formalaşması.

Loqopedik məşğələlər nitqsiz uşaqlarla kiçik qruplar (2-3 nəfər) şəklində oyun formasında aparılır. Bu zaman kukla teatrının personajlarında, qurulan oyuncaqlardan və s. istifadə edilir.

Səs formalaşması bu mərhələdə müstəqil məsələ hesab edilir. Tələffüzün formalaşması müxtəlif heca strukturu ilə sıx əlaqəlidir. Birinci mərhələdə aparılan məşğələlər prosesində uşağın dilə olan aktiv münasibəti formalaşır. Bu etapda əsas məqam xüsusi emosional oyunların təşkilidir. Oyunun motivi, məqsədi və situasiyası söz ehtiyatının və qrammatik mənaların əldə edilməsinə konkret yönəldilir.

Nitq fəaliyyətinə çox aspektli təsir nəticəsində uşaqlar ikinci inkişaf mərhələsinə keçirlər. Onların passiv və aktiv lüğət ehtiyatı artır.

Ümumi nitq inkişafının ləngiməsi olan uşaqların ikinci inkişaf mərhələsi artıq məktəbəqədər (4 yaşdan) və məktəbdəki hazırlıq qruplarından (6-7yaş) başlayır. Nitq qüsurunun korreksiyası medikamentoz müalicə ilə yanaşı mütəmadi olaraq poliklinikalarda, psixonevroloji sanatoriyalarda (4-7 yaşdan məktəbəqədər, 7-13 yaşdan məktəb) aparılır. Əsas məsələlər:

- Nitqi anlama üzrə aparılan intensiv iş;

- Söz ehtiyatı, sadə cümlələrin praktik mənimsəməsi əsasında şifahi nitqin elementar formalarının inkişafı;
- Səslərin ayırd edilməsi, sözün ritmik- heca strukturunun və düzgün tələffüz formalaşması;(2, 486)

Uşaqların nitqinin zənginləşməsinə dair material kimi ətraf mühit göstərilir. Konkret anlayışlar dəqiqləşir və yığılır, sözün hansı əşyaya aidiyyatı, hərəkəti, əlaməti, keyfiyyəti və s. formalaşır. Passiv və aktiv söz ehtiyatının genişlənməsinə dair sistematik iş aparılır.

Uşaqlara nümunələr əsasında suallara cavab verməyi və cümlə qurmağı öyrədirlər. Onlara ismin təsirlik, yönlük, çıxışlıq hallarını başa salıb, adlıq halla müqayisə edirlər. Sözləri əvvəlcə loqoped səlist tələffüz edir, sonra isə bir neçə dəfə uşaq təkrar edir. Bu zaman uşağın nitqinə əşyaların əlamətini, rəngini, həcmini, dadını və s. bildirən sadə sözlər daxil edilməlidir. Tanıdığı əşyalar və hadisələr üzrə sual-cavab aparılır. Uşaqlar suallara cavab verməyi, şəkil üzərində cümlələr qurmağı öyrəndikdən sonra, onlara cümlələri kiçik bir hekayə şəklində birləşdirməyi öyrədirlər. Bu mərhələdə qısa şeirlərdən istifadə edilir.

Nitqin üçüncü inkişaf mərhələsində olan uşaqlar xüsusi məktəbəqədər müəssisələrin və məktəblərin əsas kontinqentini təşkil edir.

Bu kateqoriyalı uşaqlarla aparılan korreksion təlimin əsas məsələləri bunlardır:

- Dilin qrammatik və leksik vasitələrinin praktik mənimsənilməsi;
- Səsli nitqin tam yararlı halda formalaşması(artikulyasion vərdişlərin əldə edilməsi, düzgün tələffüz);
- Əlaqəli nitqin inkişafı;

Nitqin formalaşması fonematk qavramanın, səs və sözlərin düzgün tələffüzü, söz hissələrini ayırıb və birləşdirmək bacarığı, cümlədə sözlərin əlaqəsinə diqqət yetirmək əsasında həyata keçirilir.

Uşaqlarda planlı şəkildə nitqin mənası, səsi, morfoloji, sintaktik tərəfləri artdıqca nitq vasitələrinin mənimsəməsi baş verir, bu isə müstəqil ünsiyyət prosesində nitq zənginliyi və inkişafına aparır. (4)

Ümumi nitq geriliyi olan uşaqlar elə ilk məşqlərdən kommunikativ fəaliyyətə cəlb edilirlər. Fəaliyyətin müxtəlif növləri ilə əlaqədar nitq materialları mərhələlərlə toplanır. Nitq materiallarının seçilməsi kommunikativ məqsədlərə tabe olur, səmərəli və hamı tərəfindən başa düşüləcək formada təşkil edilir.

Beləliklə, aparılan sistemli və məqsədyönlü iş nəticəsində uşaqlarda düzgün səs tələffüzünə nail olmaq və nitq qüsurlarının qarşısını almaq olar.

**Ədəbiyyat:**

1. Xüsusi Pedaqogika N. Hüseynova , L.H.Rüstəmova Bakı-2007-146 s
2. Л.С. Волковой “Логопедия” М. 1989 -527с
3. https://studfile.net/preview/1741763/page:4/
4. http://www.dslib.net/korrekcion-pedagogika/formirovanie-glagolnogo slovoobrazovanija-v-strukture-preodolenija-sistemnogo/html

**Stages of speech development in children and main directions of logopedic work**

**Summary**

Lack of general development of speech is a speech disorder of varying difficulty.Ways to eliminate speech defects. Complex examination by logopedist. Stages of logopedic examination.

**Этапы развития речи у детей и основные направления логопедической работы**

**Резюме**

Отсутствие общего развития речи является речевым расстройством различной сложности. Способы устранения дефектов речи. Комлексное обследование логопедом. Этапы логопедической экспертизы.

**Rəyçi: ped.ü.f.d S.R.Aslanova**

DOI: 10.36719/AEM/2007-2019/49/91-91
**Afaq Gülağa qızı Salamzadə**
memmedovruslan955@gmail.com

# FUNKSİONAL DİSFONİYA, ONUN ETİOLOGİYASI VƏ SİMPTOKOMPLEKSİ
# ЕТИОЛОГИЯ И СИМПТОМОКОПЛЕКС ПРИ ФУНКЦИОНАЛЬНОЙ ДИСФОНИИ
# THE ETIOLOGY AND SYMPTOM COMPLEX IN FUNCTIONAL DYSPHONIA

(Tezislər)

***Açar sözlər:****səs,disfoniya,funksional disfoniya*
***Key words:****voice,dysphonia,functional dysphonia*
***Кпючевые слова:****звук,дисфония,функциональная дисфония*

Funksional disfoniya struktur olaraq tamamilə normal olan səs büküşlərinin,səsi yaradan qırtlağın və rezonansı yaradan udlaq və ağızın təqlid etmə funksiyasına və anatomiyasına baxmayaraq, insanın uyğun səs yaratma funksiyasını yerinə yetirə bilməməsi vəziyyətidir. Funksional disfoniya səs büküşlərinin yaxud da, səsin normadan kənar istifadəsidir. Orta əsrlərdə yaşamış alim Avisenna "Həkimlik elminin qanunu" əsərində bu vəziyyəti səsin süni istifadəsi, ya da səsin balanslaşdırılması zamanı qırtlaq funksiyalarında yaranan dəyişikliyin nəticəsi kimi göstərirdi.

Funskional disfoniyada səsin müxtəlif xüsusiyyətləri mənfi tərəfdən təsirlənə bilər. Buraya səsin fiziki parametrləri, yaxud ümumi keyfiyyətləri aid edilir. Fiziki parametrlərə-səsin gurluğu, hündürlüyü və s. aid edilir. Funksional disfoniyanın yaranmasına səbəb kimi psixoloji faktorlar və stressi də göstərmək olar.

Bu patologiyanın əsas əlamətlərindən biri odur ki, səsin yaşa və cinsə uyğun olmaması halıdır. Normal qırtlaq sistemində Puberfoniya (mutasiyalı falset) halı səsin yüksək diapazonlu, zəif olmasına və qadın səsi kimi incəlməsinə səbəb olur. Bu zaman isə səs tez yorulur və ondan istifadə çətinləşir. Bu hal iki amilə görə təsnif edilir: funksional və təbii.

Əksər funksional amillərə psixoloji problemlər səbəb olur. Yeniyetməlik dövründə, xüsusilə də oğlanların səslərində əsaslı dəyişikliklər özünü göstərir. Yeniyetməlik dövründəki oğlanlar öz yetkin rollarını qəbul edə bilməməkdən və yetkinlik dövrü dəyişikliklərinin verdiyi emosional stressdən əziyyət çəkirlər və bu hal onların səs diapozanının yüksəlməsinə səbəb olur.

Əksər təbii amillərə səs büküşü selikli qışasındakı anormallıqlar səbəb olur. Selikli qışadakı daralma və ya çapıqlar, ya da qırtlağın inkişafdan qalması səs büküşlərinin strukturunun qadınlardakı qırtlaq strukturuna oxşamasına səbəb olur.

Səs patologiyası və fiziologiyası sahəsində elmi problemlərin inkişafının əsasını E.N.Malyutin, F.F.Zasedatelev, Z.D.Rabotnov, İ.İ.Levidev, V.Q.Yermolayev qoymuşdurlar. Funksional disfoniya zamanı istifadə olunan metodların bir neçəsini qeyd etmək olar.

1.Qırtlağa mexaniki təsir göstərmək. Bu zaman ağrı və boğulma yaranır. Problemi olan şəxs qışqırır və səs əmələ gəlir.

2.Qırtlağa müxtəlif qıcıqlandırıcı və mexaniki əşyaların daxil edilməsi

3.Narkozun istifadəsi

4.Qırtlağın vibrasiya masajı

5.Ortofonik metod

Bundan əlavə, müalicə zamanı lazımi maye qəbulu, siqaretdən uzaq dayanılması, ümumi stressin azaldılması, uyğun səslə və nəfəs dəstəyi ilə danışma, boğazı tez-tez təmizləmə-arıtlama vərdişindən qaçınılması kimi patologiyası olan şəxsin özbaşına tətbiq edə biləcəyi üsullar də müalicənin düzgün gedişi baxımından çox əhəmiyyətlidir.

**Rəyçi: dos. S. Aslanova**

DOI: 10.36719/AEM/2007-2019/49/131-134
**Nuranə Adil qızı Abdullayeva**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyasının
abdullayevanurana@yahoo.com

# KLASSİK VƏ MÜASİR BƏDİİ ƏDƏBİYYAT NÜMUNƏLƏRİNƏ ÇƏKİLMİŞ İLLÜSTRASİYALARIN BƏDİİ XÜSUSİYYƏTİ

***Açar sözlər:*** *Qrafika, klassika, illüstrasiya, obraz, ədəbiyyat, müasir*
***Key words:*** *Graphic, classic, illustration, form, literature, modern*
***Ключевые слова:*** *Графика, классика, образ, литература, современный*

Ölkənin sovetləşməsindən sonra Azərbaycan təsviri sənətində kitab qrafikasının davamlı və rəngarəng formalarda təşəkkül tapması həm də bu sahədə zəngin təcrübənin mövcudluğu ilə bağlı idi. Bu ilk növbədə hələ orta əsrlərdən başlayaraq Azərbaycanda kitab mədəniyyətinin duyulası bir yüksəlişlə inkişaf etməsi ilə bağlı olmuşdur. Səhifələri miniatür üslubunda çəkilmiş illüstrasiyalarla bəzədilmiş əlyazmaların zamanında ən qiymətli ərməğana çevrilməsi də həmin şöhrəti təsdiqləyir. Şərq və Azərbaycan poeziyasının məşhur şairlərinin əsərlərinə çəkilmiş həmin illüstrasiyalarda sırf poetik mətnlərin məzmunu ilə səsləşən bədii şərhlərlə yanaşı, rəssam təxəyyülünün nəticəsi olan və müəyyən qədər də müstəqil mahiyyət daşıyan təsvirlərə rast gəlmək mümkündür. Qeyd edək ki, Azərbaycan kitab qrafikasının XX yüzilliyi əhatə edən inkişaf mərhələsində də rəssamların müxtəlif nəsillərinin nümayəndələri demək olar ki, bu ənənəni layiqincə davam etdirmiş, ona yeni-yeni bədii-estetik keyfiyyətlər əlavə etmişlər. Bununla belə demək lazımdır ki, kitab qrafikasının 1920-1940-cı illəri əhatə edən təşəkkülü əsasən realist-gerçəkçi bədii ənənələrə tapınmaqla inkişaf etmişdir. İyirminci illərdə bunun ən yaxşı nümunələrini görkəmli fırça ustası Əzim Əzimzadə yaratmışdır. O, əvvəlcə “Hophopnamə”nin 1914-cü ildə işıq üzü görən ikinci nəşrinə 24 rəsm çəkmiş, ölkənin sovetləşməsindən sonra – 1922-ci ildə çap olunan yeni kitaba isə daha 34 illüstrasiya işləmişdir. Ə.Əzimzadənin kitab qrafikası yaradıcılığı isə təkcə “Hophopnamə”yə münasibətlə məhdudlaşmır. Onun otuzuncu illərdə Cəlil Məmmədquluzadənin (“Bəlkə də qaytardılar”), Ə.Haqverdiyevin (“Mənim marallarım” və “Cəhənnəmdən məktublar”), A.Divanbəylinin (“Ürək yanğısı”), N.Nərimanovun (“Pir”), H.Sarabskinin (“Köhnə Bakı”), B.Talıblının (“Erkək Tükəzban” və Qırx zərbə”), A.Şaiqin (“Tülkü həccə gedir”) və s. məşhur müəlliflərin əsərlərinə verdiyi bədii tərtibatlar və çəkdiyi illüstrasiyalar mətnə yaradıcı müdaxiləsi və onun oxucu üçün maraqlı edə bilməsi ilə yadda qalır.

Otuzuncu illərdə dünya ədəbiyyatının Firdovsi, Nizami, M.F.Axundzadə, Ş.Rustaveli, A.S.Puşkin və L.N.Tolstoy kimi görkəmli simalarının yubileylərinin qeyd olunması onların yaradıcılığına rəssamların bədii münasibətini şərtləndirmişdir. Bir çox Azərbaycan rəssamının həmin müəlliflərin müxtəlif mövzulu əsərlərini özünəməxsus “oxunuşu”nun sayəsində kitab qrafikası sahəsində maraqlı nümunələr yaranmışdır. R.Mustafayev, L.Kərimov, M.Şirinov, Y.Şalıgina, İ.Axundov, K.Kazımzadə, Ə.Məmmədov, Q.Xalıqov və Ə.Hacıyevin o dövrdə ərsəyə gətirdikləri nümunələrlə milli kitab mədəniyyəti ənənələrindən yaradıcılıqla faydalandıqlarını sərgiləmişlər.

Azərbaycanın ilk ofortçularından sayılan Əliağa Məmmədov Moskvada təhsilini başa vurarkən diplom işini Nizami Gəncəvi yaradıcılığına həsr etmişdi. Onun ofort texnikasında işlədiyi silsilə əsərlərdə “Xəmsə”nin müxtəlif süjetləri öz əksini tapmışdır. “Məcnun atası ilə”, “Leylinin ölümü”, “Məcnun Leylinin məzarı üstündə”, “İki bayquşun söhbəti” və s. ofortlarında rəssam realist-gerçəkçi bədii vasitələrlə Nizami dünyasına - onun müxtəlif poemalarının qəhrəmanlarının yaşantılarına təsirli bədii görkəm verməklə, təzadlı hadisələrin daşıyıcısı olan qrafik lövhələri mənəvi-düşündürücü qaynağa çevirə bilmişdir.

Sonralar həm də Nizami Gəncəvinin portretinin yaradıcısı kimi tanınacaq Qəzənfər Xalıqov otuzuncu illərdə kitab qrafikası sahəsində də səmərəli fəaliyyət göstərmişdir. Onun M.Seyidzadənin (“Nərgiz”), Ş.Rustavelinin (“Pələng dərisi geymiş pəhləvan”) və Ə.Vahidin (“Qəzəllər”) kitablarına çəkdiyi illüstrasiyalarda müəllif düşüncələrinə edilən rəssam nüfuzetməsi realist-gerçəkçi bədii görüntüyə çevrildiyindən, onların hər biri oxucu təxəyyülündə gerçəkləşən hadisə və obrazlarla səsləşmə gücünə görə cəlbedici və duyğulandırıcı baxılırlar.

Q.Xalıqovun Azərbaycan klassik ədəbiyyatına çəkdiyi illüstrasiyalarda qədim kitab mədəniyyətimizə müasir münasibət duyulduğundan onlar kifayət qədər cəlbedici və yaddaqalan idilər. Bu mənada onun Nizaminin “İskəndərnamə” (1953) və Xaqaninin “Şeirlər” (1955) kitablarına çəkdiyi illüstrasiyaların özünəməxsus bədii tutuma malik olduğunu qeyd etmək lazımdır. Bu özünəməxsusluğu ilk növbədə onun hər iki görkəmli söz xiridarının mənəvi-psixoloji yaşantılarına müvafiq bədii görüntü verməsi şərtləndirir.

Q.Xalıqov nəslinin digər nümayəndəsi Əmir Hacıyevin yaradıcılığında da ədəbiyyat nümunələrinə çəkilmiş illüstrasiyalar mühüm yer tutur. Otuzuncu illərdə Azərbaycan Dövlət Nəşriyyatında baş rəssam vəzifəsində çalışan Ə.Hacıyev müxtəlif dövrlərdə qələmə alınmış ədəbi nümunələrə yaddaqalan tərtibatlar vermişdir.

Azərbaycan kitab qrafikasının 30 - 40-cı illər mərhələsində özünəməxsus bədii ifadə nümunələri sərgiləyən müəlliflərdən biri də Kazım Kazımzadə olmuşdur. Şərq və Azərbaycan tarixinə dərindən bələd olan rəssam bu biliklərini müxtəlif yazıçı və şairlərin əsərlərinə çəkdiyi illüstrasiyalarda ifadə etmişdir. Bunu onun M.F.Axundzadə və N.Gəncəvi ünvanlı kitab tərtibatları da təsdiqləyir.

Rəssamın M.F.Axundzadənin anadan olmasının 125 illiyi münasibətilə işıq üzü görmüş kitaba verdiyi tərtibatda və çəkdiyi illüstrasiyalarda onun ədəbi mətnə reallıq və təxəyyül prizmasından baxışının vəhdətini görmək mümkündür.

K.Kazımzadənin "İskəndərnamə"nin birinci kitabına (1941) və "Sirlər xəzinəsi" (1947) əsərinə, eləcə də "Fitnə", "Sehirli üzük" və "İskəndər və çoban" (1941) poemalarına çəkdiyi illüstrasiyalarda Nizami irsinə bələdçiliyi və bunun mətnlə səsləşən bədii şərhi mövcuddur, desək, yanılmarıq.

Kazım Kazımzadə 1947-ci ildə klassik şair Nizami Gəncəvinin "Leyli və Məcnun" əsərinə biri-birindən maraqlı illüstrasiyalar yaradır. Qələm və kömürlə yaradılmış bu əsərlərdə şərq xüsusiyyətləri açıq aydın öz əksini tapmışdır. "Məktəbdə", "İlk görüş", "Məcnun vəhşi heyvanlar arasında", "Məcnun və Zeyidin görüşü" əsərlərində şərq ədəbiyyatının ən faciəli obrazı öz əksini tapmışdır.

1947-ci ilin sonunda Kazım Kazımzadə Əlişir Nəvainin "Fərhad və Şirin" əsərinin tərtibatına başlayır. Yerinə yetirilmiş hər bir əsərlər qələm texnikasında icra olunmasına baxmayaraq, obrazlar daha dolğun şəkildə yerinə yetirilmişdir. Rəssam bu əsərlərdə sadə şəkildə məhəbbətin tükənməz gücünü verməyə nail olmuşdur.

M.Rəhmanzadənin qırxıncı illər yaradıcılığında görkəmli dramaturq-şair Cəfər Cabbarlı yaradıcılığına müraciəti davamlı olmuşdur. Belə ki, o, həm "Qız qalası" poemasını, həm də "Gülzar", "Vəfalı Səriyyə" hekayələrini, "Oqtay Eloğlu", "Aydın", "Nəsrəddin şah" pyeslərinə illüstrasiyalar çəkmişdir. Bu kitab qrafikası nümunələrində rəssam müraciət etdiyi ədəbi nümunələrin ruhuna uyğun bədii görüntülər yaratmaqla, onların hər birinin hadisələrini və qəhrəmanlarını oxucuya yaxınlaşdırmış, nəzmununu daha da anlaşıqlı etmişdir.

Elə həmin ildə M.Rəhmanzadə daha bir məşhur müəllifin əsərinə illüstrasiyalar çəkmişdir. Bu, M.F.Axundzadənin "Aldanmış kəvakib" (1950) povesti idi. Əsərin ən səciyyəvi məqamlarına bədii görüntü verən rəssam, bununla da fəlsəfi tutumlu ədəbi materialın oxunaqlı olmasını əyaniləşdirmiş olmuşdur. Eyni cür bədii yanaşmaya M.Rəhmanzadənin S.Rəhmanın ("Nina"), S.Rəhimovun ("Aynalı"), A.S.Puşkinin ("Yevgeni Onegin"), M.Y.Lermontovun ("Bizim zəmanənin qəhrəmanları") əsərlərinə çəkilən illüstrasiyalarda da rast gəlinir.

Hələ gəncliyindən həm yaradıcı potensialını, həm də qrafikanın müxtəlif sahələrində özünü uğurla sınayan M.Abdullayev qırxıncı-əllinci illərdə kitab qrafikasında da yaddaqalan nümunələr yaratmışdır. Qeyd edək ki, onun həm klassik, həm də müasir ədəbi nünunələrə çəkdiyi illüstrasiyalarda mətnləri əyaniləşdirən təsvirlərin inandırıcılığı kifayət qədər duyulandır. Bunu müəllifin M.Qorkinin ("Ana"), M. İbrahimovun ("Gələcək gün"), M.Hüseynin (Komissar"), S.Rəhimovun ("Şamo") və C.Məmmədquluzadənin ("Hekayələr") əsərlərinə çəkilmiş illüstrasiyalarda görmək mümkündür.

Bu yerdə deyək ki, müharibədən sonrakı dövrdə kitab nəşrinin genişlənməsi və rəssamların onun tərtibatına cəlb olunması ilk növbədə düşmən üzərində qələbənin əldə olunması ilə bağlı olmuşdur. Belə ki, qanlı-qadalı döyüşlərin getdiyi bir vaxtda istər-istəməz kitab çapı ikinci plana keçirilmiş, əsasən ideoloji təbliğatın gücləndirilməsində yardımçı ola biləcək plakat və karikaturaya üstünlük verilmişdi. Paytaxtda fəaliyyət göstərən "Azərnəşr" və "Uşaqgəncnəşr" nəşriyyatlarında cəmiyyətin bütün təbəqələri üçün nəzərdə tutulan müxtəlif mövzulu kitabların çapı davamlı şəkil almışdı. Bu mənada müharibə öncəsi kitab tərtibatında uğurlu nümunələr yaradan rəssamların yenidən bu işə cəlb olunmasını vurğulamaq olar. K.Kazımzadə, M.Abdullayev, Q.Xalıqov, M.Vlasov, S.Vlasova, M.Rəhmanzadə, O.Sadıqzadə və başqa rəssamların əllinci illərdə işıq üzü görən əksər kitabların bədii tərtibatında iştirakı da bunu təsdiqləyir.

Kitab qrafikasına bilavasitə müharibədən sonra müraciət edən O.Sadıqzadənin yaratdığı illüstrasiyaların reallığı həm də qrafik həllin cəlbediciliyinə bələndiyindən onlar kitabla təmasda olan hər kəs üçün anlaşıqlı və yaddaqalandırlar. Bu mənada rəssamın İ.S.Turgenevin "Atalar və oğullar" (1948), O.Balzakın "Qorio ata" (1949), M.Qorkinin "Artamonovun işi" (1950) əsərlərinə çəkdiyi müasir ruhlu illüstrasiyaların adını çəkmək olar.

Bunun ardınca O.Sadıqzadə hər bir sənətkardan ciddi yaradıcılıq axtarışları tələb edən bir işə başlayır və düz on il (1954-1964) ərzində bu yöndə işləyir. Rəssamın bu işi V.Hüqonun "Səfillər" romanı ilə bağlı

olmuşdur. Romanın beş hissəsini əhatə edən 29 illüstrasiyada tarixi hadisələrin gərginliyi duyulan süjetlərə onların inandırıcılığını şərtləndirən bədii tutum verildiyindən, onlar bu günə kimi Azərbaycan kitab qrafikasının dəyərli nümunələri kimi əhəmiyyətini qoruyub saxlamaqdadır.

1960-cı illər qrafikasının ümumi mənzərəsinin rəngarəngliyini və yüksək bədii-estetik dəyər daşımasını həmin illərdə yaradılan kitab qrafikası nümunələri də təsdiqləyir. Tanınmış qrafika ustası Maral Rəhmanzadə əvvəlki illərdə olduğu kimi yenə də müxtəlif, o cümlədən də kitab qrafikası sahəsində uğurla fəaliyyət göstərir. Onun altmışıncı illərdə Heyran xanımın qəzəllərinə (1962) çəkdiyi illüstrasiyaları bədii tutumuna görə kitab qrafikasına verilən yaddaqalan töhfə saymaq olar.

Əllinci illərin sonunda Moskvadakı təhsildən sonra vətənə dönən Yusif Hüseynovun yaradıcılığında da kitab qrafikası önəmli yer tutur. Onun N.Nərimanovun (“Bahadur və Sona”), A.Şaiqin (“Seçilmiş əsərlər”), B.Talıblının (“Hekayələr”), T.Qarabağlının (“Kiçik hekayələr”) və M.Əliyevin (“Dağlar oğlu”) müxtəlif mövzulu kitablarına illüstrasiyalar çəkməsi də bunu təsdiqləyir.

İstedadlı rəngkar kimi tanınan R.Babayevin altmışıncı illər yaradıcılığında kitab qrafikası da önəmli yer tutmuşdur. Uşaqlar üçün yazılmış “Tık-tık xanım”(1961) və “Cırtdan” (1963) kitablarının illüstrasiyaları əlvanlığı ilə diqqət çəkir.

Öz yaradıcılığında kitab qrafikasına yer ayıran Altay Hacıyevin ilk müraciətindən dörd il sonra yenidən “Şəngülüm, Şüngülüm, Məngülüm” (1964) adlı uşaq nağılına qayıtması heç də təsadüfi deyildi. Bunun başlıca səbəbi onun bu kitabın tərtibatında miniatür ənənələrinə tapınmaqla, özündə ənənə ilə müasirliyin qovşağını yaşadan illüstrasiyalar yaratmaq istəyi idi. Doğrudan da onun yeni illüstrasiyalarında miniatürlərə xas dekorativlik, bədii şərtilik və rəng parlaqlığı xas idi.

Həmin illərdə rəssam daha bir-neçə kitab qrafikası nümunəsi yaradıb. Bunlar “Koroğlu” dastanının, N.Xəzrinin “Sumqayıt səhifələri”, “E.Mejelaytesin “İnsan”, H.Mehdiyevin “Maraqlı tarixçələr” kitablarının tərtibatıdır.

Sənətsevərlərə daha çox rəngkarlıq əsərləri ilə tanış olan D.Kazımovun altmışıncı illərdə kitab qrafikası sahəsində ərsəyə gətirdiyi əsərlərdə də özünəməxsusluq duyulur. Onun bu bədii xüsusiyyətə qara tuşla ifadə olunan cizgilərlə nail olduğunu vurğulamaqla, demək lazımdır ki, bu qrafik zərifliyin mətndən “boylanan” hadisə və obrazların daha təsirli alınmasında böyük rolu olmuşdur. Rəssamın Yusif Vəzir Çəmənzəminlinin (“Cənnətin qəbzi”), Nizami Gəncəvinin (“Yaralı oğlan”), Abdulla Şaiqin (“Bənövşə”) və Cəlil Məmmədquluzadənin (“Buz”) kitablarına çəkdiyi illüstrasiyalarda müxtəlif mövzuların-müəllif düşüncələrinin incə cizgilərlə bədii təqdimatını görmək mümkündür.

M.Ə.Sabirin vəfatından sonra “Hophopnamə”nin şairin 100 illik yubileyi münasibətilə yenidən işıq üzü görən (1962) nəşrinin tərtibatını Nəcəfqulu İsmayılov həyata keçirmişdir. Ə.Əzimzadə və İ.Axundovdan sonra Sabir irsinə münasibət bildirən rəssam, şairin məşhur şeirlərinin qəhrəmanlarına bir qədər fərqli bədii münasibət bildirməyə nail olsa da, bütünlükdə dahi sələfinin təsirindən çıxa bilməmişdir.

Yeri gəlmişkən qeyd edək ki, dahi satirikin bu əvəzsiz irsinə əvvəlkilərdən fərqli yaradıcılıq mövqeyini yalnız o vaxtlar çox gənc olan Arif Hüseynov (1980) nümayiş etdirə bilmişdir. Doğrudan da onun ağ-qara rəsmlərində əvvəlkilərin sərgilədikləri qabarıq satira, həm də düşündürücü bədii-fəlsəfi məzmuna bələnmişdir. Əlavə edək ki, o vaxtlar hələ gənc olan A.Hüseynov sonrakı illəri əhatə edən yaradıcılığında kitab qrafikasından ayrılmamış və onlarla müxtəlif mövzulu kitablara illüstrasiyalar çəkmişdir.

Sonda deyək ki, altmışıncı-səksəninci illərin kitab qrafikasının özünəməxsus bədii tutum almasında yuxarıda adları çəkilən yaradıcılarla yanaşı, bir çox digər rəssamların da xüsusi xidmətləri olmuşdur. Onların sırasında Y.Şalıgina, E.Dadaşov, F.Quliyev, H.Ağayev, R.Talıbov, A.Ələkbərov və b. duyulası rolu olmuşdur.

**Ədəbiyyat:**

1. Azərbaycan incəsənəti. Kərimov K., Əfəndiyev R., Rzayev N., Həbibov N. Bakı: İşıq, 1992, 344 s.
2. Ağayev V. Kitab qrafikasında rəsm. Bakı: Beynəlxalq Aeroport, 2006. 152 s.
3. Kərimova S. Kazım Kazımzadə. Bakı: 2014. 303, s.
4. Əliyev Z. Sənətkar ömrü. Bakı: 1993. 32 s.:
5. Həbibov N. Rəssam və kitab. // “Ədəbiyyat və incəsənət” qəz., 1966, 7 may.
6. Mehdiyev R. Dəzgah qrafikası və kitab sənəti. Elmi axtarışlar, IV toplu, Bakı, 2005.
7. Гаджиев П. Азербайджанская Советская графика – Баку: изд-во АН Азербайджанской ССР, 1962.

**Artistic features of illustrations drawn for classic and modern fiction examples**
**Summary**

Celebration of jubilee of famous personalities of world literature in thirties years such as Firdovsi, Nizami, M.F Akhundzade, Sh.Rustaveli, A.S. Pushkin and L.N Tolstoy arranged artists' graphic attitude to to their creativity. Interesting examples in the field of book graphics have emerged due to unique “reading” of various thematic works of those authors by many Azerbaijani artists. R.Mustafayev, L.Karimov, M.Shirinov, Y.Shaligina, I.Akhundov, K.Kazimzade, A.Mammadov, G.Khalikov and A.Hajiyev demonstrated the creative use of national book culture traditions with examples established durng that period.

In conclusion, in addition to the aforementioned authors, many other artists also had a special role in capturing the unique literary peculiarities of book graphics in the sixties and eighties years. Among them Y.Shaligina, E.Dadashov, F.Guliyev, H.Aghayev, R.Talibovm A.Alakbarov and others played an important role.

**Художественные особенности иллюстраций к произведениям классической и современной литературы**
**Резюме**

Тридцатые годы будут ознаменованы юбилеями таких корифеев мировой литературы, как Фирдоуси, Низами, М.Ф. Ахундзаде, Ш. Руставели, А. Пушкин м Л.Н. Толстой, и этот факт обусловил художественный интерес художников к их творчеству. Благодаря особенностям прочтения многими художниками произведений вышеуказанных авторов различного жанра, ими были созданы уникальные графические произведения. Созданными в тот период иллюстрациями Р. Мустафаев, М. Ширинов, Е. Шалыгина, И. Ахундова, К. Казымзаде, А. Мамедов, Г. Халыгов и А. Гаджиев обогатили традиции национального книгоиздания, и позволило им демонстрировать свои миниатюры на различных выставках.

В конце хочется отметить, что в расцвет искусства книжной графики 60-80-х годов наряду с вышеуказанными авторами снесли свой вклад и многие другие авторы. Среди них необходимо отметить особую роль таких художников, как Е. Шалыгина, Э. Дадашов, Ф. Гулиев, Г. Агаев, Р. Талыбова, А. Алекберов и другие.

**Rəyçi: dos. M.Hüseynova**

DOI: 10.36719/AEM/2007-2019/49/135-140

**Aygün Atif qızı Səmədzadə**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
E-mail: aygün.samedzadeh@mail.ru

# XALQ RƏSSAMI KAMİL XANLAROVUN YARADICILIĞI

***Açar sözlər:*** *rəssam, Kamil Xanlarov, mənzər, portret, teatr, dekorasiya, milli, ənənə, kompozisiya, üslub, kolorit.*
***Key words:*** *artist, Kamil Khanlarov, landscape, portrait, theater, decoration, national, tradition, composition, style, color.*
***Ключевые слова:*** *художник, Камиль Ханларов, пейзаж, портрет, театр, декорация, национальный, традиция, композиция, стиль, цвет.*

Azərbaycan təsviri sənətinin parlaq səhifələrindən biri olan XX əsr milli təsviri sənətin xalq ənənələrinin müxtəlif çalarları, dünya mədəniyyətinin nailiyyətləri üzərində inkişaf tapmasına əsaslı şəkildə təsir göstərdi. Təsviri sənətin yeni yaradıcılıq meyarları əsasında istiqamət götürməsi özünəməxsus yaradıcılıq xüsusiyyətləri ilə fərqlənən bir sıra istedadlı rəssamların yetişməsi ilə müşayiət olunmağa başladı. Xalq rəssamı Kamil Xanlarovun adı onların içərisində aparıcı yerlərdən birini tutur. O, müasir Azərbaycan təsviri sənətinin formalaşmasında xüsusi xidməti olan sənətkarlardandır.

Kamil Xanlarovun yaradıcılığı mövzu və janr rəngarəngliyi, fərdi üslub və metodları ilə seçilir. O, daim yeni bədii təsvir vasitələri axtarır, yeniliyə can atır, ifadə tərzi ilə diqqəti cəlb edir. Onun məişət, natürmort, mənzərə və portret janrında yaratdığı əsərlər zənginliyi ilə yadda qalır. Obrazlarını yaratdığı şəxsiyyətlərin həyat və məişətinə, dünyagörüşünə, düşüncə tərzinə özünəməxsus baxışı Kamil Xanlarovun əsərlərinin dəyərini artırır, bu əsərləri seyr edən tamaşaçının ürəyində dərin izlər buraxır. O, keçmiş bədii irsin ən gözəl ənənələrinə və realist sənətin mütərəqqi nailiyyətlərinə əsaslanaraq, müxtəlif janr, mövzu, üslub seçimi ilə fərqlənən yüksək sənət nümunələri yaratmışdır. Fərdi qabiliyyəti və istedadı, məqsədyönlü axtarışları, özünəməxsus emosional və orijinal təsvir vasitələri Kamil Xanlarovun, Azərbaycan incəsənət tarixində xüsusi yer tutan, çoxsaylı əsərlər yaratmasına gətirib çıxarmışdır.

Kamil Xanlarov mənzərə janrında çox məhsuldar və müvəffəqiyyətlə işləmişdir. Onun mənzərələri lirik və emosionaldır, ovqatlıdır. Təbiətin vəziyyətini çox incəliklə tamaşaçıya çatdırır. O, gördüklərini dərhal, bir anlığa təsvir etməyə çalışır, gördükləri haqqında düşünür və özünün doğma təbiətə münasibətini, öz ruhi vəziyyətini tamaşaçı ilə bölüşməyə cəhd edir. onun mənzərələri konkret və lakonikdir, onların əsasını həmişə real müşahidələr təşkil edir. Mənzərə janrında rəssam üçün məkan ritmləri, rəng müstəvilərinin naxışı, xətlərin, rənglərin ahəngdarlığı bir mövzu kimi o qədər də vacib deyil. Onun üçün başlıca cəhət ruhi vəziyyəti rəngin musiqisi ilə ifadə etməkdən, tamaşaçının diqqətini gözəllik üzərinə yönəltməkdən, ona təsir etməkdən ibarətdir.

Rəssamın kətanlarında parlaq rənglərin dolğunluğu, harmonik əhəmiyyətli rəng bütövlüyü aydın nəzərə çarpmaqdadır. Məhz bu əsərlərdə müəllifin həmişə özünə zəngin yaradıcılıq mənbə hesab etdiyi miniatür sənətinə sadiqliyi bir daha qabarıq şəkildə özünü büruzə verir. Rəssamın «Cənub sərhəddində», «Noraşen vadisi», «İlanlı dağ», «Bilgəhdə sübh çağı», «Köhnə Abşeron» və sair kimi lövhələrində miniatür şeriyyəti ön planda dayanır. «Şərq natürmortu» adlı güclü koloritə malik, qırmızı və sarı, firuzəyi, göy rənglərin çalarlarında işlənmiş əsərini də bu silsiləyə daxil etmək mümkündür.



İlanlı dağ

Rəssamın mənzərələrini digərlərindən fərqləndirən xüsusiyyətlər onun miniatürlərə müraciət etməsi, rənglərlə verdiyi təzadlar və həmçinin mənzərələrində dekorativliyi əks etdirməsidir. Mütəxəssislər onun yaradıcılıq uğurlarının əsasında miniatür sənətinə bağlılığının dayandığını qeyd edirlər. Həm də fırça ustasının mənzərə janrına xüsusi sevgisi doğma vətənə hədsiz məhəbbəti ilə əlaqələndirilir.



Mənzərə

Kamil Xanlarov bütün yaradıcılıq boyu portret janrına tez-tez qayıdır. Rəssam öz tablolarında və portretlərində xalqımızın əfsanəvi qəhrəmanlarına və zəhmətkeş qadın obrazlarına xüsusi yer verirdilər. On illər ərzində o, özünə yaxın adamların, dost və tanışlarının, qohum-əqrabasının və eləcə də seçilmiş mədəniyyət xadimlərinin, klassik söz sənəti ustalarının, müasir ziyalılarımızın, şəhər və kənd əməkçilərinin iri portretlərini çəkmişdir. Bunların bir neçəsini qeyd etmək yerinə düşərdi: «General Rəsulbəyov», «Toxucu Zərifə», «Çoban», «Tikinti fəhləsi», «A.M.Şərifzadə «İblis» rolunda» /H.Cavidin «İblis» pyesində/, «Böyük şair Füzulinin portreti» və s.

Rəssamın həyat yoldaşı «Rövşənə»nin portretində romantizm ön plandadır: baxdıqca insanda ev rahatlığı, həyat və məişət təbiiliyi, həmçinin potetik lirika açıq görünməkdədir.

Milli sənətin zəngin ənənələrinə yaxından bələd olan rəssam, surətlərin mənəvi aləminin, psixologiyasının təhlilinə xüsusi fikir verirdi. Rəssamın portretlərində ümumiləşmə güclü olsa da, ayrı-ayrı insanlara məxsus xarakter bütövlüyü, münasibət ayrılığı, nikbinlik, cəlbedicilik də nəzərdən qaçırılmamışdır. Bir sözlə, portret janrı imkan vermişdir ki, rəssam şəxsiyyəti bütün zənginliyi, xarakter rakursları ilə göstərə bilsin. Rəssamın ən yaxın və sevimli dostu Səttar Bəhlulzadənin başına qırmızı çalma bağlamış halda portreti məhz beləcə işlənmişdir.

Rəssamın hərtərəfli yaradıcılığında kino və teatr tərtibatı ilə bağlı dekorasiya və geyim eskizləri böyük maraq doğurur. O, hələ müharibədən qabaq (1939-cu ildə) Bakı kinostudiyasının istehsalı olan “Kəndlilər” filminə kişi geyimlərinin eskizlərini vermişdir.

Hazırda sevə-sevə izlədiyimiz bu filmləri seyr edərək, nədənsə, onların daha maraqlı baxılması, filmin süjet xəttinin açılmasına, xidmət edən məkanın seçilməsi və ya hazırlanması, həmçinin obrazların filmin ideya qayəsi ilə səsləşən geyim eskizləri və s. cəhətdən dolğun alınmasında rəssamların gərgin əməyinə bir o qədər də diqqət ayırmır.

Məlumdur ki, geyim üzrə rəssam kino üçün geyim hazırlamaqdan məsuldur. Onun vəzifəsi bütün personajların vizual obrazını yaratmaqdır. Geyim üzrə rəssamın

yaratdığı obraz rejissor tərəfindən xarakterin görmə qabiliyyətinə uyğun olmalıdır və eyni zamanda geyim personajın xarakterinə və dövrünə uyğun olmalıdır, kostyumun istehsalı büdcəyə və istehsalçı tərəfindən ayrılan müddətlərə uyğun olmalıdır.

Dram elementləri olan tarixi filmlərdə uğurla işləyən rəssam gözəl geyim ustası kimi də ad çıxarıb. Bu filmlərdə çoxsaylı geyim eskizləri yaradan rəssam əlvan rənglərlə diqqəti cəlb edib. Ssenari ilə yaxından tanış olan K. Xanlarov geyimlərdə dövrün mədəniyyətini, xüsusiyyətlərini göstərə bilib. Bu, rəssamın «Fətəli xan» (1947-ci il) filmi üçün işlənmiş geyim eskizlərində də özünü göstərmişdir.

Azərbaycanın geyim tarixinin mahir bilicisi olan sənətkar etnoqrafik baxımdan düzgün-dürüst geyim nümunələrinin eskizlərini işləmişdir.






“Fətəli xan” filminə çəkilmiş Usta Səməndər, Əmirhəmzə, İran Sərdarı surətinə çəkilmiş geyim eskizləri

Tamaşaçıda hətta cüzi şübhə belə yaranmır ki, geyim dəsti həmin dövrün məhsulu deyil. Rəssam peşəkarlığı ilə tamaşaçını inandırmağa, onun yüksək səviyyədə hazırladığı paltarla həyəcanlanmağa vadar edir. Bu həm də rəssamın eskizləri əsasında reallaşdırdığı quraşdırılmış səhnələrin yaradılmasına da aiddir.

Kamil Xanlarov teatr rəssamı kimi çalışmış, Azərbaycan Dövlət Dram teatrında səhnəyə qoyulmuş Abdulla Şaiqin «Nüşabə» dramının (1947-ci il) tərtibatını vermişdir.

Teatr-dekorasiya rəssamlığı təsviri sənətin spesifik bir sahəsini təşkil edir. Bu və ya digər həyat səhnəsini, təbiət mənzərəsini əks etdirən tablodan fərqli olaraq teatr-dekorativ rəssamlığında bədii obraz müstəqil şəkildə deyil, səhnə tamaşasının ideya məzmunu ilə üzvi rabitədə təzahür edir. Çünki teatr rəssamlığı, tamaşaların bədii tərtibi ilə əlaqədardır. Səhnə tərtibatının özü də sintetik sənətdir. Rəssamlıq, dekorativ-tətbiqi sənət, memarlıq, heykəltəraşlıq elementləri bir-birinə qovuşaraq səhnə tamaşasının bədii tərtibatını əmələ gətirir.

Bu əsəri bir anlığa göz önünə gətirərək onun mövzusu, dövrün üslubu, qəhrəmanların hərtərəfliliyi barədə geniş fikir söyləyə bilərik ki, bunların da hamısı Kamil Xanlarova əsas verirdi ki, hələ o vaxtlar özünəməxsus tərtibat üslubu, kompozisiya həlli tapa bilsin.

Kamil Xanlarovun səhnə yaradıcılığında aşkar olunmuş xarakterik dəqiqlik, psixoloji mənalandırma və sətiraltı mahiyyətlər də onun mövzuya ciddi münasibətindən yaranırdı. «Nüşabə» pyesinin sənədlilik mahiyyəti, əsərin obrazlı ifadə tərzi düşüncəli, savadlı və romantik müəllif şəxsiyyəti ilə birləşir.









A.Şaiq. "Nüşabə" tamaşasından Uluq bəy, Kənkan, Orxan, Dilbər, Nüşabə, Almaz, Sabutay surətinə çəkilmiş geyim eskizləri. ADDT 1946-47-ci il mövsümü

Kamil Xanlarov 1961-ci ildə Çexoslovakiyada yaradıcılıq ezamiyyətində olmuş və orada yaradıcılıq imkanlarını genişləndirərək, ölkəsinə məna və məzmun dolğunluğu ilə seçilən maraqlı əsərlərlə qayıtmışdır. Çexoslovakiyaya yaradıcılıq səfəri onun yaradıcı həyatında mühüm mərhələ sayılmalıdır. Bir ay ərzində rəssam Praqa, Karlovı Varı, Bratislava kimi şəhərlərdə olur və zəngin material toplaya bilir. Bu səfər rəssamın yaradıcılığında yeni bir uğurlu yaradıcılıq istiqamətinin açılması ilə nəticələnmişdir. Onun diqqətini, ilk növbədə şəhərdə aparılan geniş inşaat işləri cəlb etmişdir. Bununla bərabər, rəssam xalqın məişətinə, adamların mənəvi həyatına da nüfuz edir, məhəbbət arzusu ilə yaşayan sevgililərin, mehriban baxışlı qızların, kafedə istirahət edən cavanların surətlərini verir.

Çexoslovakiyaya həsr edilmiş tablolarına “Karlovı Varıda meydan”, “Qızıl küçə”, “Praqada qüllə”, “Yan Qusun abidəsi” əsərlərini qeyd etmək olar. Bu əsərlər həm mövzunun şərhi, kolorit həlli və həm də peşəkar texniki işlənilmə xüsusiyyətləri ilə diqqəti cəlb edir.

Kamil Xanlarov tərəfindən çəkilmiş “Müqəddəs Vita kafedral kilsəsi” adlı əsəri olduqca şairanədir. Praqa şəhərində yerləşən və qotik üslubda inşa olunmuş Kafedral kilsə bu əsərdə əzəmətli görünüşü ilə diqqəti cəlb edir.



Müqəddəs Vita kafedral kilsəsi

Kamil Xanlarov yaradıcılığı tükənməz bir xəzinədir. Təbiətən yorulmaq bilməyən, daim axtarışda olan rəssam şəxsiyyəti və əsərləri hələ sovet dövründə qədirbilən xalqımız tərəfindən layiqli qiymətini almışdır.

Rəssamın əsərləri Azərbaycanın hüdudlarından kənarda şəxsi kolleksiyalarda və respublikamızın muzeylərində saxlanılır. Bir çox əsərləri Avstriya, Macarıstan, Rumıniya, Almaniya, Misir, İraq, Kanada, Suriya, Norveç, Fransa, Finlandiya, Yaponiya, İran, Əfqanıstan, Türkiyə və Polşada sərgilərdə nümayiş etdirilib. Təsviri sənət tariximizə dair araşdırmalarda müəllifin yaradıcılıq nümunələri yüksək qiymətləndirilib.

**Ədəbiyyat:**

1. Quliyev Ə. Rəssamlıq sənətimizin tarixində parlaq bir imza – Kamil Xanlarov // "525-ci qəzet". 13 dekabr 2015.
2. Kazımzadə A. Uzunömürlü «Kəndlilər»: [Rejissor Səməd Mərdanovun quruluşunda hazırlanan eyni adlı kino haqqında] // "Mədəniyyət" qəz. 2010.- 8 yanvar.- S. 10.
3. Kərimova R. Azərbaycan portret boyakarlığı. Bakı, 1964.
4. Mirzəzadə O. Böyük sənətkarın. istedadı http://www.khanlarov.com/az/nrlr
5. Rasim Əfəndi. Azərbaycan incəsənəti. "Şərq-Qərb", Bakı: Çaşıoğlu, 2017.
6. Salamzadə Ə., Rzayev N., Kərimov K., Həbibov N. Azərbaycan incəsənəti. Bakı: Maarif, 1977.
7. Fərzəliyev Ç. Natürmort janrı haqqında. Metodik vəsait. Bakı, 2003.
8. Fərəcov S. Təviri sənətdə silinməz iz // "Mədəniyyət" qəz. 30. 11. 2016.
9. Габибов Н.Д. Пейзажная живопись Азербайджана // журн. «Искусство», №5. 1969.

**Creativity of the People's artist of Azerbaijan Kamil Khanlarov**

**Summary**

The article is dedicated to the work of the People's Artist of Azerbaijan Kamil Khanlarov. The artist's works created in the genre of landscape and portrait are involved in the study. It is noted that the distinctive features of the artist's works are his appeal to the miniature, the contrast of the color scheme and the decorative landscape. Being familiar with the rich traditions of folk art, the artist paid special attention to the analysis of the spiritual world and the psychology of portraits.

It is noted that the artist's comprehensive work includes decoration and costume sketches related to cinematic and theatrical design. Numerous costume designs created by the artist are distinguished by their vivid color and ethnographic authenticity.

**Творчество Народного художника Азербайджана Камиля Ханларова**

**Резюме**

Статья посвящена творчеству Народного художника Азербайджана Камиля Ханларова. К исследованию привлечены произведения художника, созданные в жанре пейзажа и портрета. Отмечается, что отличительными чертами произведений художника являются его обращение к миниатюре, контраст цветовой гаммы и декоративность пейзажа. Будучи знаком с богатыми традициями народного искусства, художник уделял особое внимание анализу духовного мира и психологии портретов.

Отмечается, что всестороннее творчество художника включает в себя декорационным и костюмным эскизам, связанным с кинематографическим и театральным оформлением. Многочисленные эскизы костюмов, созданные художником, отличаются яркостью цвета и этнографической подлинностью.

**Rəyçi: prof. S.Y.Sadıxova**

## JURNALIN İÇİNDƏKİLƏR

### DİLÇİLİK LINGUISTICS ЯЗЫКОЗНАНИЕ



### ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ



### PEDAQOGİKA PEDAQOGY ПЕДАГОГИКА

## TƏDRİSİN METODİKASI THE METHODOLOGY OF TEACHING МЕТОДИКА ПРЕПОДАВАНИЯ

**SƏNƏTŞÜNASLIQ ART CRITICISM ИСКУССТВОВЕДЕНИЕ**

